**BƏXTİYAR VAHABZADƏ**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

**İKİ CİLDDƏ**

**I CİLD**

"ÖNDƏR NƏŞRİYYAT"
BAKI-2004

*Bu kitab "**Bəxtiyar Vahabzadə.** Əsərləri"* (*I–III cildlər, Bakı, "Azərbaycan", 2001–2002; IV–VI cildlər, Bakı, "Çaşıoğlu", 2002–2003*) *nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

Ön sözün müəllifi: **Çingiz Aytmatov**

Tərtib edəni və redaktoru: **Azər Bağırov**

**894.361'1 - dc 21**
**AZE**
**Bəxtiyar Vahabzadə. Seçilmiş əsərləri.** İki cilddə. I cild (Şeirlər). Bakı, "Öndər nəşriyyat", 2004, 328 səh.

Bəxtiyar Vahabzadə yaşayan, döyüşən, səfərbər edən və Vətən, xalq qarşısında öz tarixi vəzifəsini yerinə yetirən çağdaş Azərbaycan poeziyasının görkəmli nümayəndəsidir. Elinə, torpağına, kökünə bağlılıq, təkrarsız, fərdi, milli çalar Bəxtiyar şerini artıq müasir poeziyamızın tarixi-bədii faktına və hadisəsinə çevrilibdir. O, poeziyamızı dövrün ağır sınaqlarında qoruyub saxlamağı bacaran, "öz sinəsində hər zərbəyə açıq, dərisi soyulmuş ürək gəzdirən" həqiqi milli şairdir.

Əsrin Şərq və dünya şeir prosesi məcrasında Azərbaycanı Bəxtiyar Vahabzadənin poetik söz dünyası ləyaqətlə təmsil edir.

Oxuculara dəyərli hədiyyə olan bu kitabda xalq şairinin seçilmiş şeirləri toplanmışdır.

**ISBN 9952-416-10-4**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## “YARADIBDIR İNAM MƏNİ,
## MƏN İNAMIN ÖVLADIYAM”

Bu misralar Bəxtiyar Vahabzadənindir.

Öz şair çağdaşın haqqında mühakimə yürütmək – o, çoxdan tanınmış məşhur söz ustası olsa belə – həmişə mürəkkəb və məsul işdir. Bir həqiqəti təsəvvür etmək çətin deyil ki, klassikləri yalnız keçmişdə axtaranlar çağdaşın barədə deyəcəyin tutarlı fikirlərə dodaq büzüb, çiyin çəkə bilər. Buna görə də, istər-istəməz işə ehtiyatla yanaşmağı vacib bilirsən. Xoşbəxtlikdən, elə hallar olur ki, heç nə ilə hesablaşmadan, çəkinmədən öz çağdaşın haqqında ürəkdolusu, açıqca fikrini bildirirsən ki, buna da məsələyə hamburqsayağı yanaşma deyərlər.

Bu yaxınlarda Bəxtiyar Vahabzadənin yeni şeirlər kitabını oxudum. Şeirlər ruscada böyük heyranlıqla oxunur. Həmin şeirlərdə zaman yaşayır – bizim qayğı “yükümüzə” tab gətirən, dərd-sərimizə şərik olan, qoynunda yaşadığımız zaman! Şeirlərin qüdrəti də məhz bundadır. Eyni sistemə daxil olan türk mənşəli dillərimiz bir-birinə yaxın olduğuna görə azərbaycanlılar məni çox asanlıqla inandırırlar ki, indiki dövrdə Bəxtiyar Vahabzadənin yaradıcılığı orijinalda milli poetik fikrin ən böyük nailiyyətlərindən biridir. Zəngin Azərbaycan ədəbi ənənələri müqabilində bu cür nüfuz və şöhrət qazanmağın çox-çox çətin olduğunu asanca təsəvvürümə gətirirəm. Bununla belə, unutmaq olmaz ki, ənənələr yalnız və yalnız müasirliyin gərdişində, yeni yaradıcıların yeni sözündə yaşayır:

*Yaşamaq yanmaqdır, yanasan gərək,*
*Həyatın mənası yalnız ondadır.*
*Şam əgər yanmırsa, yaşamır demək,*
*Onun da həyatı yanmağındadır!*

Şeir sənəti barədə mühakimə yürüdərkən, biz tez-tez “poeziyanın sehri”, “poeziyanın sirri”, “poeziyanın musiqisi” ifadələrini işlədir, adətən anlaşılması asan olmayan, predmeti dəqiq müəyyənləşməyən qeyri-adi məfhumları, duyğuları açmağa çalışırıq.

Şerlərin fövqəltəbii stixiyası ilham pərisinin qüdrətindədir və bu da gözəldir ki, hər kəs, hər bir qabiliyyətli adam onları oxuyanda hə-

yəcanlanır, belə anlarda özünü şair hesab edir. Poeziyanın "sehrli atributları" o zaman intəhasız kamilliyə qadir olur ki, şeir yaradanın fitri istedadı, mənəvi təcrübəsi başlıca rol oynasın. Çünki, on yeddi yaşlının poetik ehtizazı və vəcdi ilə yetkin adamın fikir və hissləri arasında fərq böyükdür. Tarix "ələyinin" dibində qalan inciləri -dünyanın poetik söz antologiyasını vunderkindlər /onların dühasını inkar etmirik/ deyil, zəngin mənəvi təcrübəyə malik olan qüdrətli şəxsiyyətlər yaratmışlar. Dünya mədəni irsinə Qərbdə Homerdən Puşkinədək, Şərqdə Füzulidən Səməd Vurğunadək neçə-neçə nəsillərin təxəyyül qüdrəti və təcrübəsi sərf olunmuşdur.

*"Bizim müdrik, ağsaçlı*
*Qəhrəman elimiz var.*
*Bizim qoç Koroğlumuz,*
*Bizim Nəsrəddinimiz,*
*Bizim Füzulimiz var!"*
*Vallah, bunu çox dedik*
*Billah, bunu çox dedik.*
*Keçmişin kölgəsində*
*Ağzımızı havaya*
*Açıb yatmaq istədik...*
*Ancaq bunu bilmədik:*
*Köhnə hava içində*
*Ürək susur, boğulur.*
*Kölgədə yatanların*
*Öz kölgəsi yox olur...*

("Bəsdir!")

Poeziyanın meyarı hər şeydən əvvəl sənətkarın yetkinlik meyarıdır, onun kollektiv təcrübəmizlə həmahəng olan fəlsəfi və mənəvi müdrikliyinin meyarıdır və bundan sonra şəxsiyyətin harmoniyası, epitetlərin gözəlliyi və daha sonra dövrün əsən yellərinə istedad yelkəni ilə sinə gərmək bacarığı gəlir. Dövrlər dəyişir, ömür keçir, lakin həqiqi sənət, dünyanı bizim üçün əbədi, həmişəyaşar varlığa çevirir. Əlbəttə, söhbət insandan – bütün əsrlərdə İnsan olmaq eşqi ilə yanmaqdan gedir.

Bəxtiyar Vahabzadənin "Bir gəminin yolçusuyuq" (1983) kitabında toplanan əsərlərinin demək olar ki, hamısında mən qüdrət, aydınlıq və müdriklik görürəm. Şairin təlatümü, inkar və təsdiqi söz oyununda

deyil, ali ehtirasdan, "əks-sədalıqdan", qəlb inamından doğur. Bizi əhatə edən aləmdə hər nə varsa, şairi dərindən-dərinə düşündürür; xeyirlə şəri, gözəlliklə eybəcərliyi, böyüklüklə kiçikliyi, bir sözlə, insan ruhunun ali və xırda duyğularını poeziya səviyyəsinə qaldırmaq ehtirası Bəxtiyarın fitrətindədir. Mütəfəkkir sənətkarın, ustad şairin başlıca qayəsi, uğuru da bundadır. Qadın-kişi ünsiyyətindən doğan əbədi mövzu onun qələmində təzələnir, sevgilisindən küsənin nisgili, qəribəlikləri və bunun əksinə, misralarda yaşayan mərdanə dözüm və vəfalılıq bizi gözlərimiz yaşarıncaya qədər kövrəldir, çünki şair hamıya doğma olan bu əzablı-işıqlı münasibətlərdə sözə sığışmayan ilahi duyğuları sehrlə "ovlaya" bilir.

Bəxtiyar Vahabzadə hamımıza xas olan bu ehtiraslardan birbaşa zaman, məkan və fəzanın mücərrəd aləminə, bizim günlərin həyəcanlarına – dünyanın nüvə təhlükəsinə körpü-fikirlər, körpü-obrazlar atır, yenidən hər birimizə, bütün nəsillərə, yenidən İnsana, öz qonşusuna, onun od-ocağına və bundan sonra bütün Kainata üz tutur. Yaradıcılığının çiçəklənmə və müdriklik dövrünə qədəm qoyan böyük şairin ölçüsüz istedadı bar verir, beləcə, inkişaf edir. Zənnimcə, oxucuların çoxu bu gün özünü, öz dünyasını, öz hiss və həyəcanlarını Bəxtiyar poeziyasında tapa bilər.

Vahabzadənin poetik təfəkkür mədəniyyəti təbiətcə millidir. Bu, müstəsna dərəcədə zəruri haldır ki, sən övladı olduğun xalqın nitq hissəsində fel olmağı bacarasan, xalqının canlı dil memarlığına öz töhfəni verə biləsən. Bununla yanaşı, Vahabzadənin poetik təfəkkür mədəniyyəti daha üstün mahiyyət kəsb edir və millilikdən ümumbəşəri səviyyəyə qalxır. Milli və beynəlmiləl münasibətlər problemi günümüzün canlı mübahisələrə çevrilən məsələlərindən biridir və bu problem dünya ədəbiyyatında öz mütərəqqiliyini, obrazlılığını, nadir əhatəliyini və məhsuldarlığını bir daha Vahabzadə yaradıcılığında tapır. İndiki halda, sən azərbaycanlı şairi oxuyanda dünyanı oxuyursan.

Bundan başqa, mən Vahabzadənin görkəmli sənətkar – şair üstünlüklərini, çox güclü cəhətlərini qeyd etmək istərdim. Lirizm və vətəndaşlıq Bəxtiyarın yaradıcılığında ayrılmaz qoşa simlərdir və bu simlər onun şəxsi və ictimai dünyagörüşünün qüdrətinə bir daha şəhadət verir. O, vətənpərvərdir, o, aqildir, sözün yaxşı mənasında nəsihətverən, yolgöstərən sənətkardır. Vahabzadənin başqa kamil cəhətlərindən biri də odur ki, şair öz əsərlərində tarixi müasirlik qədər

yaşada bilir. Keçmişə görə əzab çəkmək, ona bu günün gözüylə baxmaq – Bəxtiyarın mövzu dairəsinin genişliyindən, mürəkkəbliyindən və zənginliyindən xəbər verir.

*Sultanlar milləti qorxuda bildi,*
*Doğru danışanı asdılar dardan.*
*Qızıl saraylarda fərman verildi*
*Tarix gəlib keçdi ac komalardan.*

(“Topqapı sarayı”)

Tarix çoxdan ötüb keçib. Nə haqlılar qalıb, nə haqsızlar. Adama elə gələ bilər ki, keçmiş “fəna mülkünə” qərq olubsa, əzab çəkməyə dəyməz. Lakin Bəxtiyar tarixi bu günün gözüylə mühakimə edir, bizi inandırır ki, bunun bilavasitə ona və müasirlərinə dəxli var. O, bizi inandırır ki, indiki zamanın taleyi keçmişdən asılıdır. Əgər tarixin təkəri geri dönsə, keçmiş hökmdarlar, sultanlar “Doğru danışanı asdılar dardan” misrasına, odlu sarkazma, qəzəb və nifrət toxumu səpdiyinə, komalarda tarix yaradanlara məhəbbət bəslədiyinə, öz xalqının, öz millətinin kökünü yaşatmaq cəhdinə görə şairi amansızcasına cəzalandırardılar.

...Dünyada ad çıxaran çox şair var. Qəzet və jurnalları vərəqlədikcə görürsən ki, əsl şair azdır. Tək-tənha qalanda, bir neçə kəlmə ilə “Həyat nədir?” sualına cavab axtaranda yalnız sözü fikirdən, obrazdan, ruh və nəfəsdən yoğrulmuş həqiqi şairlər sənin yaşamaq eşqinə, düşüncələrinə qol-qanad verir. Müasirimiz Bəxtiyar Vahabzadə belə şairlərdəndir.

“*Yaradıbdır inam məni, mən inamın övladıyam...*” Məncə, bu misralar şairin yaradıcılığı üçün çox rəmzi və xarakterikdir. Bəxtiyar Vahabzadə öz möhtəşəm poeziya məbədini ucaltmaqdadır. O qüdrətlidir. Bu məbədi ucaldan əllər mahir və qadir əllərdir. Bu əllərin qoyduğu özül möhkəm və gözəldir. Oxucu bu məbədi tez-tez ziyarət etməlidir.

***Çingiz Aytmatov***

## ANA DİLİ

Dil açanda ilk dəfə ana söyləyərik biz,
"Ana dili" adlanır bizim ilk dərsliyimiz.
İlk mahnımız laylanı anamız öz südüylə
İçirir ruhumuza bu dildə gilə-gilə.

Bu dil, – bizim ruhumuz, eşqimiz, canımızdır,
Bu dil, – bir-birimizlə əhdi-peymanımızdır.
Bu dil, – tanıtmış bizə bu dünyada hər şeyi.
Bu dil, – əcdadımızın bizə qoyub getdiyi
Ən qiymətli mirasdır, onu gözlərimiz tək
Qoruyub, nəsillərə biz də hədiyyə verək.

Bizim uca dağların sonsuz əzəmətindən,
Yatağına sığmayan çayların hiddətindən,
                    Bu torpaqdan, bu yerdən,
Elin bağrından qopan yanıqlı nəğmələrdən,
Güllərin rənglərindən, çiçəklərin iyindən,
Mil düzünün, Muğanın sonsuz genişliyindən,
Ağ saçlı babaların əqlindən, kamalından,
Düşmən üstünə cuman o Qıratın nalından
                    Qopan səsdən yarandın.
Sən xalqımın aldığı ilk nəfəsdən yarandın.

Ana dilim, səndədir xalqın əqli, hikməti,
Ərəb oğlu Məcnunun dərdi səndə dil açmış.
Ürəklərə yol açan Füzulinin sənəti,
Ey dilim, qüdrətinlə dünyalara yol açmış.
Səndə mənim xalqımın qəhrəmanlıqla dolu
                    Tarixi varaqlanır,

Səndə neçə min illik mənim mədəniyyətim,
Şan-şöhrətim saxlanır.
Mənim adım, sanımsan,
Namusum, vicdanımsan.

Millətlərə, xalqlara xalqımızın adından
Məhəbbət dastanları yaradıldı bu dildə.
Moskvada Puşkinə heykəl qoyulan zaman,
Ona abidə qoydu bu dildə Şirvani də.

Bu dil, – tanıtmış bizə bu dünyada hər şeyi,
Bu dil, – əcdadımızın bizə qoyub getdiyi
Ən qiymətli mirasdır, onu gözlərimiz tək
Qoruyub nəsillərə biz də hədiyyə verək.

Ey öz doğma dilində danışmağı ar bilən,
Bunu iftixar bilən
Modalı ədəbazlar
Qəlbinizi oxşamır qoşmalar, telli sazlar.
Qoy bunlar mənim olsun.
Ancaq Vətən çörəyi,
Bir də ana ürəyi1
Sizlərə qənim olsun.

*Noyabr 1954*

## TƏKLİK

Xəyal gah dağdadır, gah da aranda,
Gah göyə yüksəlir, gah enir insan.
Otaqda bir saat tək oturanda,
Yüz ilin dərdiylə yüklənir insan.

Elə bil divarlar gəlir üstünə,
Qulağın səslənir, qəlbin döyünür.
Alışıb yanırsan sən öz tüstünə,
Nidalar gözündə suala dönür.

İnsanı tez yorar düşüncələr də,
Verib nəfəsini dərd udar insan.
Özündən başqası olmayan yerdə,
İnsan olduğunu unudar insan...

Bir günəş bəs edər, pərişan olma,
Sənin yüz Kür qədər göz yaşın olsa.
Min dərd hücum etsə, könül, sıxılma,
Bir nəfər dərd bilən sirdaşın olsa.

Dünyaya gəlmədik biz əbəs yerə,
İnsanıq, insan da bizə gərəkdir.
Bağatək qınına çəkilənlərə
Ürək nə gərəkdir, dil nə gərəkdir.

Çay çaya qovuşmaz sular daşmasa,
Ulduzun ulduzla ünsiyyəti var.
Göydə buludlar da qoşalaşmasa
Nə ildırım çaxar, nə yağış yağar...

Yol tapa bilərmi saz ürəklərə,
Mizrab asta-asta telə dəyməsə?
Çıxarmı qönçədən tək bircə kərə,
Bülbülün nəfəsi gülə dəyməsə?

Öz el-obasını tərk etdiyindən,
Tək-tənha dolanır bayquş bu gün də.
Kolların dibində tək bitdiyindən,
Boynu bükük olur bənövşənin də.

Od vurmasa, qabda su daşa bilməz,
Quş da tək qanadla dağ aşa bilməz.
Kösöyün ikisi çöldə də yanar,
Biri ocaqda da alışa bilməz.

Qəlbimdə min sözüm, min söhbətim var,
Mən deyim, siz deyin, dil yorulmasın.
Yığılın, yığılın başıma, dostlar,
Mənim bir günüm də sizsiz olmasın.

Dostların qəlbidir yurdum, məskənim,
Ürəkdə bir nisgil gərək olmasın.
Sağlığım bir yana, a dostlar, mənim;
Soyuq məzarım da heç tək olmasın!

*Mart, 1956*

## DAĞDA ŞƏLALƏ KİMİ

Bir rəngi yox, göylərin min rəngini sevirəm
Bir gülü yox, güllərin çələngini sevirəm.
Mən çıxmağa təpə yox, uca dağ istəyirəm,
Həyatı həyat kimi yaşamaq istəyirəm.
Göydə qürub çağı da, dan yeri də gözəldir.
Həyatın sevinci də, kədəri də gözəldir.
Həyat – bir cıdır düzü, bir döyüş meydanıdır.
Hər kəsi öz cürəti, öz qüdrəti tanıdır.
İnci üzə çıxarmı çalxalanmasa ümman?
Bu meydanda heyif ki, daim eniş axtaran,
"Azca aşım, ağrımaz başım" – deyənlər də var.
Kədərdəki nəşəni, zövqü anlamayanlar
Həyatın nəşəsindən, fərəhindən nə anlar?
Hər kədəri səadət, hər sevinci qəm izlər.
Əsl könül həm qəmi, həm sevinci əzizlər.
Təlatümsüz ürəklər qovuq kimi boş olur.
Daim sevinc axtaran daim qəmə tuş olur.
Düşmənəm yaltaqlanıb təpəyə dağ deyənə.
"Bu dünyada birtəhər qoy yaşayaq", – deyənə,
Ah, birtəhər!.. Lüğətə bu söz hardan gəlmədir?
Yaşamaq yaşamaqdır! Bəs bu birtəhər nədir?
Mən düşmənəm, düşmənəm belə "ölü canlara",
Gündən qaçıb həmişə kölgə axtaranlara...
Onlar ortada yeyib, qıraqdasa gəzdilər,
Namusu xərcləməkdən onlar çəkinməzdilər.
Onlar orta yol tutub nə "hə", nə də "yox", – dedi.
Havaya nə "istidir", nə də ki, "soyuq", – dedi.

Onlar ölçüb-biçdilər hər bir şeyi dərindən.
Özgəsini qorxudub hürkdülər özlərindən.
Onlar qazdan ayıqdı...
Onlar havaya baxdı...
Gah yağışa, gah qara,
Gah qışa, gah bahara,
Gah axşama, gah da ki, səhərə dəm tutdular.
Özlərini düşünüb özgəni unutdular.
Səslərdən səs aldılar, öz səsləri olmadı.
Yaşadılar ölü tək, nəfəsləri olmadı...
Getdilər iş dalınca, ürəkləri getmədi...
Gəzdilər... Hey gəzdilər.
Ayaq səslərinisə tək özləri eşitdi,
bir kimsə eşitmədi...
Atlarını daşlığa salıb səyirtmədilər,
Adları kişi oldu, ömürdə bircə kərə
kişilik etmədilər.
Onlar öləndə belə kimsə xəbər tutmadı.
Bu səssiz, küysüz ölüm kimsəni ağlatmadı.
Çoxdan ölmüş zənn edir, axı, hamı onları.
Diri ikən, sağ ikən,
Öz səsi olmayanın ölümü səssiz keçər.
Min-min dəfə ölənin matəmi yassız keçər.
Qardaş, min duyğu ötsün ürəyindən bir anda.
Sən qımışma güləndə, inləmə ağlayanda.
Ağlasan, hönkür ağla, gülsən, qəhqəhə çək, gül.
Gülsən də, ağlasan da tamam doysun qoy könül.
Yaşamaq istəmirəm sürünüb dizin-dizin,
İstəyirəm ən uca zirvələrə mən qonam.
Xəfif sakitliyini neyləyirəm dənizin.
Onun qasırğasına, dalğasına vurğunam.
Qoy döysün yağış məni, boran məni, qar məni,
Həyatın boranları daim yaşadar məni.
İstəmirəm həyatım sakitcə bir otaqda
gəlib keçsin lal kimi...
İstəyirəm döyüşəm qayaların başında
düşmənlə qartal kimi.
Bağçadakı arx kimi ötüb həzin nəğmələr,

axmağı istəmirəm.
Səyyah olub həyata seyirçi bir nəzərlə
baxmağı istəmirəm.
Çağlamaq istəyirəm dağda şəlalə kimi,
Səpilmək istəyirəm çöllərə lalə kimi.
Dərya olub, nəhr olub, çalxanmaq istəyirəm,
Göylərdə ulduz kimi mən yanmaq istəyirəm.
Şığımaq istəyirəm başsız küləklər kimi,
Bəslənmək istəyirəm bütün ürəklərdə mən
arzu, diləklər kimi.

Bir rəngi yox, göylərin min rəngini sevirəm.
Bir gülü yox, güllərin çələngini sevirəm.
Mən çıxmağa təpə yox, uca dağ istəyirəm;
Həyatı həyat kimi yaşamaq istəyirəm,
Yaşamaq istəyirəm!

*May, 1960*

## KİMDİR MƏNİM DÜŞMƏNİM?

Kimdir mənim
Ən qorxulu düşmənim?
Kaş biləydim bunu mən.
O zərbə vurmamışdan
Kəsəydim yolunu mən.
Kimdir mənim
Düşmənim?
Yaxşımı qoyub
Yamanımı danışanmı?
Yox!
Eyblərimi deyib
Arxamca gülənmi?
Yox!..
Mənim nöqsanlarımı
Məndən yaxşı bilənmi?
Yox! Yox! Yox!

Onların gözlərini
Taxaydım öz gözümə.
Özgələrin gözüylə
Baxaydım öz-özümə.
Bacarsaydım bunu mən
Bu dünyada nə dərdim...
Mən onda öz-özümü
Daha yaxşı görərdim.
Onda eyiblərimə
Özüm düşmən olardım;
Görsəydim öz-özümü,
Onda mən, mən olardım!
Ah!.. Məni məndən gözəl
Görə bilən dostlarım,
Arxamca qəh-qəh çəkib
Mənə gülən dostlarım,
Gülün, elə gülün ki,
Çatsın qulaqlarıma
Sizin gülüşləriniz.
Yamanımı danışın,
Elə danışın ki, siz
Mən də xəbərdar olum.
Danışın, qoymayın ki,
Mən özümə vurulum.
Ən qorxulu düşmənin
Gələrəm öhdəsindən,
Ancaq özüm özümlə
Bacara bilmirəm mən,
Bacara bilmirəm mən.
Özüm öz əllərimlə
Bir gün bal içirəmsə,
Bir gün zəhər içirəm.
Mən həyat yollarından
Ayaqlarımla deyil,
Əqidəmlə keçirəm.

*Aprel, 1960*

## ÖZÜMDƏN NARAZIYAM

Təbiətin könül açan
Min rəngi, min səsi var.
Hər könülün min arzusu,
Min səsli nəğməsi var.

Bu arzular, bu nəğmələr,
Bu səslər bir saz kimi
Mənim solğun sözlərimdə
Heç dil aça bildimi?

Hissim dərin, sözüm solğun,
Qəlbim geniş, sinəm dar.
Məndən əvvəl doğulubdur
Sinəmdəki duyğular.

Səhv atılan addımları
Sonradan anlayıram.
Baxıb vicdan güzgüsünə
Özümü danlayıram.

Six ey yanlış addımlarım,
Məni dərdə saldınız.
Mən sizinlə döyüşdükcə,
Gün-gündən çoxaldınız.

Mən haqq-hesab istəyirəm
Gecələr gündüzümdən.
Narahatam, narazıyam
Ömrüm boyu özümdən.

Bizim sənət dünyasının
Qırıq telli sazıyam.
Bircə ondan razıyam ki,
Özümdən narazıyam.

*İyul, 1960, Riqa*

## ANA HƏDİYYƏSİ

Anam namaz üstə əl açıb göyə
Allaha yalvarır “ya rəbbim! – deyə:
– Sənsən xəlq eliyən göyləri, yeri,
Candan şirin olur bala, ay Allah.
Sən mənim ömrümdən kəsib illəri,
Balamın ömrünə cala, ay Allah!
Bu nədir? Arzuya, diləyə bir bax,
Gör bir nələr keçir ana qəlbindən?
Çoxdur bu dünyada hədiyyə... ancaq
Ömürdən hədiyyə görməmişəm mən.

İstərəm, bir ana, bir bala sözü
Lüğətdə sözlərin önündə gedə.
Uca olduğundan ananın özü
Ucadır, böyükdür hədiyyəsi də.

Çoxdur hədiyyələr insan adına:
Qiymətli ziynətlər, qiymətli daşlar.
Ana həyat verir öz övladına,
Həm də öz ömründən ömür bağışlar.

*Avqust 1962, Şəki*

## VƏTƏNDƏN-VƏTƏNƏ

Arazın
bu tayı Vətənim,
o tayı Vətənim.
Vətəni görməyə amanım yox mənim.

Bu necə vətəndir?
Görmədim üzünü
Çatsam da bu yaşa
Ömründə bir dəfə.
Bəs salam verməzmi
Qardaş da qardaşa?

Bu qəmim, bu dərdim dağlardan ağırdı
Arazın suyuna qarışıb axıram.
Füzuli həsrətlə qürbətdən Vətənə baxırdı,
Mən isə...
Vətəndən-Vətənə baxıram.

*Oktyabr, 1962*

## SƏADƏT NƏDİR?

*Nəsir Sadıqzadəyə*

Səadət nə demək?.. – bu sualla mən
Özümü çox yordum, tapa bilmədim.
Səadət nə demək?.. Bir tələbəykən,
Məktəbi axıra vurmaqdır, – dedim.

Məktəbi bitirdim, işə də girdim
Səadət bumudur? Yox, bu deyilmiş!
Böyük dahiləri oxuyub gördüm
Çoxları sevgini səadət bilmiş.

Sevdim! Gecə-gündüz yandım şam kimi
İztirab... Göz yaşı... Min qan, min qada.
Tapmadım yenə də səadətimi,
Eşqin əzabları şirin olsa da...

Evləndim, həsrətə son qoymaq üçün,
Qurtardı o şirin iztirablar da.
İndi də, qayğılar artdı günbəgün
Dedim: – Ay səadət, hardasan, harda?

Səadət üfüqmüş... əl çatmaz ona,
Aydın görünsə də o, bizə gendən.
Arzular sığışmır onun yoluna,
Səndən uzaqlaşır yeridikcə sən.

Seyr edib yaxını, gah da uzağı
Bir az seçə bildim qaranı ağdan.
Yaxşı görmək üçün uca bir dağı
Gərək sən baxasan ona uzaqdan.

Evləndim... hicrana son qoymaq üçün
Qurtardı həsrət də, xoş intizar da.
İndi də qayğılar artdı günbəgün.
Dedim: – Ay səadət, hardasan, harda?

Bəlkə də səadət elə budur, bu:
"Hardasan, hardasan, gəl-gəl" – deməkdir.
Bəlkə də səadət ömrümüz boyu
Nəyisə... gözləmək... hey... gözləməkdir.

Tapdım səadəti dara düşəndə,
Alıb öz gücümü xəyallarımdan.
Kiməsə... nəyəsə... hardasa... mən də,
Gərək olduğumu bildiyim zaman.

Çıraq ol! Nurunu artır günbəgün
Hər yerdə həyatın boğ zülmətini.
Mәncə, çıraq olub başqalarıyçün
Yananlar tapıbdır səadətini!

*Aprel, 1962*

## ANAM HAQQINDA ŞEİRLƏR

### 1. AN – MİN İL

Anam öldü!
Son nəfəs,
Son hıçqırıq,
Son nida!
Bizə dedi əlvida!
Bir saat əvvəl

duyan,
hiss eləyən
bir insan
Yatağında daş oldu.
Heçliyə doğru axan
Bir axına qoşuldu.

Anamın ölümündən
Bir an keçib,
ancaq o,
Daş olub insan ikən,
Öz-özünü danıbdır.
Bircə anda
O bizdən
Min il aralanıbdır.

Elə bil zaman bizə
Bu ölümlər,
ölümlər,
Arxasından hey gülür.
Kim deyir ki, vaxt –
zaman
Saat ilə ölçülür?!

## 2. BAŞDAŞI

Anamı dəfn etdik...
töküldü dən-dən
gözümün yaşı,
Həmin gün məzarın baş tərəfindən
Anamın yerinə qalxdı başdaşı.
Anamın əvəzi başdaşı oldu,
Kölgəsi özüylə yanaşı oldu...

Öldümü?
Elə bil o yoxmuş əsla,
Daşların üstdəki neçə yazıyla
seçilir insan
başqalarından.

## 3. ZAMAN

Bir ay tamam oldu, düz bir ay,
bir gün
Gəldim qəbiristana...
anamla deyil,
Onun başdaşıyla görüşmək üçün.
Düzü gözlərimə inanmadım mən,
Bir heyrət dalğası ötdü sinəmdən.
Yaxşı yadımdadır...
dəfn ediləndə
Sonuncu qəbirdi anamın qəbri.
Qəbirlə doludur sağ-solu indi.

Nədən məzarlıqda vaxt düşmür yada?
Demə o burda da, burda da varmış!
Ölülər məskəni – məzarlıqda da
Zaman, qədəm-qədəm addımlayırmış!..

## 4. BU GÜN YEDDİN OLDU

Anam öldümü?

Nə tez əllərini üzdün dünyadan,
Balanı tək qoyub hara getdin sən?
Necə yox olurmuş bir anda insan,
Elə bil dünyada heç yox imişsən.

Günəş qürub etdi... otaq qaraldı,
Bir anda yox oldun sən xəyal kimi.
İndi düşünürəm: səndən nə qaldı,
Könlümdə xatirən qara xal kimi.

Məni boya-başa yetirdin, ana
Bizə borclu bildik hər zaman səni.
Sən məni dünyaya gətirdin, ana,
Mənsə yola saldım dünyadan səni.

Sən mənə beşikdə laylay çalmısan
Bu gün laylay çalım sənə məndəmi?
Sənin şirin-şirin laylalarını
Mən sənə qaytarım cənazəndəmi?

“Yuxun şirin olsun” – deyərdin mənə,
“Yuxun şirin olsun” – deyimmi sənə?
Gərək mən başına dönəm-dolanam,
Məni həyat üçün
Yatıran anam,
Söylə ölümçün
Necə yatırım
Səni mən bu gün?
Bu necə dünyadır, anlamıram mən,
Cilvəsi cürbəcür, rəngi cürbəcür.
Dünən nəfəsiylə səni isidən
Bu gün buza dönüb, daşa dönübdür.

Bu necə dünyadır,
İnsan oğlunun
Xəyalı göydədir, özü yerdədir,
Sağ ikən çiynində həyatın yükü
Öləndə cəsədi çiyinlərdədir...
Bu necə dünyadır, bu necə dünya,
Ölümü həqiqət, həyatı röya.

Dərdimin, qəmimin səndin ortağı,
Niyə üz döndərdin, bəs niyə məndən?
“Dərdin mənə gəlsin!” – deyərdin axı,
Niyə dərd caladın dərdimə bəs sən?...

Anam, heç kəs səni incitməmişdir,
Mən səni,
mən səni incidən qədər.
İndi kimə açım dərdimi bir-bir,
Kim mənim dərdimə yanar sən qədər?
Evin hər küncündə görünür yerin.

Gözüm axtarcıdır, ana, ay ana.
“Nənəm hanı?” – deyir körpə Azərin.
Mən nə cavab verim ona, ay ana?

Birmirəm, bilmirəm bu ölüm nədir.
Həyat var ikən?
Nəfəsin, ay anam, hələ evdədir,
Özün yer altında daşa dönmüsən.
Bu gün yeddin oldu...
anam, yeddi gün,
Bizimlə bərabər ağlar otaqlar.
Sənə,
yalnız sənə,
sənə deməkçün
Könlümdə nə qədər mənim sözüm var.

“Kimləri çağıraq bu gün yeddiyə?”
Xalalar, bacılar soruşur məndən.
Anamdan soruşaq, o bilər deyə,
Sənin otağına üz tuturam mən.

Anam, tapşırıldın ana torpağa,
Bu ölüm, sinəmə çəkdi dağ mənim.
Sən mənim arxamda bənzərdin dağa,
Elə bil arxamdan uçdu dağ mənim.

Qızımın adıdır sənin öz adın.
Bu da göz dağıdır mənə bu gün də.
Son dəfə sən mənə baxıb ağladın.
Surətim məzara getdi gözündə...

Ömrü başa vurdun altmış yaşında.
Altmışın üstündə durub yaşın da.
Artıq sənin üçün dayanan zaman
Mənimçün dolanır...
Gün olur axşam.
Vaxt keçir, sən məndən uzaqlaşırsan,
Mən sənə günbəgün yaxınlaşıram.

*Fevral, 1963*

## AĞIL – GÖZ

Yerin layları kimi,
Göyün qatları kimi
Fikrim açılır hərdən
Göz önümdə qatbaqat.
Şeylərin ən kiçiyi –
Atom zərrəcikləri,
Ən böyüyü – kainat.
O da gözlə görünmür,
Bu da gözlə görünmür.
Belə ötdü əsrlər,
Təbiətin verdiyi
Göz acizmiş nə qədər...
İnsan o kiçikliyi,
İnsan o böyüklüyü
Görməyə çox can atdı,
Özünə göz yaratdı.
O, mikroskop yaratdı,
O, teleskop yaratdı.
Çox ehkamlar dağıldı,
Çox qurğular pozuldu.
Əsrimizdə
Ağıl döndü göz oldu.

*Avqust 1963*

## HABİL SEGAHI

Kəmanə kamana toxunan zaman
Tufanmı hayqırdı, selmi çağladı?
Bədbəxt bir qəribin ah-amanından
Bəlkə göy kişnədi, bulud ağladı?

Durnamı ayrıldı, öz qatarından
Obamı dağıldı, elmi talandı?
Zamanmı ayrıldı öz axarından?
Əslimi hıçqırdı, Kərəmmi yandı?

Kamanın qolunda yatan xalların
Hər biri qəm yurdu, hicran yuvası.
Bir qolun üstünə cəm olub min-min
Nəsimi üsyanı, Vaqif nəvası.

Ondakı bu qüdrət, bu sirr nədir, nə?
Əzabla, zillətlə doludur bu qol.
Aylara, illərə, qərinələrə
Bölünən tarixin yoludur bu qol.

O enən, o qalxan səslər, avazlar
Yaz başı dağların selidir bəlkə?
Kamanın bağrında ağaran tozlar
Yanan arzuların külüdür bəlkə?

Bu səs, sınaq üçün – qüssənin, qəmin
Könüllər evinə səyahətimi?
Bu səs, ilk atamız qoca Adəmin
Təklikdən gileyi, şikayətimi?

Bəlkə susdurulan neçə dahinin
Yaralı ruhudur bu səs, bu nalə,
Danışmır... düşünür dərindən-dərin
Sözsüz nəğmələrlə ağlayır elə.

Hər xalı bənzəyir bir yanar közə,
Qığılcım sıçrayır hər nəfəsindən,
Bu səslər danışır bəlkə də bizə
Atəşlər yurdunun fəlsəfəsindən.

Deyirəm, bu səsi dinləyəndə mən,
Niyə dəqiqələr dönüb il olmur?
Bu səsin oduna, deyirəm, görən
Niyə bütün səslər yanıb kül olmur?

Bu səsdən ürəyim oldu bir tikə –
Bağrımın başında yaradır bu səs.
Ayın camalında qara bir ləkə,
Lalənin köksündə qaradır bu səs.

Yox! Kardır qulağı kainatın da,
Eşidə bilsəydi suya dönərdi.
Sonsuz kainatın sonsuz qatında
İşıqsız ulduz da şölələnərdi.

Bu ahmı, amanmı ucalır yerdən,
Yer öz fəryadına özü bezdimi?
Qoca Füzuli də bu nalələrdən
Ney kimi bənd-bənd kəsilməzdimi?

Bu ağac parçası yanmayır özü,
Ancaq od-ocaqsız yandırır bizi,
Odun atəşinə od şan-şan olur.
Bu səsin oduna alışar su da;
Ağac hər atəşə alışan olur,
Bu niyə alışmır belə bir oda?
Habil! Ay insafsız, ürəyimizi
Yandırıb yaxmaqda qəsdin nədir, nə?
Niyə yandırırsan atəşsiz bizi?
Bu haqqı kim verib, kim verib sənə?

*Sentyabr-oktyabr 1964*

## MƏNİM ŞEİRİM

Əbədi bir od kimi öz içindən közərib
Hey yanır şeirim mənim.
Bu günümdən sabaha
boylanır şeirim mənim.
Gəzib dildə, dodaqda,
Uçur, uçur həmişə özümdən də qabaqda.
İdrakımın gözləri,
Əqidəmin ən təmiz, ən mənalı sözləri,
Duyan ürəyi şeirim,
Bütün diləklərimin ən saf diləyi şeirim.
Sən ayın, ulduzların nurundan yoğrulmusan,

Batan gecələrimin açılan səhərlərə
salamı sən olmusan.
İstərəm sətirlərin bu günümdən səs alan
əks-sədaya dönsün.
Əsrimizin nəbzi də ahəngində döyünsün.
İstəmirəm ki, şeirim nərmənazik qızların
saçında ətir olsun.
İstərəm gün altında pambıq yığan qızların
başında çətir olsun.
Can vermə hər ötərgi dərd-qəmə, şeirim mənim,
Əzmə-büzmə gözələ bənzəmə, şeirim mənim.
Sən atəş ol, sən od ol,
yandır da sən, yax da sən.
İldırım ol, çax da sən.
Göstər öz işığında bu dünyaya özünü,
Bir an yumma gözünü,
Həm gör sən, həm də göstər!
Fərəhləri fərəhdə, qəmi də qəmdə göstər.
Demirəm ki, zərrəni geniş kürrədə göstər.
Qüdrətin varsa sənin,
Sən bu boyda kürrəni kiçik zərrədə göstər.
Sən düşün dərin-dərin, düşündür dərin-dərin,
Vətənini, elini danan tüfeylilərin
Vətənçin yox,
manatçın yanan tüfeylilərin
yumruğa dön başında.
Keşikçi ol bu yurdun torpağında, daşında.
Vüqarı ol, əzmi ol əyilməyən başların,
Qəlbində mərmiyə dön əsl vətəndaşların.
Sonsuz düşüncələrim,
Bu dünyaya sualım,
Hər istəyim, xəyalım,
Eşqim, həsrətim mənim,
İlk məhəbbətim mənim,
Hədsiz şadlığım mənim,
Bu dünyada əbədi narahatlığım mənim.
Sənə qurban verməyə bir ömür çox azdır, az.

Yalnız bircə günümün sonsuz həyəcanını
Nəğməyə çevirməyə on ömür də çatışmaz.
Mən səninçin,
Anamsa mənimçin yandı, şeirim.
“Balamın rahatlığı yoxdur” – deyə o məni
sənə qısqandı, şeirim.
Ancaq o bilmədi ki, mən anamdan doğuldum,
Sənsə mənim qəlbimdə balamtək bəslədiyim
Duyğulardan doğuldun.
Məni anamdan alıb Vətənimə, xalqıma
Oğul edən sən oldun!

*Noyabr 1964*

## KARUSEL

Fırlanır karusel bir təkər kimi.
Daima fırlanan, dönən yer kimi.
Fırlanır uşaqlar dəstəbədəstə.
Kimi “at” belində, kimi “fil” üstdə.

Karusel fırlanır... Ötür xoş anlar.
Uşaqlar əl çalır şadlıqlarından.
Uşaqlar zənn edir, dayanıb onlar,
Ancaq başlarına dolanır cahan.

Sevinin, uşaqlar, gülün, əylənin.
Karusel dolanır,
Dəyişir zaman.
Hələlik cahanın başına siz yox,
Sizin başınıza dolanır cahan.

Sevinin, uşaqlar, ömür gödəkdir,
Həyat tumarlayır, oxşayır sizi.
Hələlik dünya da götürəcəkdir
Sizin nazınızı, şıltağınızı.

Karusel fırlanır... Bir dəstə durna
Sanki dövrə vurub səfə düzülür.
Atalar, analar uşaqlarının
Baxıb sevincinə sevinir, gülür.

Bütün bu şənlikdən uzaqda ancaq
Barmağı ağzında durub bir uşaq.

Uşaqlar fırlanır... baxır onlara
O gülür... Onun da dəyişir halı.
Uzaqdan baxdıqca fırlananlara
Fırlanır onun da fikri, xəyalı.
O da xoşhallanır, həzz alır gendən.
Duyur fırlanmağın xoş olduğunu,
Uşaq meydançaya tək gəldiyindən
Yoxdur karuselə mindirən onu.

Ancaq o xoşbəxtdir...
O qəlbə mən də
Heyranam...
Ey könül,
düşün, düşün sən.
O, həzz ala bilir özgəsinin də
Həzzindən, zövqündən, səadətindən!...

*İyul, 1965, Qusar*

## NƏ SƏN GÜLSƏN, NƏ MƏN BÜLBÜL

Bir qız qarlı qış günündə
Dibçəkdə bir gül bitirdi.
Qış fəslində gülə baxıb
Ürəyinə yaz gətirdi.

Bu gül, əsl qızılgüldü –
Ləçəkləri varaq-varaq.
Tikanı bol, rəngi qızıl,
Ətri yoxdu onun ancaq.

* * *

Qonşuluqda bir oğlanın
Qəfəsdə bülbülü vardı.
Oğlan onun nəğməsilə
Dərdlərini ovudardı.

Nə oldusa...
oxumadı,
Susdu bülbül birdən-birə.
Oğlan düşdü min fikirə.
Qonşudakı qızılgüldən
Xəbər tutdu oğlan bir gün.
Bülbülünü o gətirib
Qənşərinə qoydu gülün.

Gül, bülbülü görən kimi,
Sığallandı,
tumarlandı.
Gözlərinə naz-qəmzədən
Sürmə çəkib xumarlandı...

Oxumadı bülbül yenə
Susub durdu,
Lal kəsildi
Bu hal gülə acıq gəldi.
Gül daha da şivələndi,
Susub durdu bülbül yenə
Həsrət qaldı bu dar qəfəs
Nəğməkarın nəğməsinə.

Bu inadı görüncə gül,
Rəngi soldu,
Xəzan oldu
Yumaq kimi tez yumuldu.

Yavaş-yavaş dilə gəldi
Bu dəm bülbül
Dedi: – Ey gül,

məni tanı,
Ürəyimdə qəm karvanı,
Sən gülsənsə, ətrin hanı?
Demə susub nədən bülbül?

Yazım dönüb sazaq olub
Köksüm başı dağ-dağ olub
Vətənində dustaq olub
Çox desə də, “Vətən”, bülbül.
Dibçəkdəsən, qəfəsdəyəm.
Sən əlacsız, mən xəstəyəm.
İndi özgə həvəsdəyəm, –
Ağlar zədən-zədən bülbül.

Zaman bizdən kam alıbdır,
Daha ürək qocalıbdır.
Bizdən ancaq ad qalıbdır,
Nə sən gülsən, nə mən bülbül.

*Aprel, 1956*

## TƏYYARƏLƏR

*İsmayıl. Şıxlıya*

Yerdən alıb öz gücünü
Qalxar göyə təyyarələr,
Məhəl qoymaz
nə yağışa,
nə küləyə
təyyarələr.
Uçuşu da əzəmətli,
Duruşu da əzəmətli...
Aşıb-daşar
təyyarələr.
Yerdə deyil,

göydə yaşar
təyyarələr.
Sərnişinə
Vüqarından – vüqar verir
təyyarələr,
Günlərin yox,
Saatların az ömründə
Qütbləri birləşdirir
təyyarələr.
Gecə gedir,
Gündüz gedir
təyyarələr.
Məqsədinə,
Mənzilinə dümdüz gedir
təyyarələr.
Eniş bilməz,
Yoxuş bilməz,
Dolay bilməz
təyyarələr.
Nə burulmaz,
Nə əyilməz təyyarələr.
İçəridən alışmasa
bu sürətlə,
bu cürətlə
Gedə bilməz
təyyarələr.
Özü kimi
Ölümü də mərdanədir.
Mənzilinə uça-uça,
qaça-qaça
Öz içindən tez üzülər
təyyarələr.
Yavaş-yavaş ölə bilməz.
Öləndə də birdən ölər
təyyarələr.

*Aprel, 1966*

## AZƏRBAYCAN OĞLUYAM

Azərbaycan oğluyam,
Odu Allah sanmışam.
Anam torpaq,
Atam od,
Mən oddan yaranmışam:

Od kimi istiqanlı,
Seltək dəliqanlıyam.
Həyat qədər qədiməm,
Torpaq qədər şanlıyam.
Od kimi yandıranam.
Su kimi söndürənəm
Məni yandırsalar da,
Suda batırsalar da,
Yenə mənəm,
mən mənəm!

Köküm üstə bitmişəm,
Şöhrətim var,
Şanım var.
Mənim gələcəklə də
Öz əhdi-peymanım var.

Azərbaycan oğluyam,
At belində doğuldum;
Zamanın qazanında
Neçə dəfə dağ oldum.

Mənim damarlarımda
Gur sellər çağlamışdır.
Anam cəngilər üstə
Məni qundaqlamışdır.

Azərbaycan oğluyam,
Min ildir,
öz adımın
Keşiyində durmuşam,

Silahım olmayanda
Nifrətimi barıttək
Qəlbimə doldurmuşam...

Hünər göstərməyincə
Adsız yaşamışam mən.
Dədəm Qorqud ad verdi
Mənə öz hünərimdən.

Yoluma nur çiləyən,
Qoluma qüvvət verən
Eşqim,
ustadım oldu;
Adım doğdu hünərdən
Hünərim, adım oldu.

Azərbaycan oğluyam,
Yaşım adımdan qədim.
Heç kəsin toyuğuna
Ömrümdə "kiş" demədim.

Kimsənin torpağında
Gözüm yox;
bilsin aləm
Torpağımdan bir çərək
Kimsəyə də verměrəm.

Mən bir qədim mahnıyam
Xallarım əlvan-əlvan.
Musiqim – Qarabağdır,
Sözlərimsə – Naxçıvan.
Bu torpaqda yaranmış
Koroğlunun cəngisi,
Qıratın üzəngisi!

Özümə vurulmadım,
Sevinc də görmüşəm mən,
Sitəm də,

Dərd də,
Qəm də...
Sabirin göz yaşıyla
Özümə gülmüşəm də.

Çənlibeldən düşəli
Cığırları dağıdıb
Geniş yollar salmışam
Çənlibeldən də uca
Dağlara ucalmışam.

Ucalsam da günbəgün,
Dünənki son zirvəmə
Bu gün yenə "az" dedim.
Tarixin kölgəsində
Daldalanan millətin
Sabahı olmaz dedim!..

Neyləyək ki...
zamanın
Uğursuz yollarında
İkiyə bölünmüşəm.
İki başlı, bir qəlbli
Bir bədənə dönmüşəm.

Həm Təbriz, həm Bakıdır
Məkkəm, Mədinəm mənim.
Pasportsuz yaşar bu gün
İki Vətəni olan
Azəroğlum, Qafarım,
Əlim, Mədinəm mənim.

Balaş, biz ikimiz də
Bir ananın oğluyuq,
Biz ki, Azəroğluyuq.
Hər ikimiz əzəldən
Bir arzunun quluyuq.
Elimiz də bir bizim,
Dilimiz də bir bizim.

Vətənimiz bir bizim,
Dünənimiz bir bizim,
Olmuşuq bir Vətəndə
Biz bu gün başqa-başqa.
Bizim talelərimiz
Bəs neçün başqa-başqa?
Öz məsləkim, öz eşqim
Daim məndən öndədir.
Azərbaycan bayrağı
Başımın üstündədir!..

Əqidəmin, eşqimin,
Qanımın rəngi bayraq,
Bütün arzularımın,
Qızıl çələngi bayraq.
Hər şeydən bu dünyada
Şərəf uca
Şan uca,
Zamanın yollarında
Mən ki, səni tutmuşam,
Daim başımdan uca!

*Noyabr, 1966*

## NƏSƏNSƏ, ÖZÜN OL

Siz ey bizdən sonra şeirə gələnlər,
Bu çətin yollarda uğurlar sizə!
Eşqiniz – gələcək.
Yaşınız – səhər.
Qəlbiniz işıqlı, fikriniz təzə!

Mərd olun!
Meydanda durun mərd kimi,
Uymayın ötəri şöhrətə, ada.
Bizim şeirimizin dünəni kimi
Böyükdür, şanlıdır istiqbalı da!

Ehtiram olsa da, hamı əzəldən,
"Sələfin yolundan mən uzaq! – deyir
Dünən atasına "önə bax!" – deyən
Bu gün övladına "dala bax!" – deyir.

Biz öz atamıza deyərdik bir vaxt:
"Unutma,
hər günün öz hökmü var ha!.."
İndi oğlumuza deyirik ancaq,
"Gəl təzə nırx qoyma köhnə bazara!"

Zövqlər, duyğular dəyişir hər an,
Gəldikcə, getdikcə nəsillər bir-bir.
Əzəldən belədir, övladlarından
Atalar həmişə gileylənibdir:

"Ay həzarat, bir zəmanə gəlibdir,
Ala qarğa şux tərlanı bəyənməz.
Oğullar atanı, qızlar ananı,
Gəlinlər də qaynananı bəyənməz..."

Atamız deyərdi bunu bir zaman,
İndi biz deyirik övladımıza.
Oğul o kəsdir ki, köhnə kitabdan
Bu köhnə yazını, bu fərqi poza!

Ata o kəsdir ki, dayanıb öndə
Övladın hissilə yaşaya bilsin,
Övlad o kəsdir ki, çiyinlərində
Atanın dərdini daşıya bilsin.

Siz ey bizdən sonra şeirə gələnlər,
Bu çətin yollarda uğurlar sizə.
Eşqiniz – gələcək,
Yaşınız səhər,
Qəlbiniz işıqlı,
hissiniz təzə!
Qaçan tez köhnələr bu təzəlikdən,
Ancaq bir mətləbi deməliyəm mən:

Sazımda eybəcər səslər uyduran
Saxta xallar vuran cavanlar da var.
Özgənin hininə, "Qəsri-Süleyman",
Özünün qəsrinə "hin" deyir onlar.

Mənim beləsinə bircə sözüm var:
"Yad yerin halvası çox şirin olar".
Qaçırsan, min illik ənənədən qaç!
Hər kəsə bənzəmə, sən təzə yol aç!
Dediyin hər sözü duy dərin-dərin.
Həyatda gördüyün geriliklərin
Demə ki, hamısı ənənədəndir!..
Sən niyə arxanı köhnə sayırsan
Qaçıb öz atandan bəs bu nədəndir,
Özgə ataları yamsılayırsan?

Gülmə öz kökünə, ayıbdır sənə!
Ot kökü üstündə bitər, unutma,
Köhnə damğasını vurub atana,
Özgədən özünə sən ata tutma!

Yadın köhnəsi də dilin əzbəri,
Ənənən çiyninə niyə yük oldu?
Anlaya bilmirəm, nə vaxtdan bəri
Yadı yamsılamaq yenilik oldu?!

Bütün köhnələrə: – "bu nədir?" – deyə
Gülsək, nə qazanar bundan gələcək?
Vətən də, millət də köhnədir deyə
Bəlkə təzəsini axtarmaq gərək?

Onda kim deyəcək, kim, bizə yaxşı?
Hər köhnə pis deyil, hər təzə yaxşı!
Levə[1] nə deyirsən? O qoca loğman,
Özgə bulağından qətrə içmədi.
Fövqəlbəşər oldu, ancaq heç zaman,
Mujik paltarını o dəyişmədi!

---

[1] L.N.Tolstoya işarədir.

“Təzə yol!” – deyib də qışqırmayın siz,
Sənət aləmində yol birmi, yüzmü?
Əsl sənətkarı yolsuz, cığırsız
heç gördünüzmü?
Yaz ilham deyəni, ürək deyəni,
Yol özü dolanıb tapacaq səni,

Qəlbini, beynini nahaq yorma sən!
Amandır, özündən yol uydurma sən!
Yenilik xətrinə yazmaqdan sakın!
İlhamdır yaradan sənəti, şeiri.
Yağmaq xatirinə yağan yağışın
Nə bağa xeyri var, nə dağa xeyri!

Qəlbinə, hissinə daim arxalan,
Bir də... əlvan səsli illərimizə.
Köhnə söz deməmiş ilham heç zaman
Hər qəlbin öz sözü təzədir bizə!

Nəsənsə, özün ol!
Təzəsən onda,
Sən köhnə olursan yamsılayanda!
Nəsənsə, özün ol,
Kökündən yapış!
Dünənə arxalan,
Bu gündən yapış!

*Dekabr, 1966*

## EKRANDA GÖRÜŞ

Oğul şəhərdədir,
Anasa kənddə,
Görüşə bilmirlər bir məmləkətdə.

Ekranın önündə oturub ana
Fəxrlə,
Qürurla baxır oğluna.

Oğul şeir oxuyur: “ay anam sənə
Canımı versəm də, bu azdır yenə...”

Oğul şeir oxuyur,
Ana dinləyir.
“Balam bir balaca sınıxıb” deyir.

*May, 1966, Şəki*

## MEŞİN QAPILAR

Gözləmə otağında
Saatlarla gözlərin
Lal qapıya dikilər.
Mənim nə çəkdiyimi
Qapılar arxasında
Mürgü döyənlər bilər.

Ürəyində böyüyür,
Dodağında kiçilir
Sözün də, sualın da.
Ax!.. bizim ömrümüzün
Görən neçə parçası
Əriyib külə dönmüş
Qapıların dalında?

Qapılar arxasında
Biz nə qədər durmuşuq.
Neçə gözəl arzunu
Siqar tüstülərilə
Havaya sovurmuşuq.

Ax, sərt üzlü qapılar,
İki üzlü qapılar
Talelər həll olunur
Qapının o üzündə.

Adamlar boynubükük
Əyləşib mat-məəttəl
Qapının bu üzündə.
Dindirsən gələr dilə
Qapıların ağzına
Səpilən tozlar belə.
Onlar toz deyil, ancaq
Qapılara toxunub
Ayaqların altına
Tökülən arzulardır.
Ürəklərdə doğulub,
Bircə “yox” kəlməsilə
Yox olan arzulardır.

Ax!.. Bu bir kəlmə “yox”un
Arxasında nələr var,
Neçə əyilmələr var.
O “yox” deyir, bu, yoxdan,
O özü də xoşlanır.
Deyirəm ki,
Yaltaqlıq da,
qorxaqlıq da
Elə burdan başlanır.
Siz ey meşin qapılar,
Siz ey meşin qapılar,
Sizin üzünüz soyuq;
Sizdən ümidlə girib,
Ümidsiz çıxan da çox.
Sizi təpiklərilə
Vurub açan tapılar,
Siz ey bağlı qapılar,
Qaşqabaqlı qapılar!

*Sentyabr, 1966*

## ÜMİD

Qorxmuram, düşmənim qoy min-min olsun.
Neyləyər mənə?
Şöhrət sənin olsun, ad sənin olsun,
Ümid ver mənə!..

Ümid istəyirəm, mən ümid ancaq,
Ümidlə qoyaram dağı-dağ üstə.
Nə şöhrət, nə mənsəb, nə dövlət, nə var.
Ey könül, dünyadan sən ümid istə!..

Ümid arzuların qızıl naxşıdır.
Deyərlər, yeməkdən ümid yaxşıdır.

Deyək dənizdəyəm, sahil görünmür.
Ümid mənimlədir,
o, məndən dönmür.
Sahilə can atıb çırpınır ürək.
De, neyləyəcək
Üstümə şığıyan ləpələr mənə?
Ümid ver mənə!

İnamla ucaltdıq anamız yeri,
Biz möhtac olmadıq dosta, düşmənə.
Dəmir çəpərləri, daş hasarları
Dişimlə sökərəm, ümid ver mənə!
Həsrət də, hicran da deyil qorxulu.
Ümidlə açılar hər eşqin yolu!
Bir il – bir an kimi görünər mənə.
Ümid ver mənə!
Həsrət – vüsal qədər xoş gələr mənə,
Ümid ver mənə!
İnam ver mənə!

Yaman darıxır,
Səfərə çıxır
Mənim könlümdəki xəyallar yenə,
Bələdçi yerinə ümid ver mənə.

Diləklər ümidlə birgə doğulsa,
Yerin tərkində də ucalar insan.
Arzumu tapmağa ümidim olsa,
Mənzil başındayam, yola çıxmadan.
Ümidlə qoyaram dağı dağ üstə.
Ey könül, özündən sən ümid istə!..

*Mart 1967*

## ŞAİR – VƏTƏN

Arada-bərədə görürsən tez-tez,
Deyirlər: "Nə çoxdur şairlərimiz,
Bunun qarşısını alaq biz gərək,
Bizə həkim gərək, mühəndis gərək..."

Mənsə deyirəm ki, şair bol olsun,
Bütün doğulanlar şair doğulsun.
Sənətkar sənətə amalla başlar,
Şeirim – amalımdir – desəm, yeridir.
Şeir yazmasa da, əqidədaşlar
Dünyanın ən böyük şairləridir.

"Şair çoxdur" deyə gileylənməyin,
Əlhəzər eləyin tüfeylilərdən.
Yaxşı söz önündə siz də baş əyin,
Şair ki, yığmayır sözləri yerdən.

Şairi kimsəyə dəyişmərəm mən,
Onlar hər cilvədə min sirr axtarır.
İdrakın irişməz dərinliyindən
Onlar söz axtarmır, fikir axtarır.
Onlar gecə-gündüz dərd, ələm çəkir,
Bu ağrı gəlməsin çox yüngül sizə.
Bəlkə də ən zəif, ən kiçik şair
Böyük vətəndaşdır Vətənimizə...

Şairin bədəni – bu ana torpaq,
Nəfəsi – xəzridir, qanı – Kür, Araz.
Çox şey Vətənsiz də yaşayır, ancaq
Şeirsə Vətənsiz, elsiz yaşamaz...
Şairə vəzifə, rütbə nə gərək!
“Vətən”, “Vətən” deyir könül səsi də.
Vətəni sevməkdir, Vətəni sevmək,
Şairin ən böyük vəzifəsi də.

Ancaq... bəla onda, dərd ondadır ki,
Vəzifə xumarı gözünü örtən,
Vətəni pul kimi cibinə dürtən
Bir rüşvət düşgünü, rütbəli nadan
Durub kül üfürür gözlərimizə.
Vətəni sevməyin “qaydalarından”
Utanmaz-utanmaz dərs deyir bizə.

Vətəni sevməkdə nə qayda, qanun?
Vətən sevgisinin hüdudu varmı?
Ey nadan, ölçülər özünün olsun,
Məhəbbət ölçüyə, həddə sığarmı?

*May, 1967*

## MİZ ARXASINDA

Gündüzlər gəzirəm bizim şəhəri,
Axşamlar qonuram öz budağıma.
Axşamlar xəyalım gəzir hər yeri
Dünyanı sığdırıb dar otağıma.
Masa arxasında mən söz ordumu
Çəkirəm üstünə hər qaranlığın.
Mən bütün dünyanı,
Mən öz yurdumu
Mizimin üstündə görürəm aydın.
Masa arxasında... əlimdə qələm

Gəzirəm dünyanı mən qarış-qarış,
Mənim xəyalımın, deyirəm, bu dəm
Ayağı dəyməyən bir yer qalmamış.

Masa arxasında könlüm biqərar –
Yolum neçə kənddən, şəhərdən düşür.
Vyetnama yağan ağır bombalar
Elə bilirəm ki, evimə düşür.

Güclüyəm! – deməli, mən haqqam, deyə,
Zülm haqq paltarı geyinir bu gün.
Mənim misralarım dönür gülləyə
Evini tutanda güclü gücsüzün.

Sinada yandırır gün göyü, yeri,
Yenə də ərəbin Vətəni darda.
"Su" deyib yananda ərəb əsgəri
Mənim dodaqlarım çatlayır burda.

Masa arxasında öz ürəyimi
Məşələ döndərib yandırıram mən;
Dünyanın dərdləri mürəkkəb kimi
Axır qələmimdən, axır sübhəcən.

Ürəyim ilhamla, sözlə dolanda
Hər sətrim könlümdən od alır mənim.
Duyan bir ürəkdə tel qırılanda
Şeirimin vəzni də qırılır mənim.
Masa arxasında... torpağın, yerin
İsti nəfəsiyəm, zərif ətriyəm.
Mən havanın deyil, hadisələrin,
Könül dünyasının barometriyəm.

Qoşuram ardınca xoş xəyalların,
Yer mənim, göy mənim, asiman mənim.
Qəlbimdən min qəlbə gedən yolların
Əvvəli başlanır masamdan mənim.

Elə ki, qalxıram masa dalından
Xəyalım kiçilir, fikrim gərilmir.
Bayaq otağıma sığışan cahan
İndi öz-özünə sığışa bilmir.

Bayaq öz canıma, qanıma qıydım,
Bilmirdim vaxt keçir, yatasıyam mən;
Bayaq bir dünyanın vətəndaşıydım,
İndi övladımın atasıyam mən.

Oxuyun könlümü şeirlərimdən,
Könül gizlənməsin söz arxasında;
Dünyanın ən gözəl adamıyam mən
İlham aləmində, miz arxasında.

*May, 1967*

## RİYAKAR

Mənim övladıma ana dilində
Dərs deyən "ağıllı" müəllimə bax.
"Vətən", "Vətən" deyir,
Öz övladını
Əcnəbi dilində oxudur ancaq.
Özgəyə: "Dilini öyrən!" – deyirsən,
Özünsə... Bu dili bəyənməyirsən!..
Nə deyək bu miskin riyakarlığa?..
Yoxsa, öz qınını bəyənmir bağa?..
Bir nədir, beş-altı dil bilsin gərək,
Bizim sabahımız – körpələrimiz.
Vətən dilinə də dodaq büzməyək,
Burdan ayaq açıb, yola çıxaq biz.

Evdə ayaq açır əvvəlcə hər kəs,
Sonra uzaqlara düşür qədəmlər.
İlkini bilməyən sonunu bilməz,
Evdən üz döndərən çöldə vərəmlər.

“Əvvəl evin içi” demişlər nədən?
Sən çölü bilməzsən, içi bilmədən.
Yaxşı bilmək üçün özgə bir dili
Əvvəl öz dilini yaxşı bilməli.

Niyə özümüzü ögey sayaq biz?
Niyə atamızı tanımayaq biz?
Özgəni sevirsən?
İnanmıram mən!
Özünü sevməyən özgəni sevməz.
Vətənin dilinə gərəksiz deyən
Vətənin özünü necə sevir bəs?

Üzünə dursaydı yediyin çörək,
Rəzil olduğunu özün qanardın.
Dilimi dansaydım mən də sənin tək
Sən kimə dərs deyib pul qazanardın?

Vətən qeyrətini çəkməyən oğul
Həm özünə yükdür, həm özgəsinə;
Bu dildə dərs deyib qazandığın pul,
Yediyin çörək də haramdır sənə!
Böyüt balanı da sən özün təki,
Denən, özün yaşa, aləm yox olsun.
Namus olmasa da keçinər, təki
Dilin uzun olsun, qarnın tox olsun.
Səninçin dünyaya dəyər, a nadan,
Bir anlıq ötəri könül xoşluğun.
Min dəfə kiçikdir atalığından
Sənin insanlığın,
Vətəndaşlığın!

*Oktyabr, 1967*

## “ANAMIN KİTABI”

*Böyük əməlpərvər, böyük vətəndaş*
*C. Məmmədquluzadənin əziz xatirəsinə*

“Anamın kitabı!” – oxudum bir də,
Bu günüm dünənlə gəldi, görüşdü;
Cəlilin çaldığı sarı simlərdə
Qədim bir təmsil də yadıma düşdü:

Xərçəng – arabanı çəkir quruya,
Ördək – buludlara,
Kor balıq – suya...
Araba tərpənmir ancaq yerindən,
Sənin timsalınmış bu hal, ey Vətən!

Talandı bir zaman dövlətin, varın...
Varlıykən əl açdın sən özgələrə.
Yadlar yox,
Səni də öz övladların
Çəkdi üç tərəfə, çəkdi üç yerə.

Ana ümid oldu doğma övlada,
Övlad bel bağladı yadlara yalnız.
Övlad bilmədi ki,
qonşuya, yada,
Göz dikən qalacaq şamsız, çıraqsız.
Bu doğma torpaqda doğulub onlar,
Dedilər, biz hara, bu torpaq hara,
Doğma kitablara yad olub onlar
Ümid bağladılar yad kitablara.

Ananın kitabı çatdı imdada,
Dedi: “özünə bax, əl açma yada;
Vaxt çatıb uzağı, yaxını tanı,
Bil, sənin əvvəlin, axırın nədir,
Vətən xəstədirsə, onun dərmanı
Kənarda deyildir, öz içindədir...”

Anamın kitabı! Tarixdən qədim,
Çiçəkdən – təzə-tər,
Göylərdən dərin.
Ayağı altında torpaq görmədim
Anadan üzünü çevirənlərin.

Bu böyük mətləbi bilmədik bəzən,
Bizi bölə-bölə çəkdilər dara.
Əl çəkib müqəddəs atəşimizdən
Yüzillər baş əydik yad kitablara...

Tapdandı anamın şərəfi, şanı,
Bizdən sərvət alıb söz gətirdilər.
Bu boyda ölkəni – Azərbaycanı
Bir ərəb qızına cehiz verdilər.

Məni bağışlasın Şəhriyarım da,
Otuz il özgəyə "bəradər" dedi.
Öz doğma yurdunda, öz diyarında
Doğma anasına o, "madər" dedi.
Elə ki, yumruğu yerə dirəndi,
Dərhal yada düşdü doğmaca kəndi.
Bunlar nağıl deyil, tarixdir, ancaq
Tarixin hökmünə, könül, yaxşı bax!
Gəl bilək, insanmı, zamanmı haqsız
Gah ona, gah buna biz yamaq olduq.
Kiçik komamızı qoyub çıraqsız,
Özgənin qəsrində biz çıraq olduq.

Bu böyük dərdləri düşündü Cəlil
Onu qorxutdular,
öz amalından
Nə bezdi,
Nə küsdü,
Nə döndü Cəlil!
O da bu günlərə ümid bağladı,
Ayıldıb atamı,
bir ürək kimi
Milyon ürəklərdə döyündü Cəlil!

## MƏNƏ NƏ VAR?

*"Bizdə bu soyuq qanları neylərdin, ilahi?"*
***M. Ə. Sabir***

"Mənə nə var?!" dedin.
Düzmü dedin sən?
Birləşir axırda ən uzun yollar.
Kənara çəkilmə, bil ki, bu gündən
Bu gün mənə varsa, sabah sənə var.

Daşqın böyrü üstə yıxsa bir dağı,
Yanındakı dağ da əyiləcəkdir.
Bu gün yeyilirsə birinin haqqı,
Sabah da səninki yeyiləcəkdir.

Buzdan soyuq olar ilanın qanı,
İnsansan!
O isti qanın bəs hanı?
De görək, sən necə baxa bilirsən
Gözünün önündə tapdanan haqqa?
Nədən alışmayır bədənin, nədən,
Haqsız məşəl tutub o yanan haqqa?
Necə insan deyim, necə mən sənə?
Qoy övlad deməsin bu Vətən sənə!..

Əgər adamsansa... sev adamları,
Demə, bu, dostumdur, o, düşmənimdir;
Demə, əzizimdir ev adamları,
De, mən bu xalqınam, xalq da mənimdir.
Demə, daş yayınıb qardaşa dəydi,
Mən elə bildim ki, daş daşa dəydi.
Yurdun o başında yıxılan kəsin
Ağrısı qəlbində gərək göynəsin!

Ən böyük dəryanın birdir sahili,
Onu hər tərəfdən döyər dalğalar.
Bir böyük Vətəni, bir böyük eli
Tarimar eləyər "mənə nə var"lar.

Ağaclar qatarla cərgələnibdir.
Onlar bir-birindən çox uzaqdadır.
Budaqlar, yarpaqlar görüşməsə də,
Kökləri bir yerdə, bir torpaqdadır!

*Noyabr, 1967*

## OĞRULAR

Yusif, milis dostum, od kimisən sən,
Oğrunun, əyrinin qənimisən sən.
Ancaq...
Cürbəcürdür, axı, oğrular,
Anbar oğrusunu tutmağa nə var?..

Düşüb arxasınca bir tüfeylinin,
İzlər axtarmısan, izlər gəzmisən.
Kiçik oğrulardır hədəfin sənin,
Böyük oğrulardan xəbərsizmisən?
Gözlər önündədir dükan, ya anbar,
Artığı, əskiyi bilinir asan.
Əlhəzar,
əlhəzar,
dostum, əlhəzar,
Vicdan oğrusundan, qəlb oğrusundan...
Onlar aça bilir düz ürəkləri,
Ancaq...
Qıfıllıdır öz ürəkləri...

Haqqa qılınc çəkib vicdana qıydı,
Onlar üzümüzə baxdılar dik-dik;
Ya səndə, ya məndə qüdrət olaydı,
Onların içini aça biləydik.
Vəzifə sahibi bir imza üçün
Bizi süründürür on gün, iyirmi gün...
Taleyin asılıb tək bircə qoldan –

Sən bir imzadakı gücə bax, gücə,
Bir də görürsən ki, dağ boyda insan
Bir cırtdan önündə cücədir, cücə.

Ömür parçalanıb doğranır min-min,
Səpilir yollara get-gəl içində.
Gəlməzdi bu vaxta bir tikə heyfim,
Əgər ərisəydi əməl içində...
Haray!
Az ömürdən vaxt oğurlanır,
İnam oğurlanır,
Əsəb korlanır...

Bilmirəm, sən mənə başa sal bunu,
Bu hansı zamandır, bu hansı çağdır. –
Əsəb oğrusunu, qəlb oğrusunu,
Sevinc oğrusunu kim tutacaqdır?

Bir daş sifətlinin, bir sərt cavabı
Uman ürəklərdə iz açır dərin.
Bəs niyə sorulmur haqqı, hesabı
Ürəkdə açılan bu şırımların?..
Çoxalır şırımlar, artır şırımlar,
Dönüb infarkt olur ürək də bir gün.
Bir həlqəyə dönüb axır şırımlar,
İri nöqtə qoyur sonuna ömrün.

Sonra deyirlər ki, indi adamlar
Ölür birdən-birə dağ uçan kimi.
Məgər ürəyinə düşən şırımlar
Onu yavaş-yavaş öldürmürdümü?
Bəs onun ömrünü kim oğurladı?
Bəs niyə dəyişir oğrunun adı?..
Malı ucuz alıb, baha satanlar
Dəllaldır,
Onları cilovlayaq biz.
Zəhmətsiz, mayasız qazanan da var,
De görək onlara nə ad qoyaq biz?..

Dəllalmı? Yox!
Bu ad yaraşmır ona,
Onun bir adı var: “mədəni” oğru.
Talayır adamı göz baxa-baxa
Bu yeni cibkəsən, bu yeni oğru...

Haqqı tapdasa da,
Söylə, bir nədən
Güclünü çox yerdə doğru sayırlar?
Əlini uzadıb uzaq qitədən,
Gücsüzün varını oğurlayırlar.

Belə dəllallara deyən yoxmu bir:
Hərrac malımıdır namusun, arın?
... Bəs kökü nə zaman kəsiləcəkdir
Bu gizli, mənəvi oğurluqların?

*1967*

## MƏNİM ANAM

Savadsızdır,
Adını da yaza bilmir
Mənim anam...
Ancaq mənə,
Say öyrədib,
Ay öyrədib,
İl öyrədib;
Ən vacibi:
Dil öyrədib
Mənim anam...

Bu dil ilə tanımışam
Həm sevinci,
Həm də qəmi...
Bu dil ilə yaratmışam

Hər şeirimi,
Hər nəğməmi.
Yox, mən heçəm,
Mən yalanam,
Kitab-kitab sözlərimin
Müəllifi – mənim anam!..

*Yanvar, 1968*

## İKİ KOR

Bir kor tanıyıram, gözü korsa da,
özü kor deyil.
Bəzən qəm odunda qovrulursa da,
Ağlına, hissinə o nankor deyil.
Gecəli-gündüzlü yazır, oxuyur.
Ağlının gözüylə o görür, duyur.

Ancaq... biri də var... kor deyilsə də,
gözü görməyir.
Dostu göz önündə öldürülsə də,
görmədim deyir...
Yaxşıya ortaqdır, yamanı görmür,
O, saata baxır, zamanı görmür.
Fikrini, hissini ucadan deməz,
Bəzən gördüyünü görmək istəməz.

Gözləri görməyən kor deyil hələ,
Görmək istəməyən kordur, deyərdim.
Belə müqəvvaya, belə cahilə
Həyatın özü də gordur deyərdim.

*1968*

## SƏHƏNDƏ MƏKTUB

Səhənd, sözlərindən odlar töküldü,
Oxuduq şeirini göz yaşlarıyla.
Ata malı kimi yarıya böldü,
Qardaş eyni dərdi qardaşlarıyla.

Yazdın, eyni dərdi yaşayaq bahəm,
Qardaş qardaşıyla həmfikir olar.
Sənin düşüncəndi mənim düşüncəm,
Dərdlər bir olanda fikir bir olar.

O acı fəryadlar, şirin nəfəslər
Mənim də könlümün ahı, naləsi!
Qardaşım, Təbrizdən gələn bu səslər
Bakının səsidir, Bakının səsi!

Deyirsən, yarıya bölünənlərin,
Dərdini dünyada bir bilməyən yox.
Biz də bölünmüşük, ancaq bu dərdi
Uca kürsülərdən heç bir deyən yox.

Yıxılar kənardan itələnənlər.
Təkanı yaradaq özümüz gərək.
Yenə də "olarıq həmən xak"[1] əgər,
Biz öz içimizdən itələnməsək.

Xırda təpələri sellər oyanda,
Əsər bu həmləyə dağlar da zağ-zağ.
Biz də dərdimizə ağlamayanda,
Bizim yerimizə kim ağlayacaq?

Günahkar tutmayaq burda heç kəsi,
Dərilib ayrıldıq biz qonça-qonça.
Ana da süd vermir, ciyərparəsi
Nalələr qoparıb ağlamayınca.

---
[1] Fars şairi Sədinin "Həmən xakəm ki, həstəm" (Həmən torpağam ki, varam) misrasına işarədir.

Deyirsən, salama cavab almadın,
Bulud toqquşmasa, buluda neylər?
Mənim öz adımdır sənin öz adın,
Odu su keçirər, od oda neylər?

Mən dizimə döyüb zar-zar ağladım,
Çöllər göz yaşımdan gölmə-gölmədi.
Qranit dağları dələn fəryadım,
Tək Araz çayını aşa bilmədi.

Yüz il, yüz əlli il ağladıq əbəs,
Ancaq ərimədi sinə dağları.
Qardaş, bilmədik ki, göz yaşı dəlməz,
Arzunun önündə duran dağları...

Dünyada hər şeyin bütövü gözəl,
Yarımçıq səadət düşmənin olsun.
Mənə qəm versən də, yarı bölmə, gəl,
Sevinc verirsənsə... qoy yəqin olsun.

Hamlet doğru deyib: "Ya öl, ya da ol!"
Ey!... Yarı canınla demə ki, varsan.
Qəmin də tamını istəyən oğul,
Bəs yarı Vətəndə necə yaşarsan?

Hanı?...
Sormadılar – bəs yarı canın?
Niyə ucaltmırsan üsyan səsini?
Hələ görməmişik, Azərbaycanın
Bir yerdə, biz bütöv xəritəsini...

*1968*

## FİKİR QANADLARIM

Mənim qanadlarım var:
Şirin-şirin arzular,
Böyük-böyük xəyallar
Qanadlarımdır mənim!..
Dünya – qanadlarımçın
çox kiçikdir, kiçikdir,
Kainatdır – Vətənim!..

Arzular dünyasına
Uçan zaman ağıllar
Yarandı əfsanələr,
Əsatirlər, nağıllar...

Uçuram, hey!.. uçuram!..
Mən təpə, düz bilmirəm.
Gecə, gündüz bilmirəm!
Xəyalın bir hüdudu,
Xəyalın bir həddi yox!
Göylərin sərhəddi yox!
Quşlar niyə azaddır?
Azadlığın təşbehi,
Yaşayır quş adında.
Azadlıq uçur, uçur,
Quşun sərhəd bilməyən
O qoşa qanadında.
Fikrin qanadları da
Azaddır!..
Sərhəddi yox!
Səma kimi həddi yox!..
Fikirdə min hal olur.
Bəzən səmanın özü
Fikrə darısqal olur!

Uçur, uçur xəyallar,
Səmadan da o yana.
Boşluqda mənzilmi var –
Orda fikrin qanadı,

Qərar tutub dayana?..
Nə qədər istəyirsən
Bax!
Üzümə bax! Nə qəm!
Məndən çox-çox böyükdür
Ayaqları başımda
Başı, sonsuz səmada
Süzən fikrim, düşüncəm!..

Mən azadam, azadam!
Mənzili görünməyən
Bir əbədi yolum var.
Məni yerdən qaldıran,
Həddi, hüdudu qıran
Fikir qanadlarım var.

*Yanvar, 1969*

## ŞAİRLƏR

Şairə heykəllər qoyulan zaman,
Deyirlər, ona bax, nə bəxtəvərmiş.
Ancaq demirlər ki, mən yaşayırkən,
O öz sinəsini masaya gərmiş.

O keçib canından ömrə qıyanda
Sənin nəşələrin aşıb-daşırdı.
O ki yaşamırdı, sən yaşayanda
Sənin yerinə də o alışırdı.

Dəryanın dibindən çıxmamış hələ
Tanımaq olmayır mərcanı, dürrü.
Sən həsəd aparma o daş heykələ
Ömürdən sonradır onların ömrü.

Şairlər, şairlər, bircə söz üstə
Sübhədək yaxdınız ürəyinizi.
Sizi görmədilər heç vaxt diz üstə –
Qəribə yaradıb təbiət sizi!

Hamıdan gec yatıb qalxdınız erkən
Ağardı dan yeri gözlərinizdə.
Min əzab çəkdiniz siz yaşayırkən
Ölüb yaşadınız sözlərinizdə.

Zamandan-zamana əqidənizi
Keçirib yaşatdı nəğmələriniz;
Adi bir uşaq da aldadar sizi –
Xəyal dünyasında yaşadınız siz.

Bir kam almadınız siz ki, doyunca,
Sizə xoşbəxt deyən tanımır sizi.
Heç kəs çəkə bilməz ömrü boyunca
Sizin bircə gündə çəkdiyinizi.

Dünyanın əlindən dad çəkən zaman
Xəyal kölgəsində daldalandınız.
Şahların, çarların saraylarından
Alçaq daxmaları uca sandınız.

Ölümdən, sürgündən qorxmayıb əsla
Yanıb özünüzü oda atdınız.
Ürək qanınızla, amalınızla
Zindanlar küncündə söz yaratdınız.

Təqiblə gəldiniz daim döş-döşə
Yolunuz haqq yolu, həqiqət yolu.
Bu da qəribədir, sizin həmişə
Cibiniz boş oldu, qəlbiniz dolu.

Sözünüz, qəsdiniz çıxdı sınaqdan
Ötüb haqq nəğməsi, haqq oldunuz siz.
Yaşamaq naminə keçməyib haqqdan,
"Ənəl-həqq" söyləyib soyuldunuz siz.

Lağ edib güləndə haqqa yalanlar,
Siz də zəmanəyə, dövrə güldünüz.
Gah gizli-xəlvəti, gah açıq-aşkar,
Gah da duellərdə öldürüldünüz.

Dünyanı gəzdiniz siz oymaq-oymaq,
Fərəhin içində qəm gördünüz siz.
Adi bir milçəyə qıymayıb, ancaq
Bəzən özünüzü öldürdünüz siz.

Sizindir dünyanın sinə dağları
Bu dağlar içində kama çatdınız.
Siz hey yana-yana, qaranlıqları
Könül atəşilə işıqlatdınız.

Zalim zülmündə də naşıdır, naşı,
Axı, əzabdan da zövq aldınız siz.
Zalimlər, cahillər hər addımbaşı
Sizi alçaltdıqca ucaldınız siz.

Sanmayın özümü sanıram yəqin
Belə şairlərin cərgəsində... Yox!
Axı, mənim kimi şaircıklərin
İlhamı az olur, iddiası çox!

Şair – fikirlərin çırpınan seli,
Şair – həqiqətin müğənnisidir.
Şair – təbiətin danışan dili,
Şair – cəmiyyətin üsyan səsidir.

Şair – zəmanənin, əsrin vicdanı,
Şair – tarixlərin şərəfi, şanı,
Şair – bu dünyaya zamanın sözü,
Şair – həqiqətin, haqqın güzgüsü!

Bütün millətləri siz anlarsınız –
Sevən də sizsiniz qəlbən onları.
Vətənə gəlincə, məcnunlarsınız –
Vətən məcnunları, el məcnunları.

Məcnunluq gözəldir! "Bu nədir?" – deyə
Hər cahil anlamaz bu ülviyyəti,
Yazıq o kəsə ki, yoxdur bir şeyə
Nə sonsuz nifrəti, nə məhəbbəti!

Yoxdur beləsinin amalı, yolu,
Qəlbi ehtiyatdan çilik-çilikdir.
Düşmənin nifrəti deyil qorxulu,
Dostun soyuqluğu düşmənçilikdir.

Bəzən yıxıldınız ancaq çəlikdən,
Kömək ummadınız ağır gündə də.
Həmişə qaçdınız biganəlikdən,
Ürəklə öldünüz siz öləndə də.

*Noyabr, 1969*

## BEŞİK

*M.Zeynal müəllimə*

Kəndimə getmişdim,
Gəzdim hər yeri –
Təzə küçələri, təzə evləri...
Hər köhnə ocaqda, təzə bir ocaq...
Ruhum təzələndi, fikrim ucaldı.
Təzəlik gözəldir, gözlərim ancaq,
O köhnə yüyrükdə, beşikdə qaldı...

Beşik... nişanədir uşaqlığımdan,
Könlümdə ah nələr, nələr oyatdı.
Bu taxta beşikdə axı, bir zaman
Anam da, atam da, babam da yatdı!..
Beşik ilk mənzilim, ilk yuvam mənim,
Laylalar dünyası ilk dünyam mənim.

Babamtək, atamtək dünyaya mən də
Açdım gözlərimi taxta beşikdə.
Anam beşiyimi tərpətməyəndə,
Bilərdim, keşikçim yatıb keşikdə.

Qoymazdım anamı ala dincini,
Doymazdım anamın gül nəfəsindən.
Dadardım dünyanın ilk sevincini
Beşikdən asılan "şax-şax"larla mən.

Elə bilirdim ki, dolanır dünya,
Mənim beşiyimin başına ancaq,
Mənim dünyam idi uşaqlığımda
Bir anam, bir beşik, bir də o şax-şax!..

Qara gözmuncuğu sol biləyimdə,
Beşiyin üstündə üzərrik, quran.
Anam qoruyardı məni bunlarla
Dünyanın hər cürə bəlalarından.

Bizim ala-bəzək bu beşiklərdə
Ümidlər, arzular, diləklər yatıb.
Qılınc çəkmək üçün ələmə, dərdə
Sabirlər, Nəbilər, Babəklər yatıb.

İnsanın insana məhəbbətini,
Ey beşik,
İlk dəfə biz səndə duyduq.
Dünyanın zövqünü, səadətini
Ananın o ilıq südündə duyduq:

Laylay dedim yatasan,
Qızıl gülə batasan,
Qızıl güllər içində
Şirin yuxu tapasan.

Hopdu ruhumuza bayatılardan
Nəğməyə bənzəyən ləhcələrimiz.
Daddıq dilimizin şirinliyini
Hələ bələkdəykən bu beşikdə biz.

Beşiyin üstünə səpildi dən-dən,
Qaynar çeşmələrin zümzümələri.
Aldı öz kökünü beşiyimizdən
Üzeyir nəğməsi, Füzuli şeiri.

Laylanın hər xalı bir ümid, güman,
Onun ahənginə qaynadı qanım.
Anamın yanıqlı laylalarından
Süzüldü ruhuma Azərbaycanım.

Yoxsul babaların qaranlıq damı
Güldü körpələrin gülüşlərində.
Atdıq dünyamıza biz ilk addımı
Taxta beşiklərin həndəvərində.

Düşdük arxasınca xoş xəyalların,
Arzular ayırdı bizi də bizdən.
Uzaq səfərlərin, böyük yolların
Əvvəli başlandı beşiyimizdən.

Çıxdı qarşımıza gah dağ, gah dərə,
Həyat gözümüzdə bir sual oldu.
Bir beşiyə sığan Nəsimilərə,
Sonra cahan özü darısqal oldu.

Bizim anaların laylalarından
Axdı ruhumuza Vətənin özü.
Beşik kökümüzdür... ucalıb ordan
Tanıdaq dünyaya öz kökümüzü!..

*1969*

## BULUDLAR NƏ YAMAN GÖZƏL OLURMUŞ

Komamız meşənin qalın yerində,
Dağda salamlardı hər günü babam.
Odun daşımadı, çiyinlərində
Daşıdı həyatın yükünü babam.

Səksən il, ömrünün hər bir anında
Qəmi şərbət kimi içərdi babam.
Ömrünün tarlasına qəm kotanında
Həmişə gül əkdi, vay dərdi babam.

Ancaq darılmadı, çalışdı yenə,
Dərdi, tabaqladı, dərdi üyütdü.
Qatlaşıb dünyanın hər möhnətinə
Yeddi lay divarlı oğul böyütdü.

Dedi, şərəfidir hər kəsin adı –
Yaşa gülə-gülə, öl gülə-gülə.
Yeddi tərlanına o, əl açmadı,
Ölüncə yaşadı öz əməyilə.

Dinməzcə dolaşdı bir gün o, kəndi,
Gəlib yatağına girdi nagahan.
Ömründə bir dəfə o xəstələndi,
Həmən azarla da köçdü dünyadan.

Yatdı üzü üstə, yatdı iki ay,
Dinmədi.
Nəyisə andı və yandı.
Nəhayət çöllərə düşdü hay-haray,
Yazın nəğməsinə kişi oynadı.

Dedi, çöldə salın yerimi, çöldə,
Son dəfə seyr edim çölü-çəməni.
Gör nə yaman yerdə gəldi əcəl də,
Arxası üstünə çevirin məni.
Yerini saldılar göy çəmən üstə.
Uzandı, dərindən köks ötürərək.
Göydə ağ buludlar dəstəbədəstə,
Yerdə badə tutan gül ləçək-ləçək.

Üfüqdə yanardı buludlar par-par,
O baxdı göylərə... axşam çağında.
– Mən indi görürəm, – dedi – buludlar
Nə gözəl olurmuş göyün tağında.

Babam niyə baxdı göyə son kərə?
Getdi damağında dünyanın dadı.
Səksən il yaşadı,
ancaq göylərə
Doyunca baxmağa macal tapmadı.

*Avqust, 1968*

## ELƏ BİR FİKİR Kİ...

Mən fikir acıyam, mən fikir acı,
Fikir möhtacıyam, fikir möhtacı.

Elə bir fikir ki, o mənə rəhbər,
Mən ona adicə bir əsgər olum.
Onun eşqi ilə doğsun səhərlər,
Mən onun yolunda səfərbər olum.
Yerimdən oynatsın məni top kimi,
Canımdan çıxartsın ətalətimi...

O fikir – öz yolum, öz adım olsun,
O mənim ən möhkəm qanadım olsun.
Dönüb ildırıma, qoy vursun məni,
Ulduzdan ulduza uçursun məni.

Elə bir fikir ki, o mənə candan
Daha əziz olsun,
Can unudulsun.
Mənim günlərimə bir yön, bir sükan,
Mənim illərimə o, ünvan olsun.
Elə bir fikir ki, yansın od təkin
Zülmət içində də yol versin mənə.
Elə bir fikir ki, gördüklərimin
İçini, məğzini göstərsin mənə.

Onu su keçirib, od əritməsin,
Yolunda yay kimi hey gərilim mən.
Ömrümün sonuna çatsın, bitməsin,
Onu nəvəmə də verə bilim mən.
Elə bir fikir ki, arzu da, kam da
Onun havasıyla bəslənsin müdam.
Elə bir fikir ki, qulaqlarımda
Döyüş nəğməsi tək səslənsin müdam.
Elə bir fikir ki, o gülən kimi
Hikmətlər açılsın,

Mәna durulsun.
Nәyә toxundusa, bir iksir kimi
Onun dәyәrini bildirәn olsun.

Elә bir fikir ki, tapınıb ona
Yoluna güvәnim,
Qürrәlәnim mәn.
Uçum o amalın sonsuzluğuna
Zirvәlәr başında zirvәlәnim mәn.

Gözә görünmәyәn ömür yolumdur
Xәyalla, imanla dolu fikirlәr.
Mәnim sәhәrimin dan şәfәqlәri –
Sabahın körpüsü, yolu fikirlәr!

Zülmәtin içindә ulduztәk yanar,
Dәniztәk qovrular, göltәk çalxanar,
Axır mәnzilini bir mәbәd sanar
Müqәddәs fikirlәr, ulu fikirlәr.

Bәzәn nalә çәkib tökәr göz yaşı
Hәmişә özümlә durar yanaşı.
Özümün hakimi, sözümün başı,
Eşqimin, arzumun qulu fikirlәr.

*İyul, 1970*

## TӘLATÜM

Tәlatümsüz ürәkdә
Qan da sırsıra bağlar.
Tәlatümdәn yaranıb
Deyәrdim sıra dağlar.
Su coşmasa,
daşmasa,
Qranit qayalarla

üz-üzə toqquşmasa
Təzələnməz,
durulmaz.
Duyğu dənizlərində
Çağlayan ürəklərə
Sinələr də dar olmaz...
Ömür burulğanından
Saxlamasın qoy məni
Anamın
qapımızda
yandırdığı üzərlik.
Mənim xoşbəxtliyimçin
Mənə gərək deyildir
Dəryaca bəxtəvərlik.
Həyəcansız
dar gəlir
Mənə köksün qəfəsi.
İnsan nəfəsi verin, mənə
İnsan nəfəsi.
Neyləyirəm nəfəssiz
Sıra-sıra düzülmüş
Rəqəmi,
ədədi mən?
İstəmirəm, a qardaş,
Yüz-yüz yalan vədi mən...
Mənə rəngsiz, boyasız
Bircə doğru söz verin.
Min gecəni neylirəm,
Mənə hərəkət dolu
Min səsli, min duyğulu
Təkcə bir gündüz verin!

Yüz-yüz yalvarışlara,
Min-min təmənnalara
Dəyişmərəm
ürəkdən
Gələn səsi, səmri mən.

İstəmirəm yüz illik
İzsiz keçən ömrü mən.
Mənə
Həyəcan dolu
yalnız bircə gün verin.
Yüz ulduz sizin olsun,
Mənə bircə gün verin!
Hər şeyi bütün verin!

Zirvələrin başında
Zirvə kimi
tək olum!
Ağlayanda mən bulud,
Güləndə şimşək olum.

*İyul, 1970*

## SƏHƏND QARDAŞIMIZA!

*Axdı gözlərimdən sel gizli-gizli*
***B.Azəroğlu***

Səhənd! Mehrabımız ana Vətəndir.
Mehrabın başına dön, aşkar-aşkar.
Arzu çələngimi dan şəfəqindən
Hörürəm, qardaşım, mən aşkar-aşkar.

Deyirlər: "Səbr edin, susun, gözləyin".
-Necə qışqırmayım, – necə? Bir deyin.
Sıxır bədənimi bu kor fələyin
Əynimə biçdiyi don aşkar-aşkar.

Məni qorxutmayır qara gecələr,
Zülmətin təşvişi hədərdir, hədər.
Gecənin bağrından doğulur səhər,
Qızarır üfüqdə dan aşkar-aşkar.

Baba kölgəsinə daldalanmayaq,
Kül olub kül üstə biz qalanmayaq.
Çillə quşu kimi gizli yanmayaq,
Odundan od alım, yan, aşkar-aşkar.

Haqqımı tapdayan məni nə anlar?
Haqqımdan danışır haqqı dananlar.
Belə də dərd olar, siz ey qananlar,
Ağla gizli-gizli, qan, aşkar-aşkar?

Kəndə səs düşməsə itlər hürüşməz,
Könül istəməsə əllər görüşməz.
Bir addım qabağa işığı düşməz,
İçindən yanmasa, can aşkar-aşkar.

Umur səhərini o yazıq Vətən
Bizim qəlbimizin öz atəşindən.
Belə gəlişini istəmirəm mən,
Gələsən, gedəsən sən, aşkar-aşkar.

*1971*

## VÜSALDA – HİCRAN

Məni görən kimi sən hönkürərək
Açdın qollarını...
Qucaqlaşdıq biz.
Bu gün qucaqlaşan qollarımız tək,
Nə vaxt birləşəcək bəs Vətənimiz?

Görüşdük, qardaşım, ilk dəfə bizdə
Ağladıq həm aşkar, həm xısın-xısın
Səni görməmişdən
ürəyimizdə
Səhənd dağı kimi sən ucalırdın.
O qədər uzağıq, bu qədər yaxın.
Görüşdük...

Həsrətə sonmu qoyuldu?
Ax!.. Yüz əlli illik uzun hicranın
Vüsalı, a qardaş, gün yarım oldu.

Dinlədik səsini öz könlümüzün,
Sükutda bu dərdi böldük, sevindik.
Sevincin içində ağladıq o gün,
Ağlaya-ağlaya güldük, sevindik.

Anabir, atabir qardaş!.. Dərdə bax,
Öz halal evində bir günlük qonaq!..
Biz elə baxırdıq sənə, elə bil,
Baxırıq min illik həsrətimizə.
Elə bil doğmaca elimdən deyil,
Özgə planetdən gəlmisən bizə.

Elə baxıram ki, çöhrən büsbütün
Güzgü tək əks edib könlümə düşsün!
Üzünün xətləri – o qaş, göz, tamam
Özümə bənzəyir... lap doğmasan sən.
Üzündə gəzdikcə gözüm,
sanıram
Keçirəm Təbrizin küçələrindən...
Xuduyla əyləşib o gün dizbədiz,
Vaxtı, saatları dəyişdirdiniz[1].
Sən ona qayıtdın, o sənə, qardaş,
Göz yaşı səpildi masanın üstə.
Deyirəm, bu dəmdə nə olaydı kaş,
Zaman da donaydı bu anın üstə.
Sən az danışdın,
Dinib alışdın.
Dedin: – Neyləyim?
Bütövlüyümə
Qıyırlar mənim.
Özümü parça,

[1] Həmin gün görkəmli alim Xudu Məmmədovla Səhənd qol saatlarını dəyişdirmişdilər.

Dilimi ləhcə
Sayırlar mənim...
Ağlayar bu dərdə dağ da, örüş də
Tapılar yenə də qınayan bizi.
Daha aydın gördük biz bu görüşdə
Amansız, gümansız həsrətimizi.

Xəncərim bir yana, pas atıb qını
Haray bu halıma, haray, hay-haray!
Vallah, görüşündə ayrılığını
Görən bədbəxtlərin halına vay-vay!

Məni görən kimi sən hönkürərək
Açdın qollarını...
Qucaqlaşdıq biz.
Bu gün qucaqlaşan qollarımız tək
Nə vaxt birləşəcək bəs Vətənimiz?

*1970*

## YOL – DAĞ

Addımlaya-addımlaya mən illəri,
Yol gedirəm
        Doğulduğum gündən bəri.
Yol gedirəm.
Pillələrim illər mənim, aylar mənim.
Öz məsləkim, düz məsləkim,
Ürəyimi
        zirvələrə haylar mənim...
Yol gedirəm,
        bilməsəm də,
Qarşıdakı addımların sayını mən.
Addımlarım qüvvət alır,
Xəyalımda gülümsəyən son pillədən.
Mənim yolum – bir məsləkin düz yoludur,
Mənim yolum – öz fikrimin öz yoludur.
Min hissim var,

Min arzum var.
Yolum birdir,
yolum haqdır.
Mənim yolum dağlar aşıb,
Zirvələrə çatacaqdır.
Bir ora bax,
Zirvəsində yol var dağın.
Dağ nə qədər uca olsa,
Yol üstündən aşar dağın!
Yol ucadır zirvədən də...
Yorularmı
Öz yolunu düz gedən də?
Ey yolunu, məsləkini
Tez-tez hava bürosuna girov verən, –
İqlim üçün dəyişdirən,
Doğrudan da, çox zirəksən,
çox qoçaqsan.
Onu bil ki,
Yarı yolda qalacaqsan...
Yolu ota dəyişdirən
cığırlarda itər, batar.
Zirvələrin min ətirli çiçəyinə yetişməmiş
Yoncalıqda əl-qol atar...
Yol qabağa, yol zirvəyə!
Bu yolları yağış döyə, boran döyə...
Bu yollarda düz yol gedən
Əyilməyə!..
Əyilməyə!..
Son zirvəyə gəlib çata!..
Alqış dedim bu ömürə,
bu həyata!..
Bir ora bax!
Zirvəsində yol var dağın
Dağ nə qədər uca olsa,
Yol üstündən aşar dağın!

*Dekabr, 1971*

## AXTARIŞLARIM

Dünyadan od alır arzu da, kam da,
Könlümün içində necə gizlənim?
Gözüm də, könlüm də, qulaqlarım da
Gecəli, gündüzlü axtarır mənim...

Nə gecə tanıyır, nə gündüz könül
Axtarır,
              axtarır...
                            "Yetər!" – deyəmmir.
Tapdığı incini doyumsuz könül,
Bu gün bəyənsə də, sabah bəyənmir.

Tapdım, uşaq kimi sevinirəm mən.
Özüm vuruluram sətirlərimə.
Sonra görürəm ki,
                            tapdıqlarımın,
Heç biri könlümcə deyilmiş, demə!
İstərəm, həmişə aşıb-daşam mən.
Gecəli-gündüzlü axtarışımdan
Tapdığım ləzzəti
                            tapdıqlarımda
                            tapmamışam mən.
Gəzib axtarıram,
                            Gördüklərim çox.

Min şeir gizlənib hər qarışımda.
Yox-yox!
Gözəlliyi tapdığımda yox,
Tapmışam əbədi axtarışımda.

*1972*

## ŞƏKİ

*"Özünüz şəkili olduğunuz halda, hələ*
*Şəkiyə bir şeir həsr etməmisiniz".*
***Bir məktubdan***

Bir nəğmə qoşmadım hələ mən sənə,
Dağlar bunu mənə kəsir sanmasın.
Mən dedim, vurğunam Azərbaycana,
Deyirəm, heç zaman xırdalanmasın
Könlümdən ucalan bu avaz, bu səs.
Böyükdür, ucadır məsləkim mənim.
Bala anasına "sevirəm" deməz,
Mən də deməmişəm, a Şəkim, mənim.

Sən öz keçmişini daim qorudun,
Babamın şöhrəti yaşayır səndə.
Bu eşqə eşq olsun!
                    Dünənlə bu gün
Çiyin-çiyinədir küçələrində...

Mən sənə borcluyam öz balan kimi,
Çox da ki şeirimdə görünmür adın.
Mənim oxuduğum nəğmələrimi,
Mənim qulağıma sən pıçıldadın.

Şerimin mayası – bu qaynar nəfəs
Sənin öz çiçəyin, sənin öz barın.
Şerimdə dil açıb danışmırmı bəs,
Sənin bulaqların, göy çinarların?
Mən həm bakılıyam, həm lənkəranlı,
Gəncəli, qubalı, həm naxçıvanlı.
Şəkili, şirvanlı, qarabağlıyam,
Bütöv Vətənimə bütöv bağlıyam.
Mən sənin qoynunda gəldim cahana,
Məni bəxş elədin Azərbaycana.
Həmişə mən sənin həndəvərində

Üçan bir quşam.
Bir eldə doğulub
xoşbəxtəm ki, mən
Böyük bir Vətənə oğul olmuşam.

*Noyabr, 1971*

## PİYADA – SƏRNİŞİN
(*İKİ YOLÇU*)

Baxdıq biz həmişə qabağa, önə.
Boylandı sabaha bu gündən illər.
Bir nəfər varmı ki, söyləsin mənə,
Necə gəlib keçdi ömründən illər?

Yayın bürküsündə, qışın qarında
Hamının qisməti bir olmur yəqin.
Ömrün əyri-üyrü dolaylarında
Kimi piyadadır, kimi sərnişin.

Piyada keçmişəm mən bu yolları,
Köməyi ummuşam ayaqlarımdan.
Qəlbimin oduyla şaxtanı, qarı
Əritdim, ömrümün ilk çağlarından.

Yanımdan maşınlar, qatarlar ötüb,
Mənə əl ediblər pəncərələrdən.
Onların başından yağış, qar ötüb
Göylərin altında islanmışam mən.

Sərnişin yol getdi, yoldan xəbərsiz,
Bilmədi bu yolda kələ-kötür var.
Ancaq piyadanın, xəbər – ətərsiz
Alnında iz açdı getdiyi yollar.

Yol özü apardı sərnişinləri,
Yolda nə iz qaldı, nə də toz oldu.
Ancaq piyadalar gördü dünyanı,
Sərnişin dünyadan xəbərsiz oldu.

Sürəti nə qədər yeyin olsa da,
Sərnişin mənzilə dolama çatdı.
Dağların başından aşdı piyada
Yolu kəsə getdi, yolu qısaltdı.
Yolu özü açan zirvədən keçər,
Yolu yolla gedən dağdan gen keçər.

Qovuşur ay aya, dolur il ilə
Mətləbi eynidir bu yarışın da.
Qəribə dünyadır,
sərnişin ilə
Piyada görüşür mənzil başında.

Ömür yollarında "rahat" gedənlər –
Zirvələr başına ucala bilməz.
Təkərlər üstündə diyirlənənər
Çatdığı mənzildə bənd ala bilməz.

Biri təkər üstə gətirildisə,
Birini gətirən ayaqlar oldu.
Biri bu mənzildə kirədar isə,
Biri bu mənzildə sahibkar oldu.

*Avqust, 1972*

## HEYRƏT!

"Heyrət, ey büt!"[1]
dedi dünyaya qələm
Aləmi bir seyrim yüz heyrətimdir.
Mən heyran olmasam yaza bilmərəm
Mənim nəğmələrim – öz heyrətimdir.

Bəzən deyirlər ki, dəyişib zaman
Hər şey adiləşib...

---

[1] Füzulinin "Heyrət ey büt, surətin gördükdə lal eylər məni" misrasına işarədir.

Nə sevinc, nə qəm!
Elə bir möcüzə tapılmaz,
insan,
Ona heyrətlənə...
Heyrətlənmirəm!
Əgər belədirsə, küsmə zamandan.
Qəlbinə yaxşı bax!
Qəlbin çox soyuq!
Heyrət qurtarıbsa, demək, cahandan
Gözəllik köçübdür, xəbərimiz yox!..

Görə bilmirsənsə gözəllikləri,
Bu aləm səninçün günahkar olur?
Gözü buz bağlayan bulaqlar kimi,
Soyuq adamın da qəlbi kor olur.

Göylər damar-damar,
Yer lağım-lağım...
Bu heyrət, bu sual dindirib məni.
Hələ körpəlikdən bu heyranlığım,
Sual köhləninə mindirib məni.

Mən öz heyrətimin çəmənliyindən,
Cavablar axtardım, suallar dərdim.
Heyran qalmasaydım bu dünyaya mən,
Heyrətsiz halıma heyrətlənərdim.

Heyranam açılıb hey varaq-varaq
Saçılan ləçəyin min-min rənginə.
Siz deyin, mümkünmü heyran qalmamaq,
Ahəngsiz dünyanın öz ahənginə?..

Hansını söyləyim?
Hansını sayım?
Dünya başdan-başa min sirr, möcüzə.
Siz deyin, mən necə heyran qalmayım,
Yerində deyilən gözəl bir sözə?..

Heyranam həmişə yanan könlümə,
Alovu şeirimdir, külü görünmür.
Heyranam toxuma, heyranam tuma,
İçini görürəm, çölü görünmür.
Otun pıçıltısı, küləyin ətri,
Torpağın nəfəsi – heyrət nidası!
Bülbülün cəh-cəhi, çiçəyin ətri,
Suyun zümzüməsi – heyrət nidası.
Heyrandır!
Budaqlar yarpağa heyran,
Torpaq daşa heyran,
Daş dağa heyran.
Sel dənizə heyran,
Su gölə heyran,
Çöl çəmənə heyran,
Gül gülə heyran!
Özünə heyrankən bu cansız aləm,
Ey insan!
Demə ki, heyrətlənmirəm!

Həmişə qorxmuşam biganəlikdən,
Yaşa heyran-heyran, öl heyran-heyran!
Məni soyuq-soyuq dindirincə sən,
"Can" deyib canımı al, heyran-heyran!

Sən odu, atəşi özgədən umma!
Aləm tutmayıbsa, köz ürəyində.
Bəsirət gözünü aç bu dünyaya,
Axtar heyrəti də öz ürəyində.

Heyrətim yaşayır dərdi-sərimdə.
Ölsəm...
gözlərimi qapamayın tez.
Baxın gözlərimə!
Bəbəklərimdə
Bir heyrət işığı görəcəksiniz.

*Noyabr, 1971*

## SƏHVLƏRİM, SƏHVLƏRİM!

Şübhələrim, gümanlarım,
Səhvlərim, nöqsanlarım,
Fəryadlarım, əzablarım, amanlarım!
Mən qaçdıqca əlinizdən,
Əməlimə
                Yağış kimi yağırsınız
Neyləyim ki,
Siz özümdən ağırsınız.
Salıb məni əzablara
Mənə gendən baxırsınız
                        bir yad kimi.
Mən gizlədə bilməmişəm ömrüm boyu
Dodağımın arxasında ürəyimi...
O alışıb.
O danışıb.
Yanımda dost olmayanda
Danışmışam özbaşıma.
Ürəyimin pıçıltısı
Dəyib mənim öz başıma
Toxmaq kimi...
Nə sevgimi gizlətmişəm,
Nə kinimi...
Əzab verib günlər mənə,
                        aylar mənə.
Adam var ki, ömrü boyu
Dodaqları təbəssümlü
Təbəssümü,
Bir pay kimi paylar sənə,
                        paylar ona,
                        paylar mənə...
Dili ilə ürəyinin arasında
Yüz-yüz illik yollar durur.
Dodağında güllər açıb
Ürəyində kollar durur.

Hər sözünün əvvəli “can”, axırı “can”
Belə yaşar axıracan.
Ürəyi buz,
Sözü isti,
Özü ilıq.
Çəkməmişdir ömrü boyu
Bircə dəfə peşmançılıq.
Bilməmişəm,
                    Nə çox imiş
Bircə qırıq nöqsanımı
                    şişirdənim.
Bir dəryaca kədərimdir
Bir damlaca səhvim mənim.
Başqaları keçər, bəlkə, təqsirimdən
  “Günahkaram, keç!” – sözümə.
Bağışlaya bilməmişəm
Öz səhvimi mən özümə.
Səhvlərim boğazımdan bərk yapışıb
          Yuxumu da dara çəkir.
Vicdanımı ora çəkir, bura çəkir.
Ürəyimdə vuruş gedir
Mən kiminlə vuruşuram,
               heç bilmirəm.
Yıxılıram, əyilmirəm.
Heç bilmirəm bu vuruşun adı nədir,
               qəsdi nədir?
Qəribədir,
               qəribədir!
Səhvlərim – alnımdakı qırışlarım,
Qəlbimdəki vuruşlarım.
Əzablarda mən özüməm,
Mən könlümün öz səsiyəm,
Rahatlıqda özgəsiyəm...
Səhvlərim – ürəyimin dilimdəki
Həm sevgisi,
Həm nifrəti.

Səhvlərim – Dost danlağı,
yad töhməti.
Səhvlərim! Siz mənsiniz,
Mən də sizəm!
Mən səhvimdə səhvsizəm!

*Noyabr, 1971*

## ATA YURDU

Şəkidə məhlə var nə qədər desən,
Gəldim bu dünyaya
"Yuxarı baş"da.[1]
Bir göz evimizdə nə desən vardı,
Taxça aşağıda, buxarı başda.
Çıxdı ahıllığım o evdən çölə,
Amma uşaqlığım yuxarı başda.
İndi mən həsrətəm ata yurduma,
Odu ürəkdədir, buxarı başda!

*Yanvar, 1974*

## BABAMIN KOMASI

*"Kollu koxa" povestinin*
*müəllifi* ***İsa Hüseynova***

Ay mənim ilk beşiyim,
İlk nəfəsim, ilk sözüm,
İlk gecəm,
İlk gündüzüm.
Könlümün bu həyatla
İlk böyük qafiyəsi –
Ay babamın dəyəsi!..
Səndən əlim çıxalı
İstəmişəm həmişə
Səni duyğularımın
Bəstəsində gizləyim.

Sən ey mənim ən ülvi
Saflığım, təmizliyim!
Mənim duyğularımın
Ən nəğməli, ən həzin
Pərdəsində durmusan.
Toz kimi səpələnmiş
Kövrək xatirələrdən
Bir aşiyan qurmusan.
Sən şeirimin ilk sözü,
İlhamımın mayası,
Babamın beli kimi
Daş-divarı əyilmiş
Ay atamın koması!..
Uçuq barılarında
Kərpiclərin qum kimi.
Göyərən vəhşi güllər
Çığıran arzum kimi...
Necə belini bükdü,
Ocağını qaraltdı
Amansız zaman sənin.
Yeddi oğul çıxardı
Bir vaxt qapından sənin.
Əyilsən də,
                durursan
Yenə də öz yerində.
Uçanlar qayıtmadı
Ay babamın koması,
Əlin bizə çatmadı.
Sənə salam verən yox.
Nə gələn, nə gedən var.
İndi uçuq qapını
Tıqqıldadar yağışlar.
Şəhərlərə uçalı
Bəyənmədik biz səni.
Qoymuşuq yalqız səni,
Ay babamın koması –
Mənim ilk nağıllarım,
Meşələrdə qurtaran

Ay mənim ilk yollarım,
Kölgəsi bənövşəli,
Ay böyürtkən kollarım,
Hər dərədən, təpədən
Mənim dəstə tutduğum
Al-əlvan çiçəklərim,
Lampanın dövrəsində
Uçan kəpənəklərim,
Hardasınız,
                    Siz harda?
Ürəyimə köçdünüz.
Siz indi yaşarsınız
Çığıran duyğularda...
Ay rəfləri kasalı,
Ay taxçalı, boxçalı,
Ay bağlı,
Ay bağçalı,
Qoşa pəncərələrdə
Pərdələri saçaqlı
Buxarılı,
Ocaqlı,
Alaca komam mənim,
Balaca komam mənim.
Təmiz duyğularıyla
Ürəyimi, hissimi
Gündə bir boy ucaldan
Ay uca komam mənim.

Sən vermisən,
Sən dedim
Bu ömür yollarımda
Ağır duyğularımdan
Daşıdığım yükü sən.
Beşinci mərtəbədə
Yaşasam da indi mən
Evimin də kökü sən,
Şerimin də kökü sən!..

*Avqust, 1970*

## GETMƏZ SÖZ YARASI

Bir soyuq baxışın odu, həniri,
Körpülər yandırdı, külü qaraldı.
Bir an baxıb ötdün...
Baxışın yeri
Çapılan könlümdə ömürlük qaldı.
Anın zərbəsini bir ömür yedi,
Nələr etdiyini an heç bilmədi.

Yoxdur ikincisi tək ömrümüzün,
Niyə zəhərlədin bir ömrü, niyə?
İsti bir baxışa möhtackən özün
Bəs niyə qıymadın onu özgəyə?..

Yaddaşdan bir yolluq silinib itər
Hər ömrün, hər günün min macərası.
Güllə yarasına nə var?
tez gedər,
Getməz söz yarası, eyham yarası.
Niyə danışmadın, niyə ürəklə?
Xoş sözə hamının ehtiyacı var.
İnsan yaşamamış yalnız çörəklə,
Sınan ürəklərin öz əlacı var.

Gözümüz önündə arzular, kamlar,
Narahat dünyada dinclik olarmı?
Ürək sındırmayın siz, ey adamlar,
Bülbül yuvasına daş atılarmı?!

Sınan bir könülə necə deyək: "Döz!"
Yamasaq bilinər sınığın izi.
Bəzən xoş bir baxış, xeyirxah bir söz,
Günlərlə, aylarla yaşadır bizi.

Dağsansa, sən danma təpəni, düzü,
Bu darkönüllülük nə verər bizə?
Xoş bir təbəssümü, gözəl bir sözü
Bəzən biz qıymırıq bir-birimizə?

Ürək də qocalır, axı, ilbəil,
O bizə həmdəmdir, biz ona sirdaş.
İnfarktdan qorxursan?
Ürək daş deyil,
Özgənin qəlbini sındırma, qardaş!

Mən səndən intiqam, sən məndən qisas?..
Alır verdiyini onsuz da zaman.
Adamlar, adamlar,
düşünsək bir az,

Hamıya yer çatar, genişdir cahan.
Əcəl başımıza kölgə salmamış
Sizdən "can" eşidim, sizə "can" deyim.
Adamlar, adamlar,
yalnız xoş baxış,
Bir də təbəssümdür sizdən istəyim.

*Yanvar, 1974*

## GÖYNƏRTİ

*Nurəddin Bağır oğlu, bu şeiri*
*atalarımızın xatirəsinə həsr edirəm.*

Mənim atam
Öz qəlbində dəfn etmişdi
öz-özünü.
İçəridən alışardı
Öz ahıyla, öz dərdilə
Dağıdardı tüstüsünü.
Nə dərdini bildirərdi bir kimsəyə,
nə qəmini.
Saçlarında ağardardı sitəmini.
Hər acıya qatlaşardı,
o, aşardı
Aşılmayan sirti, dağı,

Onun üçün ən dəhşətli bir əzabdı,
Əzabından danışmağı...
Bir pərdəyə köklənmişdi onun qəlbi –
Axşamı da, səhəri də,
Sevinci də, kədəri də...
Salammadı onu bir an
Nə ağrısı, nə acısı
Dayandığı məqamından...
Vaxt ötdükcə...
İstədiyi yönə salıb
Zaman onu xamır kimi
kündələdi.
Yaman onu rəndələdi...
Qırışlandı illər onun
sifətində,
Zaman onun qəlbində də
cığır açdı.
Ürəyi də yuxalaşdı...
Bulud kimi hey boşalıb
doldu kişi,
Dəymə-düşər oldu kişi.
Görürdük ki, gah açılır,
gah tutulur.
O, hamıdan sevgi umur,
qayğı umur.
...Mən də onun özü kimi
Xəsis idim
öz sevgimi bildirməyə.
Ona təsəlli verməyə
Utanırdım, sıxılırdım.
Ürəyimi bildirməyi
Öz-özümə ar bilirdim.
Mənə elə gəlirdi ki,
Onu öpüb qucaqlamaq
Yüngül çıxar,
Çox şit çıxar.
O, karıxar,
O, darıxar.

Nə biləydim,
Elə bunu gözləyirmiş
Bəlkə məndən
                    o, dolanda,
Bulud kimi tutulanda...
Adicə bir övlad kimi,
Mən atama
          nə qayğımı bildirərdim,
                    Nə sevgimi...
Ürəyinə baş vurmadım,
Qulluğunda heç durmadım...
Bilmədim bir istəyini,
                              diləyini,
Öz sevgimlə
İsitmədim ürəyini...

yaşayarkən
          mənim ona kiçicik bir təbəssümüm
Süzülərdi ürəyinə
                    könül açan bir nəğmə tək.
O öldümü?
Bundan sonra
Təəssüflə axıtdığım göz yaşlarım
Kimə gərək,
Nəyə gərək?

Bəli, artıq keçmiş ola!
Kim görüb ki,
Təəssüflə qəlb boşala?
Hayıf! Hayıf! Nidasına
Çatır ancaq qüdrətimiz.
Əlimizdə olan zaman
Biləmmirik heç bir şeyin qədrini biz.
Ey övladlar,
ayıq salmaq istəyirəm
                    indi sizi.
Gizlətməyin
atanıza, ananıza
                    sevginizi.

Olursunuz, duman olun,
sis olmayın,
Nədə xəsis olsanız da
Sevgidə xəsis olmayın!
Əbədilik bir ağrı tək
Sonra sizi yandıracaq,
göynədəcək.
Toydan sonra bu nağara
Kimə gərək,
Nəyə gərək?
İtirdiyin doğmaları,
əzizləri
Qaytara ki, bilməyəcək.

Qəlbinizdə döyünəcək
Özünüzün özünüzə atdığınız
tənə daşı,
Gözünüzdə həsrət tozu...
Ondan sonra
Kimə verə bilərsiniz
Bağrınızda sızıldayan
Qayğı, sevgi borcunuzu?..

*Noyabr, 1973*

## EHTİYAT

*Cəsurların dəliqanlılığına*
*şərəf nəğməsi oxuyuruq.*
***M.Qorki***

Ehtiyat sözündən ehtiyatlıyam,
Ehtiyat – hər yerdə ehtiyac olmur.
Hər sözdən özünü qoruyan ilham
Ayaqda sürünür, başda tac olmur.
Ehtiyat güdəndə yazdım könülsüz,
Eləsi qəlblərə çətin yol tapır.
Ürəklə, cürətlə dediyim hər söz

Hələ qorxaqla da asan dil tapır.
Sənətin, ilhamın, eşqin gur səsi,
Qorxaq ürəklərdən niyə gen düşür?
Ehtiyat güdəndə, sözün gülləsi
Həmişə hədəfdən didərgin düşür.

Ehtiyat güdənlər, asta gedənlər,
Heç sizi görmədim mənzil başında.
Ey fikrin önünə daş gillədənlər,
Əliboş qaldınız siz il başında.

Yolu gedə-gedə addım sayanlar,
Yolunuz yarıda niyə səhv olur?
Ancaq cəsarətlə addımlayanlar
Ya hər şeyi alır, ya da məhv olur.
Ehtiyat – birtəhər baş dolandırmaq,
Cəsarət – ya həyat, ya ölüm ancaq!

Ehtiyat vergüldür, nöqtə deyil, yox!
Ehtiyat çalardır, rəng ola bilməz!
Deyirəm dünyada bir qəhrəmanlıq
Kölə ehtiyatdan doğula bilməz.
Qorxur cəsarətdən qorxu da şəksiz
Onun övladıdır igidlik, hünər.
Axı, cəsarətsiz, axı, ürəksiz
Qapını döyməmiş hələ bir zəfər.

Cəsarət çətindir, ehtiyat asan,
Qorxudur alçaldan, axı, hər kəsi.
Cürətdən qorxmayaq qorxaq qorxudan
Qorxu – itaətin dayaq nöqtəsi!

Dolandım – yüz ölçüb bir biçəndə mən,
Yaşaya bilmədim bircə an, ancaq.
Mən ziyan çəkmədim cəsarətimdən,
Qorxudan qorxuram, qorxudan ancaq!

*May, 1970*

## TƏLƏBƏLƏRİMƏ

Uçun, uçun,
Xəyaldakı zirvələrdən atlanın,
Tələbələrim mənim.
Bu gün mənə güvəndiniz,
Sabah sizə güvənim.
Bu gün önümdəsiniz,
Sabah isə ayaq açıb
gəzən şirin sözlərim...
Vətənimə səpələnmiş
Mənim dan ulduzlarım...
Mən öyrədən,
Siz öyrənən,
Zaman keçir, yer dəyişir
Bu müqəddəs dövrədə...
Bu dünyanı öyrənmişəm
Mən öyrədə-öyrədə...
Mənə heç vaxt yad olmadı
Sevinciniz,
Qəminiz.
Xəyallarla nəfəs alan
Cavanlıq aləminiz.
Hissinizə, duyğunuza
dola-dola,
Sizin ilə addımladım
Qol-qola...
Suyu hər il dəyişilən
Bir dəniz var önümdə.
Suyu axır,
Durulur.
Bir tərəfdən boşalırsa,
Bir tərəfdən o, dolur.
Gənclik axır,
Bu axına qoşuldum.
Yaşım artdı...
Ancaq yenə

Sizinlə həmyaş oldum.
Elə dedim: – Bu dünyaya
Nə baxdım ki, nə görəm.
Beş il açıb örtdüyünüz qapıları
Otuz ildir
Mən açıram,
örtürəm.
Sizin üçün bitən bir şey
Bitə bilmir mənimçün.
Öyrədirəm,
Öyrənirəm,
günbəgün.
Mən həmişə
Sizin ilə həmyaşam.
Hamınıza yoldaşam!

El-obada ayaq açıb
Mənim gəzən sözlərim,
Vətənimə səpələnmiş
Ay mənim ulduzlarım,
Fikrimizdən, sözümüzdən
Aldığınız işığı,
El-obada körpələrin
Ürəyinə səpin siz,
Biçin olmaz səpinsiz.
Bugünkü dərs
Tək bu günün dərsidir.
Tək bu günlə
Siz gəlməyin vəcdə,
yox!..
Sizdən hörmət gözləyirəm,
Səcdə, yox!..
Səcdədə bir hərəkət yox,
Çırpıntı yox,
Alov yox!
O, həm sakit,
Həm donuq!

Sən önümdə donursansa,
Mən də yoxam,
Sən də yox!
Başqa simdə çalmalısan
Mənim köhnə havamı.
Sən mənmisən?
Yox!
Fikrimin,
Əqidəmin
davamı!
Sizin mənə sevginizdə tapmışam
İtirdiyim nə varsa.
Mənim Sizə dediklərim
Ruhunuzda yaşarsa,
Sizin ayaq basdığınız
hər obada mən varam,
Qəlbinizdə çağlaram,
Dilinizdə qaynaram.
Gələcəkdə yaşaram!
Sabir olub,
Puşkin olub,
Vurğun olub
Hər dərsimin ön sözü.
Bəs nə imiş
Məramımın, mətləbimin
Son sözü?
Harda bir ev uçubdursa,
Biz o evə
Dirək olaq,
Daş olaq.
Adicə bir insan deyil,
Bu Vətənə,
Əsl vətəndaş olaq!

*1974*

# O NƏDİR?

"Dünya ulu tanrının yuxusudur" –
– dedilər.
Onu bu xoş yuxudan ayıltmayın, –
dedilər.
Onun oyanmasını
Niyə istəmədilər?
O, nə qədər yatacaq
Dərin, şirin yuxuda?
İntəhasız olarmı,
Vaqiə də, yuxu da?
Milyon-milyon ildi ki,
Fırlanır,
Yer kürəsi...
Nə benzini qurtarır,
Nə odu, nə qüvvəsi,
Hara gedir o belə?
Yerindədir yer elə...
Dönür günün başına
Qüvvət alıb o, gündən.
Nə öz oxundan çıxır,
Nə də öz çevrəsindən...
Fırlanır...
Getmir ancaq
Nə irəli,
Nə geri...
Fırlanıb sapa düzür
O, ayları, illəri.
Yerin gözü yoxdumu?
Onun da
İnsan kimi
Var olsaydı gözləri,
Tərpənərdi yerindən,
Çıxardı mehvərindən.
Tanrının da yuxusu
Dağılardı o zaman.

Təzə,
Başqa bir yuxu
Uydurardı yuxudan.
Yer qopmadı yerindən.
İnsan qopdu...
Qanadı
Aldı əməllərindən...
Möcüzələr yaratdı,
Kainata ip atdı,
Uçub Aya da çatdı.
İnsan çıxa da bildi
Yerin cazibəsindən...
İnsanın:
“Mən tanrıyam,
Mən qadirəm” –
Səsindən
Tanrı diksindi, durdu.
Boylandı dövrəsinə...
Gördü:
İnsanın özü
Dönüb Yer kürəsinə.
Ancaq...
O, kürə kimi
Fırlanmır öz yerində.
O yeriyir, o uçur
Ağlın üfüqlərində...
Yer kürəsi
Tanrının
Uydurduğu yuxudur,
Nağıldır,
Əfsanədir...
Bəs boylanıb yuxudan
çıxan insan?..
O nədir?

*1974*

## DÜŞÜNCƏ – SÖZ

Özümə də görünməyən
Könlüm mənim,
Duyğum mənim,
Sövdam mənim –
Azadlığım – öz mənəvi dünyam mənim.
Öz içimdə, öz dünyamda
Hakim də mən,
Məhkum da mən.
Neçə yerə qol atıram
Bir özəkdə, bir tumda mən...
O coşqundur,
O daşqındır.
Min rənglidir,
Sürəklidir.
Söz – fikrimin, düşüncəmin
Qəlibidır,
Öz şəklidir.
Düşüncələr – havadakı quşa bənzər.
Sözlər – quşa atdığımız daşa bənzər.
Dəyə bilsə səninkidir,
Dəymədisə –
Daşdan küsmə,
Özündən küs.
O incidən əlini üz.
Ürəkdədir o qönçələr...
Hansı gözə görünübdür
düşüncələr?

*1975*

## MƏNİM XALAM

*Mina xalama*

Anam öldüsə də, öz taleyimdən
Küsmədim,
yerində xalam var mənim.

Ona güvənirəm,
Sanıram ki, mən
Arxamda alınmaz qalam var mənim.

Elə ki, darıxdım,
Minib maşina
Gedirəm Ağdaşa, düz xalamgilə.
Yaxşı deyirlər ki, hamı bir yana,
Ananın ətiri xaladan gələr.
Bu necə ətirdi, bu necə ətir,
Ruhum sakit olur, ürəyim aram.
O ətri duydumsa əriyir illər,
İlkimə qayıdıb uşaq oluram.
Bu necə ətirdi, oyanır mənim
Könlümdə ən şirin, ən dadlı çağlar?
Niyə göz önümdə dayanır mənim
Qalanan təndirlər, yanan ocaqlar?

Bu necə ətirdi,
İlkin duyğular,
Köhnə binəsinə qayıdır yenə?
Bu necə ətirdi, onda nə sirr var,
Məni məndən alıb qaytarır mənə.

Bu necə ətirdi, bu necə ətir, –
Məni göyüm-göyüm niyə göynədir?
Bu nə göynərtidir? Deyə bilmirəm,
Niyə göynəyirəm, niyə, bilmirəm?
Niyə bu göynərti, niyə bu ağrı,
Alır öz əlimdən ixtiyarımı?
Bu sızı, hamıya əziz olduğum
Qayğısız günlərin intizarımı?

Tutmaq istəyirəm baxışlarını
Min mətləb gizlənir hər qayğısında.
Ötən günlərimin naxışlarını
Görürəm xalamın kəlağayısında.

–Ay oğul, saçını nə tez ağartdın?
Deyə, əllərini çəkir başıma.
Deyirəm: – Tez niyə, əlliyə çatdım.
Yox! İnana bilmir xalam yaşıma.

Anamın diliylə o, məni oxşar,
Nəsihət eləyər hər görüşündə.
Mənim özüm boyda uşaqlarım var,
Xalam “uşaq” – deyir mənə bu gün də.
Yox! Heç nə yayınmaz onun gözündən,
Dərdimi üzümdən oxuyur mənim.
Xalama güvənib sanıram ki, mən,
Arxamda alınmaz qalam var mənim.
O necə qaladır? Uludan ulu.
Hansı bir qüvvəti özündə gizlər?
Qayğıyla, sevgiylə doludur, dolu
O titrək dodaqlar, o yaşlı gözlər.

O necə qaladır? Zəif bir vücud!
Üfürsən yıxılar,
Gücsüz bir qarı.
Qoluma güc gəlir, könlümə ümid
Çiynimə qonanda zəif qolları.

O elə qala ki, baş əyməz yada,
Könül çiçək açır hərarətindən.
Dünya şər qüvvəyə dönüb axsa da,
Onun qucağında amandayam mən.

Köksünə baş qoydum, dedi: – qadası!
Sandım ki, çiynimdən yük endirmişəm.
Xalamın sinəsi – sevgi qalası
Mən bu istiliyi harda görmüşəm?

Xalam uşaqları, sizə sözüm var
İndidən yanmayan sonra bərk yanar.
Düzünü deyim ki, anam sağ ikən,
Qədrini o qədər bilməmişəm mən.

Ayıltmaq istərəm indidən sizi
Yaman nigaranam xalamdan yana,
İndidən yandırın ürəyinizi
Qoymayın od tutub sonradan yana.

Siz də olarsınız ikiqat yetim
Yaxşı başa düşün, yaxşı, siz məni.
Anasız qaldığım bəsimdir mənim,
Amandır, qoymayın xalasız məni.

*1976*

## İYİRMİ BEŞ İL

*Ömür yoldaşıma*

Elə bil dünəndir Sabir bağında
Çıxdın qabağıma ağ çiçək kimi.
Elə bil dünəndir, ağ paltarında
Qondun evimizə kəpənək kimi.

Nə tez başa gəldi iyirmi beş il?
Balalar yetişir, qocalırıq biz.
Nələri itirdik – qayıdan deyil,
Görəsən, nə imiş bəs qazancımız?

Sönməmiş könlümün odu, həvəsi,
Balalar səslənir: “Bəsindir dayan!”
Oğlumuz toy umur, bizim toy səsi
Hələ getməmişkən qulağımızdan.

Bu necə dünyadır? Yolu bir qarış,
Ayıra bilmirsən çoxunu azdan...
Həzzindən, zövqündən hələ doymamış
Çəkirlər süfrəni qabağımızdan.

Bu necə dünyadır anlamıram mən,
Nə gəliş bəllidir, nə gediş bizə.
Xəbərimiz olmur gəlişimizdən,
İnana bilmirik getməyimizə.

Vurduq bir zindana iyirmi beş il,
Ötdü günlərimiz ağlı-qaralı.
Sənin duyğuların – bir nəğməli göl,
Mənim duyğularım min macəralı...

Sən nə dalğalandın, nə çalxalandın,
Haldan-hala düşdüm mən hər dəm, gülüm,
Sən məni bir dəfə sevib dayandın,
Mən səni hər rəngdə sevirəm, gülüm.

Daş atdım,
                    Əlimdən çıxdı bir xata.
Bulana-bulana yenə duruldun.
Könlümdən keçəni duymadınsa da,
Ömrümə, günümə havadar oldun.

Düşdü yuvamıza, düşdü qan-qada,
Başımız üstündə ildırım çaxdı.
Səsimiz, nəğməmiz bir olmasa da,
Suyumuz, selimiz bir arxdan axdı.
Ata ocağının qələmdən çıxan
Çörəyi mənəmsə, ürəyi sənsən.
Başında çal-çarpaz ildırım çaxan
İsti yuvamızın dirəyi sənsən.

Mənim xəyallarım uçdu havada
Sən məni göylərdən endirən oldun.
Bizim qurduğumuz isti yuvada
Fəhlə mən oldumsa, usta sən oldun.

Elə ki, bəxtimin gözü yumuldu,
Yoluma nur saçan çilçıraq oldun.

Mənim nəşələrim özümün oldu,
Ancaq dərdlərimə sən ortaq oldun.

Başıma dolanan dərd-sərimin
Odunu qəlbindən keçirən oldun.
Səndən gileylənən şeirlərimin,
Sahibi mən oldum, qulu sən oldun.

Yanıb yaxılanda şeirim üçün mən,
Sən elə bildin ki, gizli qəmim var.
Ayrıla bilmədin öz aləmindən
Bilmədin, mənim də öz aləmim var.

Gülüm, aynasıdır üzüm, üzünün,
Məni əldən saldı axtarışlarım.
Üzünə əks etdi mənim günbəgün,
Üzümdə açılan sərt qırışlarım.

Fikrim dərə keçdi, təpələr aşdı,
Ardımca bir addım gəlmədin ancaq.
Sən məni dindirdin,
                                    Dilim danışdı,
Şerimi dindirə bilmədin ancaq.
Ötdüyün mahnını bir yol çaşmadın
Mən çaşdım...
                        Dərədən boylandım dağa.
Öz könül mahnını sən çalışmadın,
Mənim iniltimə uyuşdurmağa...

Elə bil dünəndir, Sabir bağında
Çıxdın qabağıma ağ çiçək kimi.
Elə bil dünəndir, ağ paltarında
Qondun evimizə kəpənək kimi.

Aradan nə keçdi? İyirmi beş ildə
Qara saçımızda ağardı illər!
Təkcə istəyimiz qaldı könüldə,
Qalan nə vardısa, apardı illər.

İndi xəyal yorğun, könül şikəstə...
Gəncliyi dadmamış qocalırıq biz.
Övlad qayğısında, bir murad üstdə
Birləşir uyuşmaz nəğmələrimiz.

Eyni yük altında neçə yoxuşu,
Arzumuz, qəsdimiz birgə aşıbdır.
Özgə budaqların iki yad quşu
İndi bir budaqda doğmalaşıbdır.
Budağın eşqinə darda, çətində
Nəfəsin könlümə qol-qanad vermiş.
Zaman ötüşdükcə
                Məhəbbətin də
İlk rəngi, ilk dadı dəyişilərmiş.

Demə qocalmısan, gülüm, doğrusu
Mənimçün bir az da sonalaşmısan.
Balamın anası, nə sirrdir bu?
İndi mənimçün də analaşmısan.

*Dekabr, 1974*

## MƏN KİÇİK BİR ÜRƏYƏM

Yenə Şəkiyə gəldim bir az dincəlim deyə,
                        Özümə gəlim deyə.
Ancaq... bir gün, bir saat dincələ bilmədim mən
Ürəyimin səsindən...
O səs... O səs izlədi hara getdimsə məni,
Gülərüzlü görmədi burda bir kimsə məni.
O səs qulaqlarımda bir top kimi gurladı,
Fərəhimi həbs edib, nəşəmi oğurladı.
Pozdu rahatlığımı,
                dincliyimi,
                        yuxumu...
Dedim: Dincəlmək bumu?

Dedim: – Ürək, ay ürək,
Bircə ay məndən əl çək.
Axı, mən də insanam,
Mənə nəsib deyilmi bəs həyatın nəşəsi?
Qəlbin dərinliyində duydum yenə o səsi:
-Dünyada yaşamayan dünyadan dinclik umar,
Yanmağında tapmalı dincliyini sənətkar.
Dedim: – Bəs bu nədəndir
Çoxaldıqca yaşım da
Azalmadı arzular,
Aşıb-daşdı arzular,
Başdan aşdı arzular.
Bahar oldu, qış oldu –
itirdiyim ömür, gün,
Qazandığım yaş oldu.
İndi nə istəyirsən?
Dedi: – Demə heç zaman "istəyin nədir?" mənə,
Dünən zirvə bildiyim, bu gün pillədir mənə.
İstəyim birmi, onmu?
Köhnəsinə çatmamış təzə arzular gəlir,
Köhnə arzularımın saçlarına dən düşür.
Dünənimin istəyi bu gün gözümdən düşür.
Bir çuxurda lillənən,
Bircə çırtma daşından
Üzü səpən, güllənən
Göl olmaq istəmirəm.
Əvvəlini dağların zirvəsindən götürən,
Dağlarda qah-qah çəkib, dərələrdə hönkürən,
Saçı dağda, təpədə köpük-köpük ağarıb
düzənlərdə qaralan,
Əvvəli müdrik qoca, sonrası cavan olan
Sel olmaq istəyirəm.
Qışdan bahara gələn yol olmaq istəyirəm...
Əməllərimin adı mənim adım olaydı.
Əbədi yol gedəydim
Gecə-gündüz,
Günəş, Ay

Sağım-solum olaydı.
Ulduz kəhkəşanları mənim yolum olaydı.
Mən il, ay bilməyəydim,
Vaxtın çərçivəsindən çıxaydı ömrüm-günüm.
Əbədiyyət ən kiçik ölçüm olaydı mənim...
Mən sahili olmayan dənizlər istəyirəm.
Axşamları olmayan gündüzlər istəyirəm.
Xəyallar aləminə məni daim səsləyən
Cilvələr istəyirəm.
Zirvənin özündə də zirvələr istəyirəm.
Mən kiçik bir ürəyəm,
Bu dünyanın, həyatın
bəzəyiyəm,
süsüyəm,
Mən kiçik bir ürəyəm,
sonsuzluq ölçüsüyəm.

*1965-1974*

## ÖRTMƏ PƏNCƏRƏNİ...

Örtmə pəncərəni!..
Necə? Sətəlcəm?
Qorxmuram, qoy külək içəri dolsun.
Açıq qəlbim kimi qapım, pəncərəm
Dünyanın üzünə qoy açıq olsun.

Örtmə pəncərəni... Gəlir ilk bahar,
Gör, çölün havası necə təmizdir.
Açıq pəncərələr, açıq qapılar
Dünyaya açılan gözlərimizdir.

Təzə bir havaya həsrət qalıb söz,
Söz də təzələnmək istəyir, dayan!
Dolsun otağıma, gəlsin iznsiz
Yellər pəncərəmi taqqıldatmadan.

Tufan istəyirəm, yandıra bilsin
Könlümün qaralan ocaqlarını.
Gəlsin, qarışdırsın, alt-üst eyləsin
Yazdığım, pozduğum varaqlarımı.

Masa arxasında gecəbəgündüz
Bir ömür əritdim təzə söz üçün.
Gəlsin təzə fikir, gəlsin təzə söz
Dünən yazdıqlarım köhnəlir bu gün.

İstərəm sabahı bu gündən bilim,
Könlümə nur qonsun, işıq çilənsin
Örtmə pəncərəni, örtmə, sevgilim,
Hava təzələnsin, söz təzələnsin.

*İyul, 1978, Şəki*

## QIZIM GÜLZARA

Gəlirsən, gedirsən...
Gözüm üzündə,
Bilmirsən nə sorur, nə deyir atan.
Üzündən, gözündən,
hər bir sözündən
Qəlbini oxumaq istəyir atan.
Gəlirsən, gedirsən... heç nə sormuram
Baxışlar danışır, baxışlar ancaq.
Bilmək istəyirəm, a mənim balam,
Səni isidirmi qonduğun budaq?

Qınama, bələdəm mən bu həyata,
Kim çərxi geriyə döndərə bilmiş?
Övlada qızıldan taxt verər ata,
Qızıldan bəxtini kim verə bilmiş?
Gəlirsən, gedirsən. Dəyişmiş bizim
Sözümüz, sorğumuz...

Bu sən,
bu da mən.
Elə gəlirsən ki, elə bil qızım,
Bu evdə doğulub böyüməmisən.
Bir az yad olmusan,
Bir az utancaq
Əvvəlki ərkini istərəm yenə.
Gələndə qonaqsan, gedəndə qonaq,
Nə tez özgələşdi bu ocaq sənə?
Sənin xislətin də necə dəyişdi,
Demə gileyliyəm, yox, yox, şadam mən.
Sev ki, seviləsən...
Bizimki keçdi,
İndi sənin üçün narahatam mən.

Qoru hər ləkədən məhəbbətini,
Hər yerdə,
həmişə,
hər zaman, qızım.
Arxan – atan evi...
Səadətini
Yalnız ər evində tapasan, qızım.

*May, 1978*

## FİKİR AXTARIŞI

-İsa!
-Musa!
-Tapdın?
-Yox!
İsaq – Musaq quşları
Nəyi isə axtarır
Sübhə qədər
Gecələr.

Gecələrin özündən sirr gizlədər gecələr.
Ömrü boyu axtarır İsaq – Musaq quşları.
Bahar gecələrini
Suallara döndərir
Gizli axtarışları.
Axtarır,
Tapa bilmir,
hey axtarır,
hey gəzir.
Əbədi axtarışdan
Nə yorulur,
Nə bezir.
Toyuq da dən içində
Eşələnir,
axtarır.
Dən topası üstünə qalxır,
enir,
axtarır.
Tapır, yeyir,
o yenə
yeyə-yeyə axtarır.
Axtardığı, gəzdiyi gözlərinin önündə,
Bəs o nəyi axtarır, bəs o niyə axtarır?
Tapır,
yenə axtarır.
Mədəsinə deyil, yox,
Fitrətinə axtarır.

Dolaylarda əridib
dəmir çarıqlarını,
Aşıb sirr dağlarını,
Nəyi isə axtarıb ulu babalarımız,
Ürəyi acılarla dolu babalarımız.
Mən də axtarışdayam,
Obaları, elləri dolanıb qarış-qarış.
Bəlkə mayamızdadır bu əbədi axtarış!

Adamların gözündə həsrət işım-işımdır.
Mənim sonsuz həsrətim – mənim axtarışımdır.
Axtarıram,
Özümdən o yanı görüm deyə.
Zərrədə qərar tutan dünyanı görüm deyə.
Gecənin zülmətində sübhə iz axtarmışam.
Min bir sözün içində
hələ heç deyilməmiş
bircə söz axtarmışam.
Sabahımın eşqinə bu günümü danmışam.
Kiminsə gözlərindən qəlbinə boylanmışam,
O qəlbdə məşəl tutan duyğunu görmək üçün.
Başqasının xeyirxah, gözəl əməllərindən
ibrət götürmək üçün
Özümdə olmayanı özgədə axtarmışam.
Fikirlərin tərkinə, arzuların ilkinə,
Əməllərin rüknünə, özəyinə varmışam.
Bəzəklərdən vaz keçib axtarmışam özəyi.
Mən axtara-axtara itirmişəm çox şeyi.

Dünya – axtarış evi...
Kimi sərvət axtarır,
Kimi fikir axtarır.
Kimi də ürəklərin axtarış həvəsində
Sirr görür, sirr axtarır.
Sərvət, fikir!
Fərqə bax!
Sərvət – fikir deyilsə,
fikir – sərvətdir ancaq.
Bir fikir, bir söz yatır
yerin hər qarışında.
Bizə uğurlar olsun fikir axtarışında!

*Fevral, 1978*

# QARABAĞ ATI

*1956-cı ildə İngiltərə kraliçasına Qarabağ atı – "Zaman" hədiyyə göndərilmişdi.*

Cıdır düzü...
Sinəsində at oynaqlar,
Cıdır düzü –
İgidliyin arayışı –
Üstündə də nal ləpiri möhür bağlar.
Qarabağın cins atları –
                    hünərimin kişnərtisi,
Toppuzların gurultusu,
Qılıncların parıltısı,
                        Neştər səsi!
Qarabağın kürən atı –
Döyüşlərdə arxasıdır
                        Koroğlunun,
                            Bayandurun.
Cilovunu gəmirdimi,
                hünəriniz varsa əgər o qızmamış,
Qamçıların hədəsinə dayandırın!
Kişnədimi o uçacaq.
                    Kişnərtisi – qanadları!
Qamçı vurma!
            Qamçı yola gətirərmi cins atları?
Zaman keçdi,
Zəmanəmdə "Qırat", "Dürat", "Zaman" oldu
İgidliyi kitablara köçürüldü.
Yaddaşlarda unuduldu.
"Zaman" atım, aman atım!
Keçmişimdən bu günümə amanatım!
Avtomobil zamanında
Niyə, axı, sənin adın "Zaman" oldu?
Geriyəmi döndü zaman,
Məgər raket-kaman oldu?

"Qırat", "Dürat"
İndi nədir?
Ekzotika, eksponat!
Dövrümüzdə nə deməkdir
Kral, ya da kraliça?
Öz əvvəlki hökmündəmi
bu gün yenə
Britaniyada kraliça?
Kraliça Yelizaveta
Yelləndikcə
Arasında göyün, yerin,
Nəfəs alır havasıyla
Ötüb keçən təmtəraqlı əsrlərin.
O bəyənmir
Asfalt üstə quş tək süzən maşınları,
Göydə gəzən maşınları.
İstəyir ki,
Əsrin dəli sürətini unuda o,
Keçən əsrin duyğulara sığal çəkən
Ahənginə dəm tuta o.
Karetada seyrə çıxır,
At saxlayır.
O, dünənin ölüsünü
kəfənləmək əvəzinə
Sabahının körpəsi tək qundaqlayır.
Öz kökünə qayıtmaqla
güman edir
Öz əsrini qabaqlayır.
Ekzotika vurğunudur
Kraliça Yelizaveta.
Səyahətə çıxan zaman
qamçı vurmaz o hər ata!
Meyl salıb Qarabağdan
Töhfə kimi gətirilən
Kəhər ata!
"Zaman" yatmır ipə, sapa,
Dirək olub kişnərtisi yerə, göyə.

Nə qamçıya boyun əyir, nə hədəyə.
O gəmirir cilovunu,
Kraliça seyr eləyir gendən onu,
Ayaqları eşir yeri,
Yaxın qoymur həndəvərə mehtərləri.
Nə etməli?
Gəlir bir-bir
Cıdırlarda ad qazanan,
                Rekord vuran minicilər.
Nə faydası,
                O ram olmur.
Kraliça aram olmur,
Qəzəblənir:
-Britaniyada yoxmu məgər
                                bircə kişi, –
Ram eyləyə bu qızmışı?
Kraliça yana-yana
                baxır ona –
Ceyran kimi duruşuna,
Hirslə yeri eşməsinə,
Heyran qalır
Kişnəyəndə gur səsinə.
At duyur ki,
Gözəlliyi heyran qoyub
Maddım-maddım baxanları,
Neçə-neçə yarışlardan
Qələbəylə çıxanları.
Belə heyran baxışlardan
                        O iyrənir,
İstəyir ki,
                belindəki
Onun ceyran hüsnünə yox,
                Qaçışına,
Yürüşünə heyran qala.
                İstəyir ki,
                ayağının altındakı
Böyüdüyü torpaq olsun –

İstəyir ki,
belindəki
Yarışlarda nəmər alan jokey deyil,
Vuruşlarda zəfər çalan
igid olsun!
İstəyir ki,
yüyənini gəmirəndə
Cilovunu çəkib yığan
igid olsun.
İstəyir ki,
sahibi də
Atılmaya beldən-belə.
Kişnəyəndə
sahibi də
Kişnərtiyə cavab verə
Koroğlunun nərəsilə.
O, belində kraliça qəbzəsi yox,
Vuruş istər, hünər istər.
O, belində
aynalılı Həcər istər.

Günlər keçdi, aylar ötdü,
Qarabağın köhləninə
Qışda kişmiş,
Yazda yaşıl ot verdilər.
Səhər-səhər
Çəmənlərdə gəzdirdilər,
O yemədi, o içmədi.
Qızıl yüyən laqqıldadı çənəsində,
Dolandıqca yad torpağın sinəsində
Arıqladı o günbəgün.
Xiffətini çəkirdi at
Şahbulağın,
Cıdır düzün.
Ürəyində
Sarı dağdan enən daşın
səsi dindi,

Gözlərində Daşaltının ağ suları giləlvalndi.
O dözmədi,
yox, dözmədi,
Bu xiffətdə çox hikmət var.
Yad iqlimə dözə bilməz
Öz-özünü tanıyanlar!

*Avqust, 1976, Şəki.*

## KÜLƏK – OT

*“Hökmdar küləyə, xalq ota bənzər. Külək hardan əssə, ot başını o tərəfə əyər”.*

***Konfusi***

“Hakim – dəli bir küləyə,
Xalqsa – onun qabağında
Tir-tir əsən ota bənzər.
Hansı yandan külək əssə,
O tərəfə ot baş əyər”.
Konfusinin bu ehkamı
Əsrlərlə oldu bütün hakimlərin
ilk hakimi.
Dolandırdı öz başına
məmləkəti məhvər kimi.
Kəlama bax!
Yüz-yüz illər
Bir ölkənin bayrağında
dalğalandı,
Külək əsdi səmum kimi,
Ağızlara daş tıxandı,
Beyinlərdə fikir dondu.
Ürək yandı.
Kəlam dönüb
Hakimlərin əllərində
məşəl oldu.

Ağızlarda məsəl oldu.
Gözəl, çirkin damğasıyla
damğalandı,
Çirkin dönüb gözəl oldu.
Yerin bağrı cadar-cadar,
Axmazlarda donub qaldı,
süzülmədi həqiqətin bir damcısı.
Yalan – dövlət maşınının sükançısı!
Kəlama bax!
Ehkama bax!
Haqsızlığı
Yüz-yüz illər sığışmadı
Yerə, göyə.
Nə deyəsən
Bu sözdəki dırnaq içi
“böyüklüyə”,
“müdrikliyə”?
Külək əsdi
Gah imandan, gah gümandan,
Gah o yandan, gah bu yandan
Otlar əydi başlarını
Öz içindən yana-yana.
Gah o yana, gah bu yana
Külək əsdi...
Ot əyildi...
Külək əsdi,
elə bildi,
Qüdrətinə bir səcdədir bu əyilmə.
Zalım külək,
Zülmə olan əyilməni səcdə bilmə!
Qorxudandır
Bu titrəmə,
bu əyilmə!
Özgəsini qorxu ilə qorxudanın
özü qorxur.
İnanmırsan?
Aç qəlbini sən ondan sor!

Bu qorxunun qabağında
Sən özün də
Qorxuzduğun ot kimisən.
Sən qorxuyla qorunmazdın
Bu qorxunun dəhşətini
Bilməsəydin ot kimi sən.
Ancaq bunu bilməlisən.
Məhəbbətə hörmət olar,
Qorxuyasa nifrət olar.
Nifrət sızar damcı-damcı
Nəhayətdə dağ dağılar,
Daş – oyular.
Zalım külək,
Unutma ki, geci-tezi suya dönür
Nərildəyən,
Guruldayan
Şimşək olub çaxan bulud.
Əgər sağdan əsirsənsə,
Sağa deyil,
Sol tərəfə əyilir ot,
Bu tərəfə əyilmənin sirri nədir?
Bu, hörmətə əyilmə yox,
Bu, yalana dal çevirmə,
Həqiqətə əyilmədir!

*1976*

## SATQINLIQ

Səhl-Sumbat Xalq qəhrəmanı
Babəki düşmən əlinə verən.
Sata bildin
nəyi nəyə, kimi kimə?
Tək olsaydın,
heç adını tutmaz idim,
Mikrob kimi

əlɘnmisən tariximə.
Babəklərin sinəsilə yol açdığı
Zirvələrə çatmaq üçün,
Dərə keçdik,
Təpə aşdıq.
Bu yollarda
Neçə-neçə həmzələrlə,
Sumbatlarla qarşılaşdıq.
Satqınların hiyləsindən
Neçə kərə
Tarix endi zirvələrdən dərələrə.
Bu hiyləgər xəyanətlər
Tariximin neçə-neçə varağını
ləkələdi,
qaraladı.
Bir ölkəni yaraladı,
Neçə yerə paraladı.
Mənə açıq düşmən deyən bir düşmənin
İçi də bir, çölü də bir.
İçindəki nifrətini
Üzündə də o, gizlətmir.
Niyə qorxum bu düşməndən?
Bu meydanda ya o, ya mən!
O düşməndən qorxuram ki,
İçindəki zülmətini,
Qəzəbini, nifrətini
Üzündəki gülüş ilə
örtə bilə!
Səhl-Sumbat!
Yollarıma diyirlədin
Xəyanətin ilk daşını.
Üzündəki gülüş ilə
Sən axıtdın
Bir ölkənin göz yaşını.
Bu gülüşlə
Xəyanətin zəhərinə
bal qatmısan

Bu gülüşlə
anamızı ağlatmısan.

Sən həmişə yanımızca hərlənirsən,
Sağımızda Səhl-Sumbat,
Solumuzda Səhl-Sumbat.
Can atırıq zirvələrə –
Yolumuzda Səhl-Sumbat.
O Sumbatdan törəyənin
Soyu-Sumbat.
Huyu-Sumbat.
Dili-mənim,
Əli-qənim.
Qazır mənə quyu Sumbat!
Gah quzeydən, gah güneydən
Baş qaldıran yel kimisən.
Namərdliyin yol yoldaşı,
Kişiliyin qənimisən.
Yüz qızıla, bir "sağ ol"a
Sata bildin kişiləri,
Özün söylə,
Aldıqların satdığına
dəyərdimi?
Aldığına
arzuların göyərdimi?
Qızıl getdi, "sağ ol" itdi,
Özün öldün.
Xəyanətin
Tariximin kürəyində
Damğa kimi durur ancaq.
Gücünə bax,
Əsrimizə çatdı səsi.
Satılanın böyüklüyü,
Satqınlığın dərəcəsi!
Düşdü gələn əsrlərə
Xəyanətin boz kölgəsi.
Neçə-neçə Səhl-Sumbat

baş qaldırdı o kölgədən,
Səsi gəldi o ölkədən, bu ölkədən.
Səhl-Sumbat,
Dünən maskan gülüş idi,
Bu gün nədir?
Gəliri də, çıxarı da,
Mayası da,
Maskası da
bilməcədir,
bilməcədir!
Səni çox da qınamıram
Satqınlığı vaxtın özü
hünər saydı.
Məgər satan olardımı
Əgər alan olmasaydı?!

*Avqust, 1979*

## BƏLİ ƏSƏBİYƏM

Mənə "əsəbisən" deyən – düz deyir.
Mənim nöqsanımı demək istəyir.
Söz atdın...
Könlümdə qopdu zəlzələ,
Bilmədim, nə zaman çıxdım özümdən.
Toxundun könlümə
üstəlik hələ
Deyirsən, lal olum, qışqırmayım mən?
Dəmir dəmirdi ki, toxunsan əgər
O da cingildəyər, o da səslənər.

Mən ki istəmərəm bir ürək sına,
Əsəbiyəm,
çünki həyəcanım var.
Hardasa bir haqqın tapdanmasına
Mən dözə bilmərəm, isti qanım var.

Mənə biganədir soyuqqanlılıq,
Hər şeyə öz ölçüm, öz tərəzim var.
Sənin qərəzinin mənə dəxli yox,
Mənim öz görüşüm, öz qərəzim var.
De, necə od tutub alışmayım mən –
Fikirsiz, məsləksiz ölü canlara?
Bəli, əsəbiyəm,
                        heç çəkinmədən
Mənim əqidəmə toxunanlara.

Dünyaya gəlmişəm, qanam.
Anladım,
              ürəyim od tutub yanar.
Bəli, əsəbiyəm, çünki insanam,
Mənim nifrətim var, məhəbbətim var.
Quzuya da bəli,
Qurda da bəli?
Deyirsən, olmasın baxışım mənim?
Nöqsanım budursa əgər...
                                      deməli,
Ancaq naxışımdır yanlışım mənim.

*İyul, 1979*

## NARAHAT OLANDA...

Zamanın dolanbac pillələrindən
Keçmək istəyirəm, keçə bilmirəm.
Narahat çırpınan dünyamızda mən,
Necə rahat olum, necə, bilmirəm?

Dinclik, rahatlıqdır mənim düşmənim.
Buludlar üstünə, ey könlüm, şığı!
Alır dincliyimi əlimdən mənim
Könül sakitliyi, can rahatlığı!

Rahatsa nə yanır, nə qanır ürək
Necə başa vurum bilmirəm, günü...
Elə bil, sinəmdə dayanır ürək,
Axı, eşitmirəm döyüntüsünü.

Narahat olanda çıxıb özündən
Qəlbim qulağımda top kimi gurlar.
Onda bilirəm ki, yaşayıram mən,
Onda bilirəm ki, ürəyim də var.

Tufansız ürəklər durğun göl kimi,
Suyu təzələnməz,
Dibi lillənər.
Narahat ürəklər daşqın sel kimi,
Hər daşın üstündə bir cür dillənər.
İçindən oyulub qəlbim döyünsün,
Yarışa çağırsın daşqın selləri.
Təzə bir mahnıyla sel kimi hər gün
Oyatmaq istərəm yatmış çölləri.

Dibi görünməyən ümman göstərin
Baş vurum,
Kəşf edim dərinliyini.
Mənə əzab verin, iztirab verin,
Dadım səadətin şirinliyini!

*İyul, 1979, Şəki*

## YAMAN SIXIR GECƏ MƏNİ...

İllər qədər uzun çəkdi
Bu intizar gecəm mənim.
Ümidimin gözlərini
Şübhələrlə sürmələdi bu qəm mənim.
Bu gecənin bir ömrünə
həsrətimdən

Neçə-neçə ömür qatdım.
Bir diləkdən min diləyə körpü atdım.
Ax bu gecə sübhə qədər
Nələr, nələr –
Ola bilər?
Bir diləyim günəş kimi
Pəncərəmdə gülə bilər.
İtkin düşən tək qardaşım gələ bilər.
Qəfil bomba bir şəhəri
Yer üzündən silə bilər.
O bombanın bir neçəsi atılarsa,
Yer kürəsi başdan-başa ölə bilər.
Hər şey, hər şey ola bilər,
Mıxı mismar eləyən var.
Geyinmişəm mən gecəni,
Yaman sıxır gecə məni.
Darıxıram...
Hara qovum
bu həsrəti, kədəri mən?
İntizarın bir günündə qocalmışam
İki göz də borc almışam
Gözləyirəm səhəri mən.

Mənim üçün
Səhər yolda qala bilər.
Bu andaca gələ bilər,
Doğulmamış ölə bilər.
Hər şey, hər şey ola bilər.
Mıxı mismar eləyən var.
Hardan gəlib hara getdim,
Heç bilmədim bu nə yoldu.
Bir gecənin intizarı
Bir ömürdən uzun oldu.
Bu intizar, bu həsrətmiş
Bəlkə, mənim –
Öz taleyim,
Öz qədərim.

“Açıl” – dedim, açılmadı al səhərim.
Ümid güldü pəncərədə
Gün yerinə,
Dan yerinə.
Ürəyimdən işıq düşdü
Ümidimin gözlərinə.
Dedim: – Vaxtın axarında
Gecə, gündüz silsilədi.
Bu gecələr
Lap nə qədər
Uzun olsa
Səhərlərə hamilədi.
Mıxı mismar eləyən var...

*Oktyabr, 1979*

## EKRAN QARALANDA...

– Qurtardı bugünkü verilişlərimiz
Dinləyin sabahın proqramını.
...Hələ ki, bu günüm bitməyib...
Nə tez
Sabaha keçirsən?
İnsafın hanı?

Sabaha caladın nə tez bu günü?
Ölməmiş sən ona kəfən biçirsən.
Tamam yaşamamış günün ömrünü
İndidən sabaha niyə keçirsən?

Yatmaq istəmirəm... Keçmə sabaha!
Gecənin ömrünü uzadaq bu cür.
Gənclik müftə imiş, qocalıq baha,
Fələkdən gün çalaq, ömürdən ömür.

Yatmaq istəmirəm... bitməyən günün
Başına dolanım, qoy dönüm hələ.
Səninçün bitibsə, amma mənimçün
Bitməyib, yaşayır bu günüm hələ.

Ekran qaralanda qurtarır günüm,
Uşaqlar yatmağa gedir birbəbir.
Ekrandan çəkilmə, başına dönüm,
Təklikdən canıma üşütmə gəlir.

Zamanı borc alaq biz gecələrdən
Duyub yaşamamaq zülüm deyilmi?
Yatmaq?
Nə görmüsən bu yatmaqda sən?
Yatmaq da bir cürə ölüm deyilmi?

Söykənsin söz sözə, baxsın göz gözə
Gecəni uzadaq, vaxt unudulsun.
Qarışsın dağ düzə, gecə gündüzə,
Müddətli ömrümüz müddətsiz olsun.
Yatmaq istəmirəm... hər anım əziz...
Gecədən kamımca doymadım hələ.
Hər gecə yatanda dəfn edirik biz
Ömrün bir gününü öz əlimizlə.

Ekran qaraldımı – könül diksindi
Gecəni bəs necə başa vurum mən?
Səsinə səs gəzən qəlbimə indi
Təkliyi nə ilə unutdurum mən?

Ekran qaralanda, ey yalqız ürək,
Özümə yeganə dost saydım səni.
Ekran qaralanda –
Sən ey mənim tək
Yatmaq istəməyən, tapaydım səni.

*Yanvar, 1979*

## QEYRƏTMİ, AĞILMI?

Hanı dəlilərin, a nənəm Nigar,
Namərdlər doğuldu bu zəmanədə.
Dədəsi kor olan qoç koroğlular
Özləri kor oldu bu zəmanədə.
Alı dədəmizin gözü kor oldu,
Çağdaş gədələrin özü kor oldu.

Törədi Koroğlu dəlilərindən
Savadlı, bilikli "ağıllılar" hey.
Bu ağıl hünərə deyil, bəs nədən
Kölə ehtiyata səcdə qılar hey?

Vaxtın havasına baş əyən ağıl
Hava bürosudur, o, ağıl deyil.
Sabahı bu gündən bəlləyən ağıl
Bilikdir, arzuya, eşqə yol deyil.
Onlara özgəsi hamıdan yaxın,
Onların özləri özünə özgə.
Bəli, hər şeyi var "ağıllıların",
Mərdlikdən savayı, qeyrətdən özgə.

Elə hey deyirsən: – "Fərasətimiz
Çatışmır, ağıllı olmalıyıq biz".
Sən ağıl deyəndə nəyi deyirsən?
Məni əyən ağlı istəmirəm mən.

Həmişə danışdıq yerli-yataqlı,
Niyə azalmadı bir dərya dərdim?
Bizi ehtiyata çağıran ağlı
Bir çimdik qeyrətə dəyişdirərdim.

Qeyrət azadlıqdır, bu amal üçün
Qeyrət addımlayır Yer kürəsini.
Qeyrətdir dəyişib yaradan bu gün,
Dünyanın siyasi xəritəsini.

Qoy ağıl, qeyrətin getsin dalınca,
Qoy yedək olmasın ağıla qeyrət.
Ağlımız qeyrətdən geri qalınca
Dönür əfsanəyə, nağıla qeyrət.

El deyib: "Ağıllı fikirləşincə,
Dəli vurub keçdi çayı bir anda".
De görək, neylədi ağıllı Həmzə
Dəlilər "huy" – deyib cəbhə yaranda?

Dəlilik istərəm, ağıllı başdan
Qar yağar, soyuqdur onun tədbiri.
Dəlibaş atəşdir, o keçər daşdan,
Şumlar daş dözümü, əridər səbri.

"Ağıl", "ağıl" – deyən boş nağılların
Dalında həmişə qorxu gizlənər.
Dünyada açılan bütün yolların
Əvvəli qeyrətdir, axırı zəfər.
Bizə qeyrət gərək, bizə od gərək,
Ölümə getməyə istedad gərək.

*Sentyabr, 1985*

## HƏM OĞUL, HƏM ATA

Hamı adilikdən qalxıb ucalmaq,
Hamı bu millətə ağsaqqal olmaq,
Hamı bu ölkəyə gətirmək deyil,
Hamı istəyini almaq istəyir.
Fərmanı yerinə yetirmək deyil,
Ölkəyə fərmanlar vermək istəyir.
"Məndən ağıllısı tapılmaz" – deyir.

Masa hərisləri nə yaman çoxdur,
Hanı bu Vətəni düşünən ürək?

Millətin adından danışan çoxdur,
Millətin dərdinə alışan gərək.
Görünmür bu yolda nə əvvəl, nə son.
Gün kimi bəllidir: yeddi milyonun
Dərdini köksündə yaşatmayan kəs
Bu boyda millətə baş ola bilməz.

Özümüz yanırıq öz dərdimizə,
Dünyanın qulağı kar olmuş bizə.
Bizim haqqımızı boğur siyasət,
Haqqı sübut edən şahidimiz yox.
Sıfıra dönübdür başsız bu millət,
Sıfırlar önündə vahidimiz yox!

Kimisə yendirən, kimisə yenən,
Ürəyi piylənən, beyni piylənən,
Vicdanı piylənən yekəqarınlar
Dərdini nə bilsin bu ac millətin,
Adicə insafa möhtac millətin.
Xalq üçün yananlar qapı dalında,
Xalqı talayanlar cah-cəlalında.
Halımız, günümüz çətin, çox çətin!
Nəyi gözləyirik? Bütün millətin
Ürəyi nəbzində döyünən kəsi,
Özüylə, dostuyla, tayfasıyla yox,
Böyük millətiylə öyünən kəsi
Tanıyan var isə göstərsin bizə,
Gəlsin rəhbər olsun millətimizə.

Millət Qarabağda qırılan zaman
Oğlunun toyunda çalıb-oynayan
Adamdan millətə baş ola bilməz,
Bu xalqın özündən ağır yükünü
Çəkən arabaya qoşula bilməz.
Xalqın yanğısına alovlanmayan,
Cəbhədə can verən şəhid əsgəri

Özünə doğmaca övlad sanmayan
Necə ola bilər xalqın rəhbəri?
Bu Vətən mənimdir, bu Vətən sənin
Səngərdə əsgərə dəyən güllənin
Ağrısı qəlbində göynəməyən kəs
Bu boyda millətə baş ola bilməz.

Millətçün yananı göstərin mənə,
İnanım mən onun böyüklüyünə.
Elə bil ilişib zaman zamanda
Nə ilə bitəcək bu dərdin sonu?
Şuşada, Şellidə, Kərkicahanda
Atılan topların gurultusunu
Bakıda evində eşitməyən kəs
Vallah, bu millətə baş ola bilməz.

* * *

Yel əsdi, tərpəndi, dindi məmləkət,
Kompassız gəmidir indi məmləkət,
Hara getdiyini özü də bilmir.
Lövbər ilişmişdi, zaman açsa da,
Bir addım irəli o gedə bilmir.
Sükançı göstərin indi siz mənə,
Gəlsin, dalğaları o, yara bilsin,
Verib sinəsini ləpədöyənə
Gəmini irəli apara bilsin.
Bir oğul göstərin indi siz mənə
Millətə həm ata, həm oğul olsun.
Çox gördük xalqını qul edənləri,
Eləsi gəlsin ki, xalqa qul olsun.
Elə bir namizəd göstərin mənə
Dolanım başına, dönüm gözünə.

*Aprel, 1992*

## ƏGƏR QORUNMAZSA İSTİQLALIMIZ

Qəribə zamanda yaşadıq, oğul,
Bilmədik maskayla üzün fərqini.
Vallah, seçilmədi hiylədən ağıl,
Bilmədik əyriylə düzün fərqini.

Yaşadıq birtəhər, yazdıq birtəhər,
Zaman bizim üçün müstəbid oldu.
Dil – açar olmadı,
ağla gələnlər
Dildə kilidləndi, dil – kilid oldu.
Ağlın dediyini demədi dillər,
Bizi bağışlasın gələn nəsillər.

İzlədi hamını qorxu, təhlükə
Haqqın, ədalətin öldü anası.
Oldu başdan-başa o boyda ölkə
Məhkum millətlərin həbsxanası.
“Bərabər olmalı – dedilər – hamı”,
Yasa döndərdilər toyu, bayramı.

Bərabər tutuldu od-alov suya –
Yaxşılar yamana, oğru doğruya.
Hər şey alt-üst oldu, qarışdı aləm,
Bağının barını el dərəmmədi.

Varlını yoxsula döndərən qələm
Yoxsulu varlıya döndərəmmədi.
Hər şey öz əksiylə yerbəyer oldu,
Hamı yoxsulluqda bərabər oldu.

Tapdandı əzmimiz, şəxsiyyətimiz,
Mənlik sürgün oldu, yad oldu bizə.
Nə simamız qaldı, nə sifətimiz,
Hamımız bənzədik bir-birimizə.

Yalan zurnasına oynadı ölkə,
Yalan əqidəyə, mərama döndü.
Sinəmiz altında ürək yerinə
Yalan dilə gəldi, yalan döyündü.

Hələ torpağa da yalan əkdilər,
Yalan əkilmişdi, yalan dərildi.
Dünyaya dəmirdən pərdə çəkdilər
Millət əsarəti səadət bildi.

Qaranın üzündə bəzən ağ ləkə!
Vaxtın ələyində hər şey ələndi.
Qəribə aləmdir, qalib bir ölkə*
Məğlub etdiyinə əl açır indi.

Azadlıq, səadət haqqımdır mənim,
Allah çox görməsin bu haqqı bizə.
İstiqlal yolunda qurbanlar verib
Axır yetişmişik istəyimizə.
İplər qırılsa da, bilmirəm hələ
İpin ucundakı o qarmaq nədir.
Uzaqdan qurulur bizə min tələ,
Şeytanın barmağı evimizdədir.

Ey xırda millətlər, ayıq olun siz
Hələ çalxalanır bulanıq dəniz.
Verdiyi vədini tez unudan var,
Bulanıq sularda balıq tutan var.
Girib qılığına, alıb könlünü
Saçı sığallayıb başı vuran var,
Atı torbasıyla vuruşduran var.
Xırda millətləri "ayır, buyurla"
Bir-birinin üstə salışdıran var.
Odlu nöqtələrdə səngiyən odu
Püfləyib təzədən alışdıran var.

---

* Rusiyanın Almaniyadan yardım ummasına işarədir

Çıxsa da əlindən xalqlar, ölkələr
Ölməyib o iblis, o Şeytan hələ.
Hələ ümid verir ona bəlkələr,
Düşməyib amirlik taxtından hələ.

Üç yüz il dünyaya qan udduran taxt
Çürüyüb, sahibi inana bilmir.
Ondan üz döndərib bu dövran, bu vaxt
Bu böyük gerçəyi o qana bilmir.
Həqiqət, ədalət məhkəməsinə
Qol çəkir, qolundan utana bilmir.
Tərgitmək istəmir köhnə vərdişi,
Anlaya bilmir ki, qırılıb dişi.
Kiçik balıqları üyüdə bilməz,
Daha köhnə yolla o, gedə bilməz,

Yoğrulub İblisin mayası kindən,
İblis ləzzət alır öz pisliyindən.
Ölüm anında da əl çəkən deyil,
O öz vərdişindən – iblisliyindən.
İndi ki, belədir…
Nə deyim artıq?!
Budur durumumuz, budur halımız;
Bizi məhv eləyər arxayınçılıq,
Əgər qorunmazsa istiqlalımız!

*İyul, 1992, Şəki*

## TƏZƏDƏN YARATSIN YARADAN BİZİ

Yalan mamırlanıb ürəyimizdə
Haram maya tutub çörəyimizdə.
Yalana inandıq, doğrunu dandıq,
Yalandan nə bezdik, nə də utandıq.
Həqiqət qovuldu həyatımızdan,
Yalan bazarında satıldı vicdan.
Xəyanət gözüylə baxdıq hər şeyə,
Təpədən dırnağa döndük hiyləyə.

Hiylə zəhərindən o qədər içdik,
İndi yalan axır damarımızdan.
Sirat körpüsündən kələklə keçdik,
Dönmək istəmədik öz karımızdan.

Zamanın şər ilə söz birliyindən,
Haqqın zor əlində əsirliyindən
Qəlbimiz o qədər yaralanıb ki,
Hiylələr o qədər haqqı danıb ki,
Kələyi ağıldan seçə bilmirik,
Gerçəyi nağıldan seçə bilmirik.
O qədər əyriylə çulğalaşmışıq,
O qədər dolaşıq yollar aşmışıq
İndi hamar yoldan keçə bilmirik.

Tamam unudulub əcdaddan gələn
Gözəl xislətimiz, təbiətimiz,
Bu gün özümüzə yad olmuşuq biz.
Kiminsə dərdinə alışıb yanmaq,
Kiməsə əl tutmaq ar gəlir bizə.
Kimisə aldatmaq, nəyisə danmaq
Elə bil çevrilib xislətimizə.
Gözümüz önündə haqq ölən zaman
Fəryad qopardıqmı?
Yox, susan olduq!
Biz ömür qazanıb susmağımızdan
Amma insanlığı uduzan olduq.

Bu gün üzümüzə qabarır zaman,
Biz necə keçmişi bu gündən danaq?
Biz indi dünənin çirkablarından
Necə təmizlənək, necə paklanaq?

Fikrimiz o qədər hədələnib ki,
Ruhumuz o qədər zədələnib ki,
Anlaya bilmirik astar nə, üz nə
İndi baxammırıq düzün gözünə.

Yalan mamır tutub ürəyimizdə
Bu qalın mamırdan arınmaq çətin!
Günün damğası var kürəyimizdə,
Damğa bizimlədir çox illər, yəqin.

Könlümü gəmirən fikirlərimi
Dünən öldürmüşəm bir cəllad kimi.
Mən kiməm?
Ağlımın kəsilən dili!
Mən fikir qatili, əməl qatili!

Bu gün ədalətli bir insan kimi
O qatil ömrümü ömür sayımmı?
Özümün özümə xəyanətimi
Bu gün mən özümə bağışlayımmı?
Tərsinə yaşadıq bir qarış ömrü
Hələ sağım solda, solum sağdadır.
Dünənki günlərin köləlik möhrü
Hələ ruhumuzda yaşamaqdadır.

Necə təmizləyək dünən kirlənən
Bu gün saflıq uman ürəyimizi?
Haqqa çətin gələr haqqından dönən,
Təzədən yaratsın yaradan bizi!

*Avqust, 1992, Şəki*

## ÜMİDƏ HEYKƏL QOYUN

Ürək yaşar həmişə
Ümidiylə qol-boyun.
Ümid yaşadar bizi,
Ümidə heykəl qoyun.

Ümid necə xoşqılıq,
Ümid necə işvəkar.
O – bütün qıfıllara
Düşən sirli bir açar.

Tək olsam, həmsöhbətim,
Cüt olsam, həmkarımdır.
Ac olsam, o – çörəyim,
Lüt olsam, paltarımdır.

Ümiddir dərdimizin
Sinəsini dağlayan.
Ümiddir bu günümü
Sabahıma bağlayan.

Bizim min-min arzumuz
Hər vaxt bizdən öndədir.
Puç olan dilək belə
Ümid yedəyindədir.

Ümid bizdən çox yaşar,
O, nə əvvəl, nə sondur.
Ümidin ömrü, vallah,
Ömrümüzdən uzundur.

Ümidlə bir olanda
Həyat bizə bal dadır.
O, aldadıb yaşadır,
O, yaşadıb aldadır.

Heykəl qoyun ümidə
Tərk etməz bir an bizi.
Arzuya qanad verib
Odur yaşadan bizi.

Qana-qana aldanaq,
Budur həyat, budur haqq!
Yaşaya bilərikmi
Əgər biz aldanmasaq?

*Avqust, 1992.*

## VƏTƏN MARŞI

Ey Vətən oğlu, düşün, bil ki, sənindir bu Vətən,
Sabahın, həm bu günün, həm dünənindir bu Vətən.
Sənin öz dövlətin, öz millətin, öz cəddin var
Vətən uğrunda ölənlər ölümündən doğular.
Biz Vətən məcnunu, el aşiqi, sülh əsgəriyik
Biz Vətən naminə ölsək, dirilərdən diriyik.
Mənim öz ulduzumu bağrına basmış hilalım,
Dedi öndər: "Yönü bayraqdakı üç rəngdən alım"
Sən bu gül bayrağın altında məramınca yaşa,
Qoyma düşmən nəfəsindən ona çirkab bulaşa.
Sənin öz bayrağının kölgəsi cənnətdi sənə,
Günəş hər gün doğur ancaq içimizdən Vətənə.
Bizim iqbalımızı yazdı qılıncın kəsəri,
Bizi biz etdi Dədəm Qorqud oğuznamələri.
Ey Azərbaycanımız, türkün oğuzlar Vətəni,
Ər oğullar, ər igidlər, kişi – qızlar Vətəni,
Sənin haqqındır azadlıq, sənin eşqindir iman,
Tapınar haqqa və insanlığa haqqdan doğulan.
Bəşərin dərdini öz dərdi bilib millətimiz.
Bizim öz niyyətimizdən doğub hürriyyətimiz.
Gecələr yatmadan əvvəl sor özündən ki: "Bu gün
Mən nə etdim məni yurddaş edən öz yurdum üçün?"

*1992*

## SÖZ ALAĞI

Çəkdiyimiz bu dərdlər, müsibətlər, bəlalar
Qədərin qəzasımı?
Günahkar bəndələrə Allahın cəzasımı?
Özümüz də bilmirik nədən nə istəyirik
"Əgər belə olarsa, elə olar" – deyirik.
Ədalətin saplağı asılır bir "əgərdən".
Sözlər düşüb kəsərdən, sözlər düşüb dəyərdən.

Sözdən bina tikirik, daşı yox, kərpici yox,
Prezident fərman verir, icrası yox, gücü yox.
Boş-boş əmrlər ilə qaralanır kağızlar,
Qatıq kəsmir ağızlar.
Şəhdli-şirəli sözlər maça kimi sürtülüb,
Hara gəldi dürtülüb.
Söz itirib rəngini, çəkisini, tamını –
Öz ilkin anlamını.
Sifəti də bozlaşıb
Yaman həyasızlaşıb.
Sözlər elə dəyişib
   Dünən ağ bildiyimiz
               Bir gün sonra ağ olmur,
Elə üz göstərir ki, onu tanımaq olmur.
Söz qiymətdən düşəli yaman artıb sellənib
Sellənməyi bir yana, daş kəsəklə lillənib.
Kürsülərdə, efirdə, zəhərləyib havanı
İndi meydan sulayır neçə söz pəhləvanı.
Qanadlı nitqləri basıb sözün alağı
Hünərin var seç görüm kəhər atdan ulağı.
Əlindən iş gəlməyən
Söz ilə basıb-kəsən quru bəyə bənzərik.
Oxuduğu sözlərin mənasını bilməyən
Müğənniyə bənzərik.
Fələyin çarxı döndü,
Başqa donda göründü.
Heç olmasa bir anlıq boylanmadıq çarxa da
Bizim arxamızdakı bizi qoydu arxada.
Qabağa tələsmədik.
Qalxan kimi qorunduq, qılınc kimi kəsmədik
Bilmədik, haqq yolundan biz nə zaman sapındıq.
Tapınmadıq məsləkə, nəfsimizə tapındıq.
Bir yerdə ki, əməllər sözün yedəyindədir,
O ölkədə bilinməz yaxşı nədir, pis nədir.
Bir yerdə ki, susdurur, aqili yelbeyinlər
Bir yerdə ki, körpələr, türfə qızlar, gəlinlər
Düşmənin pəncəsində bu gün dustaq olubsa,

Dədəmizin torpağı dədəmizin quluna
Əgər oylaq olubsa,
Vay bizim halımıza –
Ölən amalımıza!

Bir yerdə ki, gah Əli, gah Vəli alqışlanır
Düşmənə tuşlanası od ağızlı silahlar
Öz xalqına tuşlanır.
Bir yerdə ki, namus, ar inzivaya çəkilir,
Bir yerdə ki, qaçqının payına göz dikilir,
Bir yerdə ki, ürfanın cəhalətdən fərqi yox,
Bir yerdə ki, yalanın həqiqətdən fərqi yox,
Bir yerdə ki, rüşvətdir ədalətin təməli,
Bir yerdə ki, şəhidlə fərarinin əməli
Bir-birinə qarışmış,
Bir yerdə ki, yasla toy, xeyirlə şər barışmış,
Bir yerdə ki, kiməsə
xəlvəti him-cim etmək,
Halalca torpağını düşmənə təslim etmək
Adicə bir işdisə,
Ölüm adiləşibsə,
Matəm adiləşibsə,
Dərd, qəm adiləşibsə,
Bir yerdə ki, millətin haqqı hərrac malıdır
O ölkədə Vətən də, el də satılmalıdır.

Çörək bahalaşanda, qeyrət ucuzlaşarmış,
İnsan ürəyilə yox, mədəsiylə yaşarmış.
Ət-qızıl qiymətinə, vicdan su qiymətinə,
Yalan od qiymətinə, iman su qiymətinə
Satılırsa, susmağı, gəlin, sayaq hünərdən,
Günəşi də gözləyək dünən batdığı yerdən.

*İyun, 1993*

## OXUMA, BÜLBÜL

Bu bahar oxuma, bülbül, sən allah.
Zülmətdir,
Yoluna şam tutanın yox.
Şuşan ağlar qaldı, köçdü el-oba
Şirin cəhcəhinə dəm tutanın yox.
Sən Cıdır düzündə cəh-cəh vuranda
Qədir hay verərdi sənə bir anda.
İndi bu dağlardan didərgin olduq,
İndi bu dağların Qədirləri yox.
Elsiz dağ da susar, bulaq da dinməz,
Qədirsiz Şuşada qədrin bilinməz.
Bu bahar oxuma, bülbül, sən allah.
Daşaltı çayının kəsilib səsi,
Bizsiz o kükrəməz, o, coşa bilməz.
Vallah, inanmıram, bülbül nəğməsi,
Hayastan dilinə uyuşa bilməz.
Oxuma, oxuma, bülbül, sən allah.

Açma xarıbülbül, açma, sən bu il,
Görürsən, bu bahar bizimçün deyil.
Axı, Əhmədlərin, Məhəmmədlərin
Qanıyla sulanmış çiçəklər bu il.
Ötdü günlərimiz ahlı, amanlı,
Sənin hikmətini o əliqanlı
Çöllərin gədəsi anlaya bilməz
O yerlər bizimçün darıxmırmı bəs?

Bizsiz Şuşamızda nələr baş verir?
Allah bizə ümid, ona aş verir.
Çiçək kimi zərif, su kimi şaqraq,
Muğam kimi kövrək, anam Qarabağ,
Nəğməli qəlbinlə söylə, sən bu gün
Cəllad tapdağına bəs necə dözdün?
Qoy bəhər verməsin bu il bu torpaq,
Düşmən məzarına o dönsün ancaq!

Bizim oylağımız o qəlbi dağlar,
Muğam pıçıldayan ayna bulaqlar,
Daşaltı çayının daş dələn səsi,
Şuşa qalasının "Ərim gəldi"si,
Dərin dərələrin daşğın selləri,
Natəvan şeirinin "qərənfilləri",
Sarı qayadakı bülbül nəvası,
Nəvvabın, Xudunun yurdu – yuvası,
Nal tökən dağların dar keçidləri,
Şuşanın kaşıdan göy məscidləri,
Yarış meydanları, cıdır düzləri,
Ulu Pənah xanın ayaq izləri
Görən, bizim üçün darıxmırmı bəs?
Boz qarğa bülbülə tay ola bilməz.
Yaxşı ki, ayağı yoxdur onların,
Onlar da bizimtək, yoxsa, qaçardı.
Onda bu gün kimi gələcəkdə də
Zülmə, haqsızlığa haqq əl açardı.
Bu ilki bahardan bizə nə?
Vallah,
Gəlsə də, bu bahar bizimçün deyil.
Oxuma, oxuma, bülbül, sən allah,
Açma, xarıbülbül, açma, sən bu il.

*May, 1994*

## YURD YAD ƏLİNDƏ

*Sabirin, M.Cəlilin divanəsi,*
*hüquqşünas Ə.Yaşara*

Hər gün neçə şəhid dəfn edirik biz,
Ağacı torpağa basdıran kimi.
Üzlərdə qəzəbdən nə kölgə, nə iz,
Dəfn mərasimi ötür an kimi.

Niyə bu mərasim sarsıtmır bizi?
Necə gəlib çatdıq bu “məqama” biz?
Bu ki, faciədir… faciəmizi
Niyə çevirmirik intiqama biz?

Qəzəb zirvəsindən endik biz bu gün,
Yoxuşlar çevrilib enişə döndü.
Şəhid dəfn eləmək, yoxsa, bizimçün
Adicə qaydaya, vərdişə döndü?

Məzarın başında qanadlı sözlər,
Qanadlı cümlələr baş alıb gedir.
İntiqam hissimiz varsa bir qədər,
O da bu sözlərlə boşalıb gedir:
“Ədalət bizdədir… bizimdir zəfər,
Daim güvənmişik biz həqiqətə.
Vətənin yolunda ölən şəhidlər
Ölmür, qovuşurlar əbədiyyətə”.

Çox gözəl sözlərdir, hikmətli, kövrək
Amma çox uyuruq sözə, “hikmətə”.
Yoxmu mərasimdə bəs bu şəhid tək
Qovuşmaq istəyən əbədiyyətə?
Buyursun, bir nəfər irəli gəlsin.
Bu şəhid oğlana varmı bir əvəz?
Onun qatilinə hanı qəzəb, kin?
Onun qisasını kim alacaq bəs?

Verib Qarabağı Bakıya qaçdıq,
Bakıda “Qarabağ” kafesi açdıq.
Verib Qarabağı oxuduruq biz,
Toylarda “Qarabağ şikəstəsi”ni.
Heç demə, bizim də kişiliyimiz
Toylarda cırmaqmış minlik dəstini.

Çaldı, Qarabağı çaldı düşmənim
Bəs o şikəstəni oxuyan kimdir?
Düşmən əlindəykən Qarabağ,
mənim

Şikəstə deməyim şikəstliyimdir.
Biz bunu bacardıq, biz bunu yalnız,
Bizə qənim olmuş öz tamahımız.

Düşmənə yönəlmir qəzəb də, kin də,
Dərs ala bilmədik əcdadımızdan.
Özümüz bu kökdə, yurd yad əlində,
Haray Çələbi xan, haray Pənah xan!

*Aprel, 1994*

## UTANIRAM

Şəhidlərin, qaçqınların
Üstümüzdə min ahı var.
Çatdığımız bu nöqtədə
Hamımızın günahı var.

Düşmənimiz arxalandı
Silahına, öz gücünə.
Zora təslim olan torpaq
Qaytarılmaz söz gücünə.

Əldən getdi yurd-yuvamız,
Necə dözdük bu dərdə biz?
Qaytarmaqçın haqqımızı
Əl açmayaq namərdə biz.

Düzü budur: Bu dünyada
Gücün varsa, sözün haqdır.
Gücün yoxsa, son əlacın
Xəcalətdir, utanmaqdır.

Bir zamanlar neçə-neçə döyüşlərdən
Qalib çıxan qalalara baxdıqca mən
Keçmişimlə indim durur yan-yanaşı.
Keçmişimdən bu günümə

Yağır indi töhmət daşı.
Alışıram için-için,
Sual qopur ürəyimdən: Neçin, neçin?

Babaların ucaltdığı
Bizim qalib qalalardan utanıram.
Çadırlarda
Donan körpə balalardan utanıram.
Bu torpağı qorumağı
Özümüzə borc bilmədik.
Vətən getdi,
Vətəndaşlıq zirvəsinə yüksəlmədik,
utanıram.
Vətən getdi, şeir yazdıq:
"Sən mənimsən, ana Vətən".
Vətən getdi, nitq dedik
Uca-uca kürsülərdən,
utanıram.

Vətən getdi, el talandı,
Didişirik biz hələ də.
Biz iqtidar uğrundakı döyüşlərdən
Usanmadıq bir gilə də,
utanıram.

Söz altında yatammırdıq,
Diz altında yatan olduq.
Dədələrin qazancını
Nəfsimizə satan olduq.
Yurdu satmaq hesabına
Arzumuza çatan olduq,
utanıram.

Səbrimizin dolub daşan kasasından,
Şəhidlərin alınmamış qisasından,
Onların qan bahasından,
Bu millətin qəhrəmanlıq dühasından
utanıram.

Biz hələ də çalxanırıq
Əsr keçdi, durulmadıq.
Kütləyik, bu çək-çevirdə
Əlınib millət olmadıq,
utanıram.

Qəbirlərin baş daşını oğurlayan,
Yaşamaqçın ölü soyan
Gədələrin özümüzdən olduğuna
utanıram.

Bu millətin acı-doğru, toxu-oğru.
Aclarına acıyıram,
Mən toxuna utanıram.
Ölün varsa, vay halına!
Arxa çevir düzlüyünə, amalına!
Bir qəbirlik yer almaqçın
Ətək-ətək
Rüşvət gərək!
Haqq evinə gedəndən də haqq istəyən
Şərəfsizə nə deyim mən?
Ölüm-ucuz, həyat-baha,
İndi ölüm, yaşamaqdan min qat baha!
O da haqdır, bu da haqdır.
Mənim kimi binəvanın
Son əlacı utanmaqdır.

Yarəb, necə millətdi bu?
Başdan-başa zillətdi bu.
Öz-özünə qənimdi bu.
Hər nə isə mənimdi bu,
Əsrlik qan düşməninə
Deyə bilmir son sözünü,
Amma qırır öz-özünü,
utanıram.
Cırtdan boyda Çeçenistan
Dəvə boyda Rusiyaya dərs verəli

Onu şöhrət məqamından
endirəli
Mən özümü necə varsa,
Elə görüb utanıram.
İndi çeçen qeyrətindən
Dərs götürüb utanıram.

Bu ölkənin sərvətini
O satalı, bu satalı,
Vətən olub hərrac malı,
utanıram.
Çadırlarda el qırılır,
Toylardasa pul cırılır,
utanıram.
Özgəsinin qoltuğunda yuva qurmuş,
Özgəsinin fitvasıyla
Öz xalqına tələ qurmuş,
Özgəsinin əli üstdə
İqtidara can atan kəs
Bu millətə əsl oğul ola bilməz.
Bizimkidir o namərd də.
Buna dözmür, mən yanıram.
Satqına yox, satqınlığa utanıram.

Elə bildik, bu bəlalar
Allah yazan qədər imiş.
Bizim də Vətən sevgimiz
Utanmağa qədər imiş.
Bu torpağı qorumağı
Özümüzə borc bilmədik.
Vətən getdi,
Vətəndaşlıq zirvəsinə yüksəlmədik.
Heç olmasa bu gerçəyə biz inanaq.
Sonuncumuz qalanadək
Ya vuruşaq, ya utanaq!

*Mart, 1995*

## ŞƏHİD ANASI

İçindən alışıb o, yana-yana
Müşgül diləyini gətirir dilə,
Məmurun önündə əyilir ana:
-Şəhid anasıyam, mənə rəhm elə!
"Şəhid anasıyam!" – zənn edir ana
Dərdin çarəsidir bu iki kəlmə.
Əslində, millətin bağrından keçən
Qılınc yarasıdır bu iki kəlmə.
-Şəhid anasıyam, eşidin məni…
O susdu, dayandı, gözləri doldu.
Könüllər dağlayan iki kəlməni
Bağlı qapılara açar bildi o.

O, hələ bilmir ki, açar bildiyi
Düşmür kilidlənmiş daş ürəklərə.
Bəsdir təsəlliyə könül verdiyi,
Döyür qapıları o, nahaq yerə.
-Şəhid anasıyam! – Naləyə bir bax!
Bu nalə bir qəlbi yumşaltmır ancaq.
Biz niyə həmişə özgəyanlıyıq
Amma özümüzə soyuqqanlıyıq?

Bu iki kəlmənin mətləbi nəydi?
Duymayıb, həm ona, həm sözə qıydıq.
-Şəhid anasıyam, – deməməliydi,
Biz onu gözündən oxumalıydıq.

-Şəhid anasıyam!
Onun fəryadı
Məlum həqiqəti kölgələndirir,
"Ana" dediyimiz o böyük adı
Analıq taxtından yerə endirir –
Biz niyə bu qədər soyuqqanlıyıq?
Şəhidi şəhidlik mərtəbəsindən
Endirir ananın giley-güzarı.

Bizdən kömək uman dərdli səsindən
Alışıb yanmazmı şəhid məzarı?
Ana qapılarda dilənir bu gün,
Oğul şəhid olmuş, yoxsa, bununçün?

*İyul, 1996*

## ATATÜRK

Atatürkün atası! Adi cəfakeş bir ata,
Öz kiçik külfətinin cövrünü çəkmiş bir ata,
Bir böyük millətə ancaq ata əkmiş bir ata!
Atatürkün anası! Adi bir insan, bir ana.
Zaman ötdükcə nədən səcdə qılır hər kəs ona?
Bir böyük millətə bir gün ata doğmuş o ana.
Atatürkün sinəsi, yurdun alınmaz qalası!
Atatürk millətinin həm atası, həm balası!
Nədir arzum, diləyim tanrıdan imanla bu gün?
Talanan, bağrına dağlar çəkilən xalqım üçün:
Yeni fikrin küləyindən qoca millət darana,
Bizi birləşdirəcək bir Atatürküm yarana!

*1992-1998*

## MƏN TÜRKƏM

Sən bizi aldatdın illərdən bəri,
Mən çərxi-fələkdən dərs götürmüşəm.
Özgə anasından süd əmənləri,
Özgə qulluğunda duran görmüşəm.

Bəsdir dözdüyümüz ölümdən betər,
Köhnə bazardakı o köhnə nırxa.
Milləti yüz yerə caladın, yetər,
Yüz arxın suyunu qatma bir arxa.

Əslimi, nəslimi tanıyıram mən,
Qarışıq deyiləm, özümdən hürkəm.
Sən kimsən, sən nəsən, özün bilərsən,
Mən ilk qaynağımdan türk oğlu türkəm!

Sübutdur, dəlildir, ağlın qibləsi,
Dəyişə bilərsən adımı ancaq.
Canım çıxanadək qəlbimin səsi,
"Türkəm" – gerçəyini pıçıldayacaq.

*Noyabr, 1995*

## SUAL VARSA, CAVAB VAR

Mən üzgüçü deyiləm, nə işim var dərində
Mən üzürəm dənizin ancaq dayaz yerində.
Dənizin dərinliyi vahiməylə doludur
Təkcə bunu bilirəm: Dərinlik qorxuludur.

Mən qorxuram könlümün içinə baş vurmağa,
Orda donub daşlaşan layları qaldırmağa.
Qaldırdınmı bir layı, lay üstündən lay gəlir,
Sükut layı pozulsa, dalınca haray gəlir.
Haray, dərinlikdəki min-min məchuldan haray!
Ana yoldan ayrılan cığırdan, yoldan haray!
Bir gülü dərmək üçün min əzaba dözürkən
Qarşında gül yerinə dikilən koldan haray!
Qorxuram xəyalımın məni hər gün aldadıb
Sərxoş edən meyindən.
Bir də…könül dəryamın dibsiz
dərinliyindən.
Nə deməkdir duyğumun bircə anın içində
Yanıb cilalanması?
Sabahkı faciənin bu gün hardansa sızıb
Ürəyimə damması?

Nə damdı, niyə damdı?
Niyə ağla dammadı, ancaq ürəyə damdı?
Biz dammanı bilirik damdırandan xəbərsiz.
Gah yanıb, gah sönürük, yandırandan xəbərsiz.

Daman ki, məlum idi.
Bəs, damdıran kim idi?
Niyə xəbərdar edir tale məni öncədən?
Xəbər taledən gəlir, yoxsa, mənə Tanrının
Verdiyi düşüncədən?

Yuxuda gördüyümüz gerçək olur ertəsi,
Bu günün olayları unudulur ertəsi.
Qırx il əvvəl olanlar elə bil bayaq olmuş.
Niyə uzaqlar yaxın, yaxınlar uzaq olmuş?
Nə deməkdir bu hallar –
Məni heyrətləndirən bu cavabsız suallar?

Heykəllərə döndərib hər duyğumu, hissimi
Mehrab kimi, büt kimi
Onların qarşısında mən donmaq istəyirəm,
Hər birinə əlimlə toxunmaq istəyirəm.
Eşitmək istəyirəm fəryadını, ahını,
Mən görmək istəyirəm bir duyğudan göyərən
Onun dörd cinahını.
Dünyanın bir sığalı, amma bol şilləsi var,
Ömrün üç pilləsi var:
Dünən-günah,
Bu gün – dərd,
Gələcəksə – ölümdür.
Üçü birgə – insanın öz-özünə verdiyi
İztirabdır, zülümdür.
Günah – köhnə günahdır, unuduruq amma biz.
Günahkardır cəddimiz.
O zamandan bulanıb hey axsa da çox sular,
Tanrının cənnətindən cəddimizi qovdular.
Hakim ola bilmirik nəfsimizə o gündən,

Xilas ola bilmirik şeytanın hiyləsindən.
Biz əl açıb dərgaha –
Təzə adlar veririk bu gün köhnə günaha…
Tanrı hər şeydən əvvəl torpağı yaratdı ki,
Yaratmaq istədiyi insan üçün yem olsun,
Təbiətdə bir ahəng, tarazlıq, nizam olsun.
Amma insan ölüncə
Bu dəfə də o özü torpaq üçün yem oldu.
Bu, ona təslim ikən,
O, buna təslim oldu.

Sən ey bu nizamdakı ilk qaydanı pozanım,
Sən ey vaxtın əlilə bizə tale yazanım,
Nə deməkdir, özün de,
Yemin dönüb yenidən yeminə yem olması?
Hakimin qul olması, qulun hakim olması?

Bircə günün içində min bir hala düşməyim –
Özgəsiylə dil tapıb, özümlə döyüşməyim
Nə deməkdir, ilahi?
Mən ki, aciz bəndənəm,
Bu duyğular əlində
üzü qara,
dili lal,
Gözü kor şərməndənəm.
Mənə verdiyin ağıl niyə gəlmir karıma?
O, cavab tapa bilmir min-min suallarıma.
Özün de, mənim ağlım aciz isə bu qədər,
Hardan doğur bəs sənin sirrinə əl uzadan,
Bu cavabsız suallar?
Eyni gündə doğulur hər qıfıla bir açar,
Qıfıl varsa, açar var,
Sual varsa, cavab var.

*Mart, 1996*

## BİR ÖMÜR YUXU

Bu gecə yuxuda gördüm, ölmüşəm
Nəfəsim təngiyib…
Amma bu aləm
Yüz illik, min illik vərdişindədir,
Hər kəs öz yolunda, öz işindədir.

Gəlir qulağıma qəhqəhə səsi,
Hardasa uzaqdan bir quş nəğməsi.
Odur, bax, mələyir çöldə bir quzu,
Axır bulaqdan da şırhaşırla su.

Heç nə dəyişməyib evdə yerini
Dolabda kitablar, güldanda çiçək.
Açıq pəncərənin pərdələrini
Gah-sağa, gah sola oynadır külək.

Gördüm, mənə baxır şəklim divardan,
Dedim, nağıl imiş arzu da, kam da.
Dedim, bir fərq varmı, görəsən, bu an
İndi o şəkillə mənim aramda?

Mən ölü, o cansız… kənar otaqdan
Gəldi nəvələrin şən-şatır səsi.
Gördüm, mənə baxır masam bucaqdan,
Neyləyim? Üstümdə ölüm kölgəsi…
Bir səs qulağıma gəlmişdi haqdan,
Ölümü görmüşdüm o vaxt elə bil.
Mənim ürəyimə dammışdı çoxdan:
Ən böyük qismətim ölümdür bu il.

Unutmaq istədim ölümü bir an
Gördüm, bacarmıram, əl hara çatır?
Mənim ölümümlə, gördüm, dünyadan
Heç nə əskilməyib, həmən dünyadır.

Yaman dəyişkəndir dünyanın rəngi
İnsanı ağladan bəzən ağlıdır.
Böyük səfehlikdir, düşünəsən ki,
Dünyanın varlığı sənə bağlıdır.

Qışqırdım, içimdə boğuldu səsim,
Səslərin içində yox oldu səsim.
Hamının dərdinə mən ortaq oldum,
Hamının dərdini saldım qəlbimə.
Bu gün mən ölmüşəm, mənim yoxluğum
Heç kəsin vecinə deyilmiş, demə.

Yalanmış bu dünya, dedim, ağ yalan!
Təzə bir şeirimi bitirəcəkdim.
Masamın üstündə yarımçıq qalan
Yazıma boylanıb, qəfil ah çəkdim.

Ayıldım yuxudan… dedim ki, çoxu
Nədənsə, öncədən ölümü duymuş.
Yox, yuxu deyilmiş gördüyüm yuxu,
Mənim yaşadığım ömür yuxuymuş.

*Avqust, 1997*

## YALAN BAZARI

Bu yalan bazarında mətah yaman ucuzdur
Aldığımız da sözdür, satdığımız da sözdür.
Sözün ləyaqətinə, mənasına varmadan,
Utanıb qızarmadan
Qıpqırmızı yalanı bülbül kimi ötürsən,
Riya dəyirmanında sən yalan üyüdürsən.
Özün bilirsən bunu,
Mən də yaxşı bilirəm
Səndən eşitdiyimin ağ yalan olduğunu.
Bilirəm, sən borclusan
Bu yalan alverində həqiqəti danmağa.

Abrının macalı yox, qızarıb utanmağa.
Amma mən də borcluyam sənin yalanlarını
Doğru, gerçək sanmağa –
Aldadıb aldanmağa.
Məndə qulaq, səndə dil, səndə qulaq, məndə dil,
Sən məni, mən də səni aldadırıq müttəsil.
Qulağımız, dilimiz bu yalan bazarında
Satın alır cənnəti.
Hər mətahın qiyməti
Bəlli olur dünəndən.
Aldadıb aldanırıq,
Bu minvalla razıyıq sən məndən, mən də səndən.
Gerçək elə daşlanır,
Yalansa gecə-gündüz o qədər alqışlanır
Ayırd edə bilmirik
Gerçək harda qurtarır, yalan hardan başlanır.
Yalan sərxoşluğunda elə xumarlanmışıq,
Çaylağı yol, gülü kol, qaranı ağ sanmışıq.
Yalan – həqiqətlərə istədiyi ölçüdə
Paltar biçən dərzimiz.
Yalan-həyat tərzimiz.
Gerçək-üzü qaradır.
O, gərək yalanların kölgəsində dolana.
Cəza-həqiqətədir, cəza düşmür yalana.

*İyul, 1998*

## MƏNİM FƏRQİM VARMI HEÇ?

Bir tərəfdə sel kimi od axıdan buruqlar,
Bir tərəfdə çadırda donan körpə çocuqlar.
Yurdumuzun atəşi isidir əcnəbini
İsidə bilmir ancaq Zübeydəni, Nəbini.

Yağan qarı qasırğa burmalayır bu gecə
Sobam yanır otaqda gürhagurla, gör, necə.
Yatağıma girmişəm, uyumaq istəyirəm

Yerimdə şirin-şirin.
Çatmır mənə naləsi çadırlarda üşüyən
Günahsız körpələrin.
Amma rahat buraxmır bir qəribə sirr məni:
Döşəyimin istisi bəs niyə sancmır məni?
Yatıram şirin-şirin.
Mən ki bilirəm indi çadır körpələrinin
Soyuqdan əsdiyini.

Özümdən də böyükdür öz-özümə heyrətim:
Varsa Vətən namusum, varsa millət qeyrətim
Necə yata bilirəm öz isti yatağımda?
Yatır nəvələrim də solumda və sağımda.
Sordum özüm özümdən:
-Görəsən, doğurdanmı bu yurdun oğluyam mən?
Bilmirəm kim utansın indi mənim yerimə?
Qıyardımmı bu zülmü mən öz nəvələrimə?
Nəvələrim deyilmi bəs bu qış gecəsində
Damsız qalan körpələr?
Hələ ucalmalıykən bu alçalan körpələr?
Bunu bilən vətəndaş öz isti yatağında
Rahatca yatarmı heç?
Yurdunun atəşinə qızınan əcnəbidən
Mənim fərqim varmı heç?

*Yanvar, 1998*

## UTANMAQ, QIZARMAQ

### I

Qalxıram kürsüyə danışmaq üçün
Nədənsə, hər dəfə dil topuq çalır.
Məni elə basır zəhmi kürsünün,
Demək istədiyim qəlbimdə qalır.
Uca kürsülərdən danışanda mən
Həm natiq oluram, həm də dinləyən.

Uzun illər boyu öz istəyimlə
Çox-çox kürsülərdən danışsam da mən,
Razı qalmamışam özümdən hələ
Özümə, sözümə nəzarətimdən.

Əgər karıxdımsa, elə o anda
Görürəm, alnıma soyuq tər gəlir.
Özüm öz sözümdən nöqsan tutanda,
Öz səsim özümə eybəcər gəlir.

Kürsüdə sərbəstlik mənə çox çətin!
Qorxmuşam fikrimi çatdırmayam mən.
Qorxmuşam, salonda əyləşənlərin
Üzümə zillənən nəzərlərindən.

Qorxmuşam, itirəm ölçü hissini
Qorxmuşam, nizamın pozulmasından.
Qorxmuşam, tərsinə anlayıb məni
Sözün başqa yerə yozulmasından.
Çox zaman kürsüdə sıxılmışam mən
Özümdən utanıb çəkindiyimdən.
Utanmaq – özündən bir boy ucalmaq!
Qızarmaq – günahı boynuna almaq!
Utanmaq hissini Allah heç kəsin
Qəlbindən çıxarıb, gülünc etməsin.

**II**

Xisləti, fitrəti hamıya məlum
O, yalan danışdı, yalan, ağ yalan.
Gözümü gözündən çəkib duruxdum
Onun əvəzinə utandığımdan.

Osa utanmadan gülüb gerçəyə,
Şəst ilə gözünü gözümə dikdi.
Üzünə vursaydım "yalandır" – deyə,
O, mənim üzümə dirənəcəydi.

Ondakı üzə bax, yalan düz oldu
Qara ağ, təpə dağ, astar üz oldu.

Üzdə abır varsa, sözdə ölçü var
Həyadan süzülən o sözə qurban.
Dünyada nə desən gözləmək olar
Özündən, sözündən utanmayandan.
Abır – üz suyudur, qəfil qızarar
Qırmızı deyilən bir acı sözdən.
Üzün ismətidir o su…
                                        əlhəzar
Abırı, isməti silinmiş üzdən!

Tanrım, nöqsanımı göstərdin mənə
Səhvimi öyrəndim xəcalətimdən.
Utanmaq hissini sən verdin mənə
Bu böyük lütfünə minnətdaram mən.
Gerçək – qəlbimizdən qaçarıdırsa,
Yalan – yüksəlişin açarıdırsa,
Utanmaq, qızarmaq unudulubsa,
Abır – abırsıza məğlub olubsa,
İnsaf da, vicdan da ərşə çəkilmiş
Demək, insandakı insanlıq ölmüş.

*İyun, 1999*

## GECƏLƏR – PƏNAH YERİM

Səhərlərim – boyasız, gündüzlərim – qorxusuz
Gecələrim – narahat, gecələrim – yuxusuz.
Başbaşayıq sübhə tək mənimlə fikirlərim,
Gecələrə açılır gizli-gizli sirlərim.

İndi mən qısılmışam gecələrin qoynuna
Boylanıram içimdə gah əvvələ, gah sona.
Gecələr – sığnaq yerim, gecələr – pənah yerim,
Gecələr bir-birilə döyüşən fikirlərim.

İnanardı ağıl da öz içimin səsinə
Şirin xəyallarımın yumşaq mütəkkəsinə
Baş qoyardım bir zaman
Xəyalı gerçək kimi yaşayardım bir zaman.

İndi qurban verməyə hazıram bir yad kimi
Min-min səhərlərimi, min-min gündüzlərimi
Bir anlıq sükutuma, bir yuxusuz gecəmə.
Qəm sükuta dəm tutur, gecələr sükut qəmə.

Allahın bal yuxusu mənə haram gecələr
Sürünürəm gündüzlər, yaşayıram gecələr.
Anam deyərdi: "Oğul, sən gecə doğulmusan
Bəlkə buna görə də gecəquşu olmusan".

Mən təpədən dırnağa indi səbrəm, dözüməm,
Çoxluğumda başqası, təkliyimdə özüməm.
Verdiyin tənhalığı geri götürmə, Allah,
Gecəmlə həsb-halı mənə çox görmə, Allah.

Mənim mənə ən yaxın sirdaşımdır gecələr,
İçimə damcılayan göz yaşımdır gecələr.
Gecələr sığnaq yerim, gecələr pənah yerim,
Səhərlər açılanda qapanır kirpiklərim.
Öyrəndim gecələrdən
Qaranlıq içində mən
Ulduz-ulduz yanmağı,
Özümə qapanmağı, içimə boylanmağı.

Gecələrin sahibi, gündüzlərin quluyam,
Mən gündüzlər adiyəm, gecələrsə uluyam.
Gecələr çiçəklənir söz gülşənim, söz bağım
Gecələrin şahıyam, yoxdur mənim ortağım.

*Dekabr, 1999*

#  İnsan və zaman

## ÖMÜR

*Y.Məmmədəliyevə ithaf*

Deyirlər, çox azdır yüz il, əlli il,
İnsana bir ömür kifayət deyil.
Hələ isitməmiş öz yerimizi
Ölüm cəllad olub haqlayır bizi.

Deyirlər, şirindir dadı dünyanın,
Kaş iki olaydı ömrü insanın.
Nola, çalışsaydıq ömrün birində,
Sonra əylənəydik biz digərində.

Hərə öz ömrünə bir cürə baxmış,
Hərə bu dünyanı bir cürə anlar.
Cahanda bəs nədən zövq alacaqmış
Zəhmətin özündən zövq almayanlar?

Yüz-yüz ömür belə azdır doğrusu
Bir ömrü insana az sayanlara
Haramdır bu hava, haramdır bu su
Əylənmək eşqilə yaşayanlara.

Yaşamaq – yanmaqdır, yanasan gərək,
Həyatın mənası yalnız ondadır
Şam əgər yanmasa, yaşamır demək
Onun da həyatı yanmağındadır.

Ömrü az olsa da, qartal yenmədi
Dedi, səmalarda öz oylağım var.
Ömrün azlığından gileylənmədi
Ömrü insan kimi başa vuranlar.

"Bu dünya beş gündür", – deyib hər yerdə
Sağ ikən qəbirdə uzanan da var.
Öz alın tərilə bircə ömürdə
Yüz insan ömrünü qazanan da var.

*Fevral, 1956*

## QARA SAÇLAR, AĞ SAÇLAR

Saçlarıma dən düşür, dən düşür, yaman düşür,
Hər baxanda anamın ürəyinə qan düşür.
Bu ağ saçlar, ay ana, səni dərdə salmasın,
Saçımın ağlığından qanın heç qaralmasın!

Alışıram gecələr masa arxasında mən,
Saçlarım da ağarır, qəlbimin atəşindən.
Sən deme ki, balamın bəlkə gizli qəmi var,
Vaxtsız ağaran saçın özgə bir aləmi var.

Ölüm belə qəm deyil bu həyatı duyana,
Mən bu ağ saçlarımla öyünürəm, ay ana!
Qara, şəvə saçları təbiət vermiş mənə,
Mən güvənə bilmərəm onun bu töhfəsinə.
Zəhməti həyatımın ilk bəzəyi sanmışam,
Ağ saçları həyatda mən özüm qazanmışam.

*Sentyabr, 1957*

## DÜNYAMI, MƏNMİ?

Uşaqlıq şəklimə hey baxıram mən,
İllər xəyalımdan süzülüb keçir.
Şirin xatirələr gözüm önündən
Gah ağlayıb keçir, gah gülüb keçir.

Küçədən tapdığım rəngli bir şüşə,
Könlümü nə qədər sevindirərdi!
Adamlar, adamlar məni həmişə
Oxşayar, əzizlər, xoş dindirərdi.

Xəyalən uçardım ulduza, aya.
Bir təzə sevdaya düşərdim hər gün.
Elə bilərdim ki, bu qoca dünya
Mənimçün yaranıb, ancaq mənimçün.

Dünya həmin dünya deyilmi aya-
Bəs neçin mənimlə əylənmir yenə?
Artıq köhnə dünya, bu qoca dünya
Özgə cür görünür, özgə cür mənə!..

Bəlkə ayrılmışam özüm-özümdən,
Özgə bir adamam bəlkə indi mən?
Dünya gözəlləşir, dəyişir aləm;
Ömür yollarını vüqarla keçdim.
Anlaya bilmirəm, qana bilmirəm
Dünyamı dəyişdi, mənmi dəyişdim?

*Yanvar, 1959*

## QAĞAYI KİMİ

Həm dənizdə, həm havada, həm də yerdə cövlanı var,
Həm üzürlər,
həm süzürlər,
həm gəzirlər,
qağayılar.
Bu arzunun həsrətilə əsrlərlə mən yanmışam,
Təbiətin qağayıya bəxş etdiyi nemətləri
Mən əqlimlə qazanmışam:
həm gəzirəm,
həm üzürəm,
həm süzürəm!

*İyul, 1960, Riqa*

## HƏR ŞƏKİLDƏ
## BİR ANIM...

(*Qələm yoldaşım Yusif Səmədoğluna*)

Hərdən töküb önümə
köhnə şəkillərimi,
Mən yadıma salıram
o ötən illərimi.
Bu şəkillər, şəkillər
köhnə xatirələrin
min nəğməli səsidir.
Yaşadığım anların
kağızlar üzərində
əks olan kölgəsidir.
Şəkillər yığın-yığın,
şəkillər dəstə-dəstə;
Hər şəkildə bir anım
əbədilik yaşayır
cansız bir kağız üstə.
Yaşamışam o anı,
O an çıxıb əlimdən;
O anda keçirdiyim
Həyəcanı, duyğunu
yaşamaram bir də mən.
Siz ey ötən illərdən
mənə xatirə qalan
cansız dövlətim, varım –
Kağız parçalarında
donub qalan anlarım!
Siz üstünü toz basan
nəğməsiz bir simsiniz,
mənim zahirimsiniz...
O anda yaşadığım
hissim, duyğum, düşüncəm,
bura əks olunmamış –

kağız üstə qonmamış.
Bax, bu şəkil: əlimdə
bir dəstə gül tutmuşam;
Sanki qaya başından
yerə baxan bir quşam.
On il əvvəl çəkilmiş
bu şəkilə baxanda,
O vaxtkı duyğularım
yada düşür bir anda.
O duyğuma gülürəm,
o arzuma gülürəm.
Duyğular başqalaşmış,
Arzular başqalaşmış.
O zamandan bu yana
çox sıldırım dağları,
qayaları aşmışam.
Arzular başqalaşmış,
mən də başqalaşmışam.
O şəkildə gördüyün
əli çiçəkli oğlan –
sadə ürəkli oğlan
mənəmmi?.. Ah, dəyişir –
Axı, insan dəmbədəm.
Doğrusu, o, həm mənəm,
Həm də ki, mən deyiləm.
Bu şəkillər, şəkillər
köhnə xatirələrin
min nəğməli səsidir.
Yaşadığım anların
kağızlar üzərində
Həkk olan kölgəsidir.

*İyul 1960, Riqa, Dubultı*

## ÖMRÜN PAYIZI

***Yavaş-yavaş***

Dövran tez dolanır, illər tez gəlir.
Biz də dəyişirik hey ildən-ilə.
Ömrün pillələri necə düz gəlir
Ana təbiətin fəsillərilə!

İlk bahar çağıdır uşaqlıq ömrün,
Şıltaqdır, oynaqdır kəpənək kimi.
Ömrün yay çağıdır gənclik büsbütün,
Coşğundur, dəlidir o, külək kimi.

Barlı-bəhərlidir payızı ömrün,
İnsan da bar verib əyir başını.
Dünyanı dərindən dərk etmək üçün
Düşünüb, gizlicə çatır qaşını.

Ağarır saç, saqqal ömrün qışında,
Həyat zəifləyir, axıra çatır.
Əl-ələ verərək, qoca yaşında
İnsan mürgüləyir, təbiət yatır.

Ömrün payız fəsli sıxdı əlimi,
Yoxsa qocalıram mən yavaş-yavaş.
Payızda yarpağa xal düşən kimi
Düşür saçlarıma dən yavaş-yavaş.

Ağaclar soyunur, yer xəzəllənir,
Fikir dumanlanır, gözlər zillənir,
Güllərin üstünə enən tək enir
Mənim gözlərimə çən yavaş-yavaş.

Soyuyur havalar, soyuyur bütün,
Qısalır, qısalır günlər günbəgün.
Axı, yaxınlaşır qürubu ömrün,
Əyilir dağlardan gün yavaş-yavaş.

Saralır get-gedə çöl, çəmən, çayır,
Könül hər saatı ömürdən sayır.
Bir səs qulağıma hey pıçıldayır:
– Bəxtiyar, göylərdən en yavaş-yavaş!

*Oktyabr, 1960*

## BARMAQLAR

Barmaqlar, barmaqlar!
Nə qədər işiniz, əməliniz var!
Kitab yazırsınız, ot çalırsınız,
Calaq vurursunuz, bağ salırsınız.
Siz çırtma da çalıb gah için-için
Məsum bir körpəni güldürürsünüz.
Çəkib tətiyini gah da tüfəngin
Yaxşı bir insanı öldürürsünüz.

Barmaqlar pul sayır, çiçək də dərir,
Barmaqlar can verir kamana, tara.
Barmaqlar, barmaqlar yol da göstərir
Nabələd yollarda yol azanlara.

Barmaqlar qaldırır ən ağır yük də,
Barmaqlar can verir daşa, torpağa.
Ürəyin elçisi qızıl üzük də,
Barmağa taxılır, bəli, barmağa.

Mümkünmü, mümkünmü saymaq, büsbütün
Nələrə qadirdir barmaqlar yenə?
Bizim əsrimizdə barmaqlar üçün
Yaranıb lap təzə bir vəzifə də...

Bir kiçik düyməni basmaq! Bu nədir?
Basdısa, bu dünya bir viranədir.
Məhv etmək bəşəri, ərzi, hər şeyi,

Bir anda dünyanı alt-üst eyləmək!
İşə bax! Bu boyda ərzin taleyi, –
Bir kiçik barmağa bənd imiş, demək!

İnsan idrakının yaratdıqları
İnsan idrakının hədəsindədir.
Gəlin, ay insanlar, birləşək barı,
Dünyanın taleyi məndə, səndədir.

Nələr görməmişdir bu qara torpaq,
Yenicə sağalır sinə dağları.
Bizim birliyimiz kəsəcək ancaq
Düyməyə uzanan o barmaqları.

*Noyabr, 1962*

## QALİLEY

Dedi: – Yer fırlanır... inanmadılar.
Onlar ona güldü, o da onlara.
Dedi: – Həqiqətə şübhənizmi var?
Dedilər: – Haqq deyən çəkilir dara.

O dedi: – Fırlanır, fırlanacaq yer,
Buna gülsəniz də, gülməsəniz də.
Yerdən dərs götürüb ölənə qədər
Məgər fırlanmırıq həyatda biz də?..

"Fırlanır" – Sözüylə o müdrik insan
Qırdı mövhumatın sərt buzlarını.
Əqlin baltasıyla vurdu başından,
Sındırdı öküzün buynuzlarını.
Milyon il dedilər: – Qaşqa öküzlə
Çatıbdır şöhrətə, şərəfə dünya.
Dedi: – Yer fırlanır... ancaq bu sözlə
Tanıdı özünü ilk dəfə dünya!

Qaliley “fırlanır” – Deyəndən bəri,
Ucaldı, göylərdən yerlərə baxdı.
Hər cürə uydurma əfsanələri,
Əqlin alovunda yandırdı, yaxdı.

Yer fırlanır, – deyə o çəkdi fəryad,
Sözünün gücünü özü də bildi.
Elə bil, bir anlıq susub kainat,
Bu iki kəlməyə qulaq kəsildi.

Dedi: – Yer fırlanır – qarışdı aləm
Yer durdu, fırlandı məscid, kəlisa,
Dedi: – Yer fırlanır, elə bil bu dəm
Təzədən çəkildi çarmıxa İsa...

Dedi: – Öz hökmümə inanıram mən,
Gərək dəyişilə dünyanın adı.
Dedi: – Yer fırlanır!... Bu iki sözdən
Papanın başında göy guruldadı.

Dedi: – Yer fırlanır... Bu ikicə söz,
Min bir sual düzdü “İncil”in üstə.
Papa qəzəblənib – Dağ basarıq biz –
Dedi, – bunu deyən o dilin üstə.

Divana çəkdilər alimi dərhal,
Dünyanı düşündü, eşqini andı.
Böyük Cordanonu yandıran tonqal,
Gözünün önündə gəlib dayandı.

Müqəddəs kitaba əl basıb həmən
Dedi: – Şəkkim yoxdur, bu kitab haqdır.
Ancaq düzü budur; deməsəm də mən,
Yer elə fırlanır, fırlanacaqdır!
Qəlbə bax, eşqə bax!..
Qorxub ölümdən,

O öz məsləkindən geri dönmədi.
– Həyatın naminə sürünmərəm, mən,
Məsləkin naminə ölərəm, – dedi.

Bəşər tarixində bəlalı insan,
İki qütb önündə çox dayanıbdır.
Haqdan yapışanlar keçib həyatdan,
Həyatdan qopmayan haqqı danıbdır.

Bu hünər önündə baş əyirəm mən.
Ötən zamanlarla fikrim öpüşdü.
Ölüm ayağında "Ənəl-həqq!"[1] – deyən
Mənim Nəsimim də yadıma düşdü.

Qaliley! Hələlik kəşfin bir yana!
Onun qiymətini alimlər bilər.
Sən haqdan dönmədin həyat naminə,
Bundadır böyüklük, bundadır hünər!

*May, 1963*

## SÜRƏT

Bir zaman vardı,
Verst ağaclarını saya-saya,
Üç günə gedərdik
Moskvaya.
Darıxardıq,
Bu sürətin ləngliyinə,
Sonra uçduq səkkiz saata,
Darıxdıq,
Darıxdıq yenə...
İndi üç saata gedirik,

[1] Ənəl-həqq – ərəbcə "mənəm Allah" deməkdir.

ancaq
Yolun uzunluğu
Yenə darıxdırır bizi,
İşıqdan almaq istəyirik
sürətimizi.
Yox!
Bu sürət də bizə yenə azdır, az!
Bu sürət
Fikrimizin sürətinə çatmaz.
Mən əsrin oğluyam,
əsrin!
Darıxmamaqçın
Mənə
Fikrimin sürətini verin!

*Sentyabr, 1963*

## NEKROLOQ

Nekroloq – bir həyatın son nidası, son səsi,
Bir mənalı həyatın ən qısa mənzərəsi.
Ömrün bütün günləri tez bir yerə yığışdı
on cümləyə sığışdı...
Mərhuma bircə anlıq versəydilər ömr əgər,
Baxıb, baxıb yad kimi,
o buna ağlardımı, o buna gülərdimi?..
Boylandı əməllərin ən kütah lövhəsindən
mərhum bizə son kərə.
Hər kəsin arzuları çoxdur əməllərindən
min kərə, milyon kərə.
Ürəkdəki arzular əməllərdən əzəldir,
Eləmək istədiyim mənim elədiyimdən
həm çox, həm də gözəldir!
Eləysə... Nekroloqa ömür tam olsun deyə
Əməllərlə bərabər ən gözəl arzular da
niyə yazılmır, niyə?!

*Fevral, 1964*

## ÜRƏKDƏKİ
## "SAATLAR"

Dünya,
bu qoca dünya
Bina olandan bəri,
Hərlənir soldan-sağa
Göydə Günəş,
Yerdəsə
saatın əqrəbləri.
Bu minvalla dolanır,
Yerlər,
Göylər,
Dənizlər.
Əqrəblər vaxtı izlər,
Vaxt da günəşi izlər.
Ah!...Bu daş, bu tərəzi,
Ah!... Bu ölçü, bu mizan,
Bəzən irəli gedir.
Bəzən geriyə qalır
Qəlbimizdə qurulan
Min bir səsli saatdan.
Bəzən səhər olmamış
Axşam olur mənimçün
Bəzən sonsuzluq qədər
Uzanır,
uzanır gün,
Ürəkdəki "saatlar"
Qəlbin öz iqliminə,
Nəğməsinə, siminə
Daim həmahəng olur,
Hər qəlbin öz eşqinə,
Arzusuna qurulur...
İnsan saata görə
Çox dolandı,
Çox döndü.
O cansız əqrəblərin
Arxasınca süründü.

Daha böyük günlərə
Qanadlanır eşqimiz,
Alnıaçıq,
gülərüz,
Sabaha gedirik biz.
Vaxt gələcək,
bir zaman
Qəlbimizdə dolanan
Saatlarla dönəcək,
Dolanacaq bu dövran.

*İyun, 1964*

## BİR ÜRƏKDƏ DÖRD FƏSİL

Hər gecə danışır radio havadan:
“Sabah az buludlu, biri gün yağış...”
İqlimin sirrini bu qadir insan
Gör necə öyrənmiş, gör necə açmış...

Sabahkı havanı bilirik bu gün,
Ey insan,
Bununla demərəm öyün...
Minbir havasını yerin, dənizin
Əvvəldən bilirik çox zaman, şəksiz.
Bəs niyə bilmirik öz qəlbimizin
Bir andan sonrakı havasını biz?..

Dörd fəsil yaşayır bir ildə torpaq
Qış, qış kimi gəlir, bahar bahartək.
Bir saat içində bəs nədən ancaq
Dörd fəsil yaşayır bəzən bir ürək?

Sabahkı havanı bilirik bu gün.
Ey insan,
Bununla demərəm öyün...

*1965*

## BABAMDAN QOCAYAM MƏN

Babam öldü səksənində
Atamsa altmışında.
Həm babamdan,
Həm atamdan
qocayam
Mənsə qırxca yaşında.
Telefonlar,
teleqraflar,
radiolar,
qəzetlər,
Yükləndirir günün, ayın yüküylə,
Hər saatı, hər anı...
Bir otağa sığışdırır
Sağı gündüz, solu gecə
Başı bahar, ayağı qış dünyanı...
Qitələri,
qütbləri
Birləşdirir sürətim.
Bu sürətin,
Bu cürətin,
Alovunda, odunda
Dəyişibdir
mənim eşqim,
fitrətim...
Sürətimiz çoxaldıqca
Məsafələr qısalır.
Dünənim bu günümdən,
Bu günümsə sabahımdan
Dəqiqələr borc alır.
Günlər günə,
Aylar aya qarışıbdır –
İtirmişik
ayların,
illərin sahilini.

Mən bir ayda yaşayıram
Babamın bir ilini.
Dağdan enib
Dağ başına dolanan
Burulduqca bulanan
Düzənlərdə durulan
Yüz xislətli çayam mən.
Atamdan qocayam mən,
Babamdan qocayam mən.

*Fevral, 1965*

## MƏNİM AD GÜNLƏRİM

Bu gün ad günümdür... evdə hamı şən.
Ancaq fikirliyəm, kədərliyəm mən.

Gəncliyim ötəli, belə günlərdə
Anıb yoxuşumu töyşüyürəm mən.
Xəzan yarpaqları oynaşan yerdə
Necə üşüməyim?.. Üşüyürəm mən.

Ancaq... uşaqlıqda istərdim hər gün,
Bizim evimizdə məclis qurulsun.
Günlərin hamısı dönüb büsbütün
Məni sevindirən ad günüm olsun.

Atamın, anamın yeganəsiydim,
Arzusu, həvəsi, könül səsiydim.
Ömrün nə qəribə günləri vardı,
Mənim ad günlərim bayram olardı.
Mən nə biləydim ki, dəyişir insan,
Ad günün, şad günün olmur bir zaman.

Aldığım o gözəl oyuncaqları
Qaçıb göstərərdim dostlara bir-bir.
Hanı, hanı ömrün o şən çağları?
Gedən, a qardaşlar, bir daha gəlmir...

Həmən adamammı?... Yox, başqayam mən.
Özgə cür görünür bu aləm mənə.
Bir zaman könlümə sevinc gətirən
Ad günüm gətirir indi qəm mənə.

Deyirəm, yenə də ömrümdən bir il
Ötdü...
Ötən illər səfə düzülür.
Mənim ad günümdə indi mən deyil,
Mənim balalarım sevinib gülür.

*Avqust, 1965*

## QORXU

Mənim sol əlimdə yanıq yeri var,
O, mənə töhfədir körpəliyimdən.
Odun odluğundan xəbərsiz vaxtlar,
Əlimi manqalda yandırmışam mən.
Mənə "cız!" – dedilər,
Ancaq qorxmadım.
Əlimi yandırıb tanıdım odu.
Mənim həyat ilə ilk tanışlığım,
Əlimi yandıran oddan başladı.

Oxşadı gözümü hələ uşaqkən
Ocağın al-əlvan alovu, közü.
Dünyaya gələli, bilmirəm nədən,
Nəyə vurulduqsa, yandırdı bizi...

Mən oddan qorxmadım yanana qədər;
Mən qorxu bilmədim qanana qədər.
Elə ki, yandım
Odla oynamaqdan qorxdum, dayandım.
Başlandı qorxu –
Başlandı ehtiyat –
Başlandı həyat...

*İyul, 1966, Şəki*

# ANAM TƏZƏDƏN BÖYÜYÜR

*Qızım Gülzara*

Anam, öz adını qızıma verdi,
Anam, nəvəsini çox istəyərdi.

Körpə nəvəsini qoyub yerində
Anam arxayınca dünyadan getdi.
Qızımın qıyqacı nəzərlərində
Anamı görürəm, anamı indi.

Nəvə nənəsinə oxşayır eynən,
Böyüyür, ucalır ilbəil qızım.
Təzədən böyüyür, anam təzədən,
Anamın özüdür elə bil, qızım.
Həyat öz qəribə sirlərindən
Bizə əlvan-əlvan möcüz göstərir.
Qızımı adıyla çağırmıram mən
“Ay anam” deyirəm, o da hay verir.

O mənim anamdır, o mənim anam,
Ancaq bir fərqi var, bunu danmaram:
Bir vaxt anam mənə can-can deyərdi,
İndi mən anama can-can deyirəm.
Bir vaxt anam məni çox istəyərdi,
İndi mən “anamı” çox istəyirəm.

*Sentyabr, 1966*

# NƏSƏ ÇATMIR

Gecə-gündüz, səhər-axşam,
Mən yazıram, oxuyuram.
Yazılarım kitab-kitab.
Nə olsun ki,

Ürəyimə çoxu yatmır,
Şeirimdə də nəsə çatmır,
Sözümdə də nəsə çatmır.

Könlümüzdən
Keçənlərin arxasınca biz qoşuruq,
Çalışırıq, vuruşuruq.
Səsə düşür məramımız,
Əməlsə bu səsə çatmır.
Düzü budur:
Sözümüzdə hər şey çatır,
Özümüzdə nəsə çatmır.

Gəmilərdə üzürük biz,
Maşınlarda gəzirik biz.
Hey gedirik,
Hey gəlirik.
Qışı böyük şəhərlərdə,
Yayı – dağda,
Kurortlarda dincəlirik,
Ancaq yenə biz bilirik:
Nəsə çatmır,
Nəsə çatmır...
Lap ayda da,
Lap gündə də nəsə çatmır,
Çatanların özündə də
nəsə çatmır.

Tək mənəmmi bunu duyan?
Yox-yox! Hamı gileylidir.
Bu, insanın öz həvəsi,
öz meylidir.
Yaşayırıq, yaradırıq,
Öyrənməklə boy atırıq.
Dünya – cıdır,
Həyat yarış...
Ucalırıq pillə-pillə,
Boy atırıq qarış-qarış.

Biz həmişə ucalmırıq
Bir qalxanda,
Bir enirik...
Bu enişdən, bu qalxışdan
Yaşamağı öyrənirik.
Həyat özü – bir möcüzə,
Bu möcüzün qarşısında
Gah susuruq,
Gah dinirik.
Öləndə də öyrənirik.
Deyirik ki, gör təbabət nə acizmiş.
Xəstəlik çox,
Dərman çatmır, dava çatmır...
Son nəfəsdə qışqırırıq:
Hava çatmır,
Hava çatmır.
Öyrənirik –
Demək daim qalxırıq biz
Son zirvəyə çatmır ancaq əllərimiz.
İstəyimiz aşır-daşır,
Arzulara çata-çata
Arzu bizdən uzaqlaşır.
Şikayətə başlayırıq özgəsindən.
Ancaq heç vaxt
Biz şikayət eləmirik özümüzdən.
Bir arzuya çatan kimi
Arzu düşür gözümüzdən...
Gah alışır,
Gah sönürük
Çırpınırıq,
Düşünürük:
Nəsə çatmır,
Nəsə çatmır...

İdrakımın işığıyla
Zülmətləri çox yarmışam,
Ömrüm boyu axtarmışam,

Tapmamışam:
Nədir, axı, bu çatmayan!?
Hər bir sirri açan zaman
Açılan sirr,
Minbir sirrin
Varlığından xəbər verir.
Açıldıqca
Açılmayan azalmayır.
Aça-aça düyünləri bağlayırıq,
Biz günbəgün.
Çox vaxt elə bilirik ki,
Dadı-duzu qabaqdadır ömrümüzün.

Öyrənirik –
Günü-gündən
Ucalırıq, qalxırıq biz...
Son zirvəyə
Çata bilmir əllərimiz.
Qoy çatmasın!
Elə deyək: nəsə çatmır!
Axı, insan
Çatmayana çata-çata insan olmuş,
"Hər şey çatır" – deməkdənsə,
Ömrün başa çatması xoş!..

*Noyabr, 1965*

## ANTENNA

Binaların damında
Antenna dirəkləri...
Dəmir,
Polad çubuqlar,
Bir dam üstə göyərib
Cahanı qucaqlayan
Nəhəng qanad çubuqlar.

Günün sözü çubuqlar
İdrakın təntənəsi,
Bəzəyi,
Süsü çubuqlar.
Şəhərlərdən-şəhərə
Səs körpüsü çubuqlar.
Qutularda yaşayan
İnsanın,
Gör-götür dünyasından
Hər an,
Hər gün bir təzə
Pay götürmək arzusu,
Hər şeyi bilmək,
duymaq,
görmək arzusu!..
Beyin qutularında
Çox darıxmış bu arzu.
Artıq
Bir neştər kimi
Binaların damını yarıb çıxmış
bu arzu!
Əsrin,
Günün
başında
Közərir taclar kimi.
Qışda yarpaqlarını
Tökən ağaclar kimi
Titrəyir,
Rüzgarmıdır
Onu belə titrədən?..
Xeyr!
İnanmıram mən!
Əsrin əsəbləridir
Onu belə titrədən!
Ax! bu dəmir ağaclar, –
Həndəsi üçbucaqlar
Dünyanın o başını

Çəkib evlərə bağlar...
Cərəyan telləritək
İnsan əsəblərinin
Hey gərilmək arzusu...
Hər şeyi gözlərilə
Görmək,
Qulaqlarıyla
eşitmək,
Əqliylə
bilmək arzusu!

Yarışıb gecə-gündüz
Dərin dənizlərlə biz.
Sıldırım dağlarla biz,
Dünyanın o başını
Eşidirik, görürük
Bu dəmir gözlərlə biz,
Polad qulaqlarla biz...
Ancaq...
yenə də ancaq
Bəs deyil bunlar bizə.
Könlümüzün min sözü,
Min sualı var bizə!
Bəzən duya bilmirik
Bizimlə illər boyu
Bir binada yaşayan
Eyni dərdi daşıyan
Qonşumuzun
Ürəyindən keçəni.
Burda kimi qınayaq?
Onu,
Məni,
Ya səni?..
Bizə elə gəlir ki,
Ağlımız dərindədir,
Hissimizsə dayazda...
Bilməkdən bezmədikmi?

Gəlin duyaq bir az da...
Bal kimi röyalara
Uyaq, uyaq bir az da.
Qəlbimizin başına
Dəmirdən yox,
amandır! –
Duyğumuzun telindən
Bir antenna qoyaq biz.
Uzaqları bilirik,
Yaxınları duyaq biz!

## TƏƏSSÜF
***İdman yarışı***

Çörək yeyə-yeyə, nərd vura-vura,
Baxırıq hər axşam televizora.

Ekranda görürük: dəstəbədəstə
Adamlar qırılır...
Yenə ölüm, qan
Bombalar tökülür şəhərlər üstə,
Ölən də insandır, baxan da insan.

Analar, körpələr ağlaşır zar-zar,
Dərələr, təpələr bələnir qana.
Elə bil uzanan odlar, alovlar
Qəhqəhə çəkərək gülür insana.

Od-alov sürünür şəhərdə dil-dil,
Uçur uca evlər, balaca damlar.
Elə bil ekranda qırğına deyil,
İdman yarışına baxır adamlar.
Çörək yeyə-yeyə, nərd vura-vura,
Baxırıq hər axşam televizora...

*1968*

## BAŞ

*Amerika alimi R.Uayt meymunun beynini bədəndən ayrı uzun müddət yaşada bilir. Bu məsələ ilə əlaqədar beynin köçürülməsi problemi üzrə dünya filosofları arasında böyük mübahisələr gedir.*

Qəribə aləmdir... zəmanəmizdə
İdrak təbiətlə yarışa girmiş...
Böyrək də,
ürək də,
qulaq da,
göz də
Bədəndən bədənə köçürülərmiş...

Bir maşın sahibi gərək olanda
Sınan hissələri alır dükandan.
Deyirəm, insanın əzaları da
Aptekdə satıldı bəlkə bir zaman.

Azmıdır insanın məgər dərd-səri?
Bu da bəşər üçün təzə təhlükə!
Hazır fikirləri, düşüncələri
Başlara doldurub satdılar bəlkə?

Böyrəyi, ürəyi dəyişmək asan.
Bəs başı?
Bu yerdə bir qədər dayan!
Hər şeyi dəyişir, axı, baş, beyin.
Baş özü, başları necə dəyişsin?
İnsanın adına, şərəf-şanına,
Deyirəm, gəlməzmi bundan bir ləkə?
Bir nadan güvənib öz imkanına
Dahinin başına göz dikdi bəlkə?

Ey həkim, gücünə inansan da sən,
Bu yükü boynuna heç götürmə, gəl.
Ayırıb insanı öz aləmindən,
Ana təbiətlə bəhsə girmə, gəl!
Həkim, təbiəti gəl hakim sayaq,
Hifz edək bir səsin yüz ahəngini;
Gücümüz çatsa da
gərək pozmayaq
Bəzən təbiətin öz ahəngini.

Dahinin beyninə qan sızdı birdən
Cahil də qəzaya düşdü həmən gün.
Cahilin başını öz bədənindən
Ayırdıq dahini yaşatmaq üçün!

Nə deyək?
Kim öldü?
Dahi, ya cahil?
Hansına yas tutsun qohum, qardaşı?
Dirilən kim oldu?
Bu ki, sirr deyil,
Dahinin bədəni, cahilin başı.

Dahi, yaşayacaq bir nadan kimi...
Kimi aldadırıq burda, biz kimi?
Cahilin başıyla, düşüncəsilə
Yaşayan o dahi, yenə dahimi?

Hanı o əvvəlki əqidə, məslək?
Əgər fikri yoxsa, özü sağmıdır?
Yaşamaq xətrinə fikri dəyişmək –
Məsləki dəyişmək yaşamaqmıdır?..

*1968*

## SİQNALLAR

*Dostum R. Nurəddin üçün*

Uzaq ulduzların sakinlərinə
Yoxsa bizim kimi dünya dar gəlir?
O biri dünyadan dalbadal yenə
Bizim dünyamıza siqnallar gəlir.

Ulduzlar insana nə deyir görən?
Bu səslər salammı,
Yoxsa hədəmi?
Bizə uzaqlardan siqnallar verən,
Əcaib məxluqmu?
İnsanmı?
Nəmi?

Hələ dünyasına qapılıb insan.
Dünya vəznindəndir diləyimiz də.
Alimlər düşünür: varlığımızdan
Xəbər göndərəkmi onlara biz də?
Bəlkə də... Gülürlər bizə uzaqdan,
Yəni biz onlardan geriyik belə?
Onlara baxanda,
bəlkə də insan
Uşaqlıq dövrünü yaşayır hələ?..

Təhlükə gözləyir bəlkə dünyanı?
Bəlkə...
Hədələyir bu səslər bizi?
Bəlkə...
O dünyanın qadir insanı
Öyrənmək istəyir qüdrətimizi?..
Əgər bu təhlükə olsa, bu yerdə
İndiki təzadlar kimə gərəkdir?
Millətlər,

fikirlər,
əqidələr də,
Onda bir məsləkdə birləşəcəkdir.

Kökü kəsiləcək nifrətin, kinin,
Loğmanlar olacaq onda hökmran.
Hamı bir ağızdan deyəcək yəqin:
Yaşasın dünyamız, yaşasın insan!

*Avqust, 1968*

## NEO

*Asiya və Afrika yazıçılarının Daşkənd*
*müşavirəsindən təəssürat.*

Bir salonda iki qitə,
Hər qitədə neçə millət...
Hər natiqin çiyinləri arxasında
bir məmləkət
Dayanıbdır...
Oyanıbdır
Yuxusundan,
Afrikanın, Asiyanın
qaraları,
Yaraları
Köz bağlayır.
Varaqlayır ötənləri
hər danışan öz dilində...
Mənzilində məhbus olan
bu dünənin məhkumları
danışırlar
indi uca bir kürsüdən,
Yox hürküdən,
Yox qorxudan
bu dünənki məzlumları,

Dili bağlı, qolu bağlı məhkumları.
Dillər əlvan,
Mətləb eyni...
Dərdlər, qəmlər bir olanda
söz bir olar.
Dünyanın bu başı ilə
O başı həmfikir olar.
Danışanlar eyni sözü
təkrar edir dönə-dönə
Dillərini bilməsəm də
Üççə kəlmə bəsdi mənə:
"İmperiya"
"Koloniya"
"Neo, neo!"
Nədir neo?
Köhnə tələ,
Təzə hiylə!
Bu neolar – sözü gizli, qəsdi dərin.
Oyun açdı başlarına
Sözü hərfi mənasında
başa düşən millətlərin.
Bu neolar –
bu tələlər,
bu hiylələr
min-min olur.
Təzə-təzə hiylələrdən
baş açmaq da çətin olur.
Haqla-nahaq qarışıbdır bir-birinə –
Gəl baş çıxart
neoların üstü bəzək, altı təzək
Min cür fitnə-fəsadından.
Haqq boğulur haqq adından.
Öz haqqını təzə-təzə başa düşən
millət, uşaq misallıdır.
Siyasətdən xəbəri yox,
min arzulu, xəyallıdır,
Hələ dünya səhnəsində

o tapmayıb öz yerini.
Qamaşdırır parıltılar
hələ onun gözlərini.
Körpə uşaq hardan bilə
Ona yaxın görünənin
Çox-çox uzaq mənasını?
Hardan bilə
Qaranın ağ mənasını?
Köhnə, qədim hiylələri neçə kərə
Təzə-təzə boyalarla
Yedirdirlər sözü açıq,
gözü bağlı millətlərə.

O danışan natiqə bax!
"Neolardan" fəryad çəkir
Bütün təzə hiylələri, kələkləri
sayır bir-bir,
Deyir: bəsdir, bu aldanış.
Artıq bütün bu "neolar" bizə tanış!
Bu neolar – üstümüzdə qılınc kimi
əsir bizim.
Saçımızı sığallaya-sığallaya
Başımızı kəsir bizim.
Sizin kimi bir insanıq.
Biz nə daşıq, nə dəmirik,
Yetər, artıq biz heç kəsə
Yamaq olmaq istəmirik!

Yaman dərddir,
Özgəsinə yamaq olmaq!
Yaman dərddir,
Azadlığın həsrətinə
damaq olmaq.
Yaman dərddir,
Gözün ola,
amma görə bilməyəsən.
Yaman dərddir,

Əlin ola,
Evindəki zir-zibili
sən süpürə bilməyəsən.
Yaman dərddir,
Dilin ola,
nə danışıb, nə dinəsən.
Yaman dərddir,
Ağlın ola,
özgəsinin ağlı ilə
düşünəsən...
Yox, zamanın öz sözü var.
Hər gecənin gündüzü var.
Əyrilər də düz görünür
Siyasətin aynasında.
Bu nə sirdir?
Aynanın ki, bir üzü var.

İki yerə parçalanmış Vyetnamın
İki bədbəxt vətəndaşı
Bu salonda
Oturubdur yan-yanaşı.
O da insan,
Bu da insan..
Eyni dərdi
o da çəkir, bu da çəkir.
Hər ikisi suya qaçır,
Amma gözə görünməyən sirr onları
oda çəkir, oda çəkir,
Türk yunana deyir: Kipr
Həm mənimdir, həm sənindir.
Sənin mənə,
Mənim sənə
Atdığımız güllələrsə
düşmənindir.
"Parçalayıb sən hökm sür!" siyasəti
Yurdumuzda od qaladı.
Biz bir yana,

Eyni dili,
Eyni dini
neçə yerə parçaladı.
Sən də quzu,
Mən də quzu,
Gəl qoruyaq canavardan özümüzü!
Gəl qorxmayaq
Nə sən məndən,
Nə mən səndən.
Gəl biz qorxaq
canavarın mədəsindən.
O mədədə həzm olunur
Neçə-neçə balacalar.
Kiçik-kiçik təpələrdən
dağ ucalar.
Biz vuruşub
Çiynimizin üzərində
Ucaldırıq imperiyanı...
Böyüklərin qidasıdır
kiçiklərin qızıl qanı.
Gəl anlayaq bu haqqı biz:
Bir qılıncla,
Bir qələmlə
Yazılıbdır tariximiz.
Bizim böyük sənətkarlar
Bir qaynaqdan ilham alıb.
Sizin ağac,
Bizim bağa kölgə salıb.
Öküzümüz olmayanda
Sənin baban,
Bizə verib öküzünü.
Babam ölüm yatağında
Pir babanı çağırtdırıb
Ona deyib son sözünü.
Axı bizim
Dədəmiz də,
Babamız da
Qardaş olub.

Məgər indi,
bu qardaşlıq,
unudulub?..
Daha bəsdir,
Gəl, qardaşım, verək bu gün əl-ələ biz,
Salaq qurdun yuvasına vəlvələ biz!
Neçə dildə danışan bu adamların,
ürəyi bir,
sözü birdir.
Siyasətin aynasında
Əyrilər düz görünsə də,
Aynanın ki, üzü birdir!
Dillər əlvan,
Mətləb eyni,
Dərdlər, qəmlər bir olanda
Söz bir olar.
Dünyanın bu başı ilə
O başı həmfikir olar.

*1968, Daşkənd – Bakı*

## ELM-ƏXLAQ

*"Təbiət üzərindəki qələbələrimizlə çox da öyünməyək. Hər bir belə qələbə üçün təbiət bizdən intiqam alır".*

***F.Engels***

Cürbəcür adlarla adlandırmışıq
Ötən hər əyyamı, ötən hər əsri.
Köhnə hüdudları çoxdan qırmışıq,
Əsrimiz elm əsri, kəşflər əsri!

Hüdudlar içində özünü dandı,
Elm – yüz illərlə yatdı beşikdə.
Elm – ayaq açıb dolanır indi,
Havada, torpaqda, evdə, eşikdə!..

Dağların çəməni, bağların barı,
Çatışmır.
Kimyaya meydan vermişik.
İpək corabları, yun paltarları
Sintetik şeylərə dəyişdirmişik.

Bəlkə torpağın da, bəlkə yerin də
Qalmayıb o köhnə gücü-qüvvəti?
Elə bil, elə bil meyvələrin də
Dəyişib əvvəlki dadı, ləzzəti.

Təbii nemətlər çatışmır, nədir?
Təbiət zəngindir, o, yoxsul deyil;
Təbiət insana səxavətlidir,
Ancaq qul deyil.

O ki, öz varını insana vermiş
Ona qəsd eləmək cinayət olar.
Bu gün təbiətlə yarışa girmiş
Kimyəvi zavodlar, laboratoriyalar.

Elm hökm eləyir indi hər yerə,
Zülmətin bağrına işıq nəqş edir.
Sonsuz qadınlara, ya ərsizlərə
Naməlum kişidən övlad bəxş edir.

Elm, özünəmi yoxsa... güvəndi?
Axı, bu qüdrəti biz verdik ona.
Əqlin yaratdığı elmlər indi
Düşübdür xaliqlik iddiasına...

Dava-dərman ilə doğulan kəsin,
Anası məlumdur, atasıysa yad.
Atanı... övladın əslini yəqin,
Nə ana biləcək, nə də ki, övlad.

Fərari olmurmu bəs əsl ata?
Bəs saxta atanın nədir günahı?

Uşaq anasına doğma olsa da,
Qondarma ataya ögeydir, axı.

Daha bir cinayət, daha bir xata!
Bu da bəşər üçün böyük bir ləkə –
Doğma övladından xəbərsiz ata
Bir vaxt öz qızına ər oldu bəlkə?
Səni danlamırmı içində bir səs –
Demirmi, ay həkim, cəhdin nahaqdır?
Övlad öz kökünü tanımırsa bəs,
De hansı kök üstə boy atacaqdır?

Kökünü bilməyən özünü bilməz,
Bizə nə gətirir bu niyyət, həkim?
Onda bir-birinə qarışmazmı bəs
Fərdiyyət,
şəxsiyyət,
milliyyət,
həkim?

Bu nədir? Gerimi qalmışam yoxsa?
Mən ki, güvənmişəm hər zaman elmə.
Əxlaqa, qaydaya toxunandasa
Mən üsyan edirəm, mən üsyan, elmə...

Təbiət həmişə təzədir, təzə,
Biz üz çevirməyək bu təzəlikdən.
Elm əxlaq ilə durub üz-üzə
İndi biz hansına haqq verək, görən?

Axı, bu tədbirlər bizi çaşdırır,
Gəlin uca tutaq əqidəmizi,
Həkim, təbiətdən uzaqlaşdırır
Qondarma davalar, dərmanlar bizi.
Bir şey ki, saxtadır – ondan nə fayda –
Saxtanın nə yönü, nə etibarı;
Əynimiz, başımız kimyalaşsa da,
Mayamız, kökümüz saf qalsın barı.

Anadır, deməli güclüdür torpaq,
Ondadır əlacı, axı, hər şeyin.
Gəlin, təbiətin özündən alaq
Dava-dərmanını hər şikəstliyin.

*May 1969*

## DAYAN İNSAN!

İnsana od bağışladı
Prometey!
Ehey!
        Ehey!
        Dayan, insan!
Hara belə?
İnsan dedi gülə-gülə:
-Dayanmağa nə macalım, nə halım var.
Yürüyürəm,
İrəlidir yolum ancaq!
Məqsədim bu, məsləkim bu:
Bilim ancaq,
Bilim ancaq!
Yox! "Allahü-əkbər" vaxtı keçdi çoxdan.
De "İnsanü-əkbər" indi.
Əlimdədir bu göy indi, bu yer indi!..
Pay aldığım od əlimdə
Məşəl kimi yanır, yanır.
Yol gedirəm...
Önündəki qaranlıqlar
Qətrə-qətrə işıqlanır...
-Prometeydən pay aldığın o od ilə, axı, bir gün
Cordanonu yandıran da sən özündün.
Qorxum budur, o od ilə
Özünü də yandırasan
Aman, insan, dayan, insan.

*Avqust, 1970*

## EKSPONAT ADAM

–Ayrı cür yaşadıq biz ömrümüzü,
Adamlar korlanır, vallah, günbəgün.
Bizim vaxtımızda böyüyün sözü
Bir qanun olardı kiçiklər üçün.
Biz hara gedirik deyən yoxdu bir,
Nə kiçik tanınır, nə böyük indi.
Hərənin ağzından bir avaz gəlir, –
Deyə səhər–axşam o, hey deyindi...

Düzü beləsiylə danışmaq çətin,
Əsnədim,
Adamın yuxusu gəlir.
Özü muzeylərin eksponatı,
Sözündən naftalin qoxusu gəlir.
İstəyi budur ki,
o, həyata yox,
Gərək həyat ona bü gün saz gələ.
İstəyi, məsləki tutuquşuluq,
Hamının ağzından bir avaz gələ.

Ona deyən yoxdur, çal ağlar neyi
Zurnanın yerinə...
Görək nə çıxar?
Hər səsin öz yeri, öz gözəlliyi,
Axı, hər avazın öz xəyalı var.

Hamı bir nəfərmi, hamı birmi ki,
Hamının çəkisi düz, taraz gələ?
Hamı bir–birinə bənzəyirmi ki,
Hamının ağzından bir avaz gələ?

Sən niyə qorxursan,
Axı, sən niyə
Səslərin, sözlərin əlvanlığından?
Niyə məftun olaq bir gözəlliyə?

Min-min gözəlliklə doluykən cahan...
Xoruzun bir səsi, bir nəğməsi var.
Banlar,
Cır səsiylə qulaq dırmalar.
Neçə zənguləli, neçə nəğməli,
Bülbül cəh-cəhinə el heyran qalar.

Düzü, beləsiylə danışmaq çətin.
Əsnədim.
Adamın yuxusu gəlir.
Özü müzeylərin eksponatı,
Sözündən naftalin qoxusu gəlir.

Tarix muzeyində şüşə dolablar,
Dolablar içində
                o saxsı qablar
Muzeydə gözəldir...
                qürrələnirsən.
Ancaq düzü budur, sən heç onları
Əlinə almazsan dükanda görsən.
Sənin fikrin köhnə, ürəyin soyuq.
Yox-yox!
Zamanda yox,
            Günah səndədir.
Saxsının qiyməti, bu günündə yox,
Dünəndən danışan dünənindədir.

Onlar çox gözəldir,
Ancaq bu günün
Çini qablarıyla yarışa bilməz.
Fikri, sənin kimi, dünəndə qalmış,
Bu günlə, sabahla barışa bilməz.

*Noyabr, 1971*

# BABAM, ATAM, MƏN

*“Apollon-8” gəmisi ilə kosmik səyahətim*
*məni bir daha inandırdı ki, biz hamımız*
*balaca bir planetdə yaşayırıq*

***F.Borman***

Babam həyatında yalnız bir kərə
Faytonla Şəkidən Ağdaşa getmiş.
O baxıb uzanan dar gədiklərə,
                    təəccüb etmiş.
-Bu yerlər hamısı padşahındır?
Deyə, faytonçudan o xəbər almış.
Bəlkə də, dünyaya
                    o miskin, fağır
Babamın verdiyi bu, ilk sualmış.
Bir dünya bilirdi Şəkini babam,
                    bu yaşa qədər.
Onun gözlərində dünya bu gündən
Böyüdü, uzandı Ağdaşa qədər.

Səksən verst dağ yolu! Zarafat deyil.
Ən uzun, ən böyük yoldu babamçın.
Şəkidən Ağdaşa uzanan bu yol,
Böyüklük ölçüsü oldu babamçın.

Atamın qəribə adəti vardı:
Məni qollarında atıb-tutardı.
Həm də soruşardı: – De, görək məni,
Nə boyda sevirsən?
Deyərdim: – Səni
Lap bu dünya boyda istəyirəm mən.
Sevgimin böyüklük dərəcəsindən
Atam xoşlanardı.
O, uzun-uzun
Bu sözə gülərdi...

Axı, atamçün
Dünya, böyüklüyün son ölçüsüydü,
Atamın dünyası, dünya özüydü.

Mənimçün?
(Qorxuram xəyalım aza).
Kosmosdan baxıram mən dünyamıza.
Deyirəm: – Nə qədər kiçikmiş cahan.
Axı, mənim dünyam, çıxıb dünyadan.

*1971*

## DAN YERİ

*Son zamanlar ABŞ-da "Başqa cür düşünənlər"in adı "qara siyahıya" düşür. Bu siyahıya düşənlərdən biri də məşhur fizik, "Xalqlar arasında sülhü möhkəmlətmək üçün" beynəlxalq Lenin və Nobel mükafatları laureatı Laynus Polinqdir.*

(***qəzetlərdən***)

-Mənim fikrim,
sənin fikrin,
onun fikri...
Bu nə demək?
Bir ölkənin milyon-milyon vətəndaşı
Başqa-başqa düşünərsə
Bəs hökumət nəyə gərək?
Biz hamımız bir fikrin
bir səsiyik.
Laynus dedi: – Yox, yox, məgər
Biz hamımız bircə rəngli
İnkubator cücəsiyik?
Yoxmu mənim öz varlığım,
öz nəfəsim?
Axı, neçin boğulmalı

mənim sözüm,
mənim səsim?!
Susdurdular dərhal onu –
“Haqq” adından haqq oğlunu.
“FBR”in düzəltdiyi
Müdhiş qara siyahıya
Artırıldı bir nəfər də.
Adlar deyil,
düşüncələr
yanıb susdu.
Susub yandı o dəftərdə.
Hökumətlər cərgəsində
Öz yerin var.
Hidrogenin, atomun var.
Tankların var, topların var.
Nələrin var,
Nələrin var!
Qüdrətini, qüvvətini
Ağır-ağır silahlara sən vermisən
Bəs eyləsə, niyə qorxdun?
Qorxun nədir – bilirmisən?
Ürəyinin ortasından
Bir səs dedi: haqqa sığın!
Sənin qorxun – haqsızlığın!
Atomunla, raketinlə
Sən elə zənn eləmə ki,
Hakimisən yerin,
göyün.
Boş havadır səsin, küyün.
Silahlara arxalanan sənin gücün –
zəifliyin,
acizliyin,
gücsüzlüyün.
Haqqın uzun ipinə bax, o yumaqda
əməllərin
düyün-düyün...
Heç xəbərin yox özündən.

Yarpaqları sol tərəfə əyən külək
sağdan əsir.
Onu soldan axtarma sən.
Orda, burda sən özünü çox öyürsən,
Əslindəsə,
Sən qorxudan uçunursan,
üşüyürsən.
Qorxmadığın bir məmləkət
de, varmı heç?
Belə qanlı silahları olan ölkə
qorxarmı heç?
Sən qorxursan dünən, bu gün.
Min hidrogen bombasından
qorxuludur sənin üçün
qanan bir baş,
yanan ürək!
Sən atomdan qorxmamısan
Bir fikirdən, düşüncədən
qorxduğuntək!
Boyaları həqiqətdən,
Həqiqəti rəzalətdən
Öz gözüylə gördüyünü boş nağıldan
Seçə bilən,
bir ağıldan,
niyə qorxdun?
-Bilmirəm mən!
Əgər o, bir böhtançısa,
yalançısa,
Niyə onun dediyini
Məmləkətdən gizlədirsən?
Niyə onu həbs edirsən?
Milyon-milyon qoşunun var.
O isə tək.
Niyə qorxdun?
Təkbaşına Laynus sənə neyləyəcək?
Dəhşətlidir “qara dəftər” –
Qananların,
haqq oduna yananların

siyahısı!
Başlarını yerə dikib
Qoyun kimi otlayanlar –
Əsarəti hürr sayanlar,
Bu Vətənin hər neməti, sizə ehsan!
Ey Vətənçün alışanlar,
Susmayanlar, danışanlar,
Qismətiniz ölüm, zindan!
Atomun var, raketin var,
Sən qorxursan.
Bu qorxunun ağırlığı
Sənin haqsız işlərinin
Çəkisidir,
dəyəridir.
Üfüqdəki al rəngə bax,
Dan yeridir,
Dan yeridir!

*1972*

## ŞAİRLƏRİ ÖLDÜRÜRLƏR

*Müstəbidlər başa düşmür şairləri. O zaman ki başa düşür, fərman verir ölümünə*

***A.Voznesenski***

Öldürdülər Nerudanı.
Öldürdülər ömrü boyu
Qəm çəkəni, dərd udanı,
Öldürdülər azadlığın nəğməsinə
Nəğməsilə saz tutanı...
Öldürdülər şairləri
Kimisini birdən-birə
Bıçaq ilə,
Güllə ilə.
Kimisini

ürəyinə yeridərək söz zəhərin
gilə-gilə...
Öldürdülər,
hədə ilə,
qorxu ilə,
təhdid ilə...
Öldürürlər şairləri,
qana-qana.
Bilə-bilə.
Şairlərin dillərini bağlayanda
Öldürdülər onları öz əllərilə...
Ürəyini dəlib çıxan
fikirləri demək üçün,
Şair dözər hər zülümə.
Dodağını kilidləmək
Şair üçün bərabərdir
min ölümə!
Öldürürlər şairləri –
Öldürürlər, xəyalları,
fikirləri...
Yox-yox!
Fikir ölə bilməz.
O, şairin özündə yox,
sözündədir.
Ədalətlə cilalanan,
Həqiqətdən qüvvət alan
Qadir sözün qabağında
Güllə nədir,
atom nədir?..
O deyəcək öz sözünü.
Qaynayacaq, o daşacaq,
o coşacaq.
Söz – həmişə
Ədalətin düşmənilə
vuruşacaq!
Söz – yerlərdə sürünməmiş,
Dodaqlarda çiçək açmış.
Doğru sözün qabağında

Yalan sözün rəngi qaçmış.
Söz-nəbzidir,
haqq səsidir zəmanənin,
Aynasıdır zəmanənin.
Ey müstəbid, dünənə yox,
bu günə bax!
Sən aynanı sındırmamış

O aynada
Öz eybəcər üzünə bax!
Yalanların boyasıyla
bəzəsən də üzünü sən,
O aynada görəcəksən
düzünü sən!
Yaxşı görür
Şairlərin iti gözü
Yalan ənlik-kirşanın
Dalındakı murdar üzü!
Haqla-nahaq,
Gerçəkliklə yalançılıq
üzləşdiyi gündən bəri,
Öldürürlər şairləri...
Haqq istəmək,
Düz danışmaq
hələ qalsın bir tərəfə
Göz yaşı da,
hıçqırıq da
Yasaq olan bir ölkədə
Qatı zülmət işıqlıqda,
nur kölgədə...
Buna dözmək?
Necə dözmək?
Xunta qeyri-qanunidir.
Əxlaqsızın törəməsi
bicə dözmək,
Necə dözmək?

*Oktyabr, 1973*

## 50 YAŞIM

Mən necə oldu ki, çatdım əlliyə?
‑Yox, deyə bilmərəm,
Dedilər: – Niyə?
Bir içim su kimi içdim mən onu.
Əllicə an imiş, demə, əlli il.
İllərin nə təhər sovuşduğunu
Bilərək yaşamaq, yaşamaq deyil.

Bilmədim...
Könlümün həyəcanları,
Qovladı bu dağdan o dağa məni.
Ömrün arzu dolu pilləkanları
Uçurdu budaqdan‑budağa məni.

Gün doğdu...
Həvəslə,
Yanan ürəklə
Çalışdım, vuruşdum...
Gün axşam oldu.
İli qarşıladım təzə diləklə,
Bir də ayıldım ki, il tamam oldu.

Yol getdim...
Saymadım yağışı, qarı.
"Məqsədə tələsən dincəlməz" – dedim.
Yanımdan ötüşdü verst ağacları,
Macalım olmadı, saya bilmədim.

Elə qanadlandım,
Mən elə uçdum,
Sürətim döndərdi ayı həftəyə.
Arzular ardınca göylərə uçdum,
Yerin təqvimləri yaramır göyə.

Zəhər də içmişəm, bal da yemişəm.
Ömrümün yolları min keşməkeşdə.
Mən vaxtı heç zaman gözləməmişəm,
Vaxt özü qapımı döyüb həmişə.

Məni yaşadan da təlatüm oldu,
Dalğalar qoynunda ötdü anlarım.
Mənim zaman ölçüm, vaxt ölçüm oldu,
Ölçüyə gəlməyən həyəcanlarım.

Mühit dənizidir önümdə masa,
Ləpədir ömrümün hər anı, qardaş.
Dalğalar ürəkdə baş qaldırmasa,
Həyatda axtarma dalğanı, qardaş.

Yaşadım, bildirib vaxta həddini
Dəli dalğaları mən yara-yara.
Yaşadım...
Eşq olsun vaxtın həddini
Özünə sığdıran çırpıntılara!

Zirvədən ötübdür, döşə qar yağır,
Yel əsir,
qapını qış döyür...
Nə qəm.
Əllimi xərclədim...
Xoşbəxtliyimdir,
Neçəm qaldığını deyə bilmərəm.

Gah müdrik qocayam, cah cavanam mən,
Yadıma salıram gah da ilkimi.
Könlümə sığmayan təlatümümdən
Yaşadım əllimi bircə il kimi.

*1975*

## QOCALAR

Çənə əl üstündə, əl çomaq üstə
Qocalar əyləşir tin başlarında.
Sinə bayatılı, könül şikəstə,
Ömür varaqlanır yaddaşlarında.

Yaşıdlar köç edib, cavanlar işdə
Tək-tənha oturmaq son əlacları.
Həyatın amansız yalqızlığında
Tutur əllərindən əl ağacları.
Yumub gözlərini düşünür onlar.
Durur göz önündə ötən zamanlar.

Yerdə çuxur açır çomağın ucu,
Sonuncu həddinə dirənib ömür.
Dünyadan aldığı, dünyaya borcu
Nəymiş?
            Düşüncənin sonu görünmür.

Çomağın ucuna dikib gözünü,
Onlar saatlarla oturar belə.
Fikir bir gəmi ki, bilinmir yönü,
Çırpınır, çıxammır ancaq sahilə.

Onlar düşündükcə boşalar, dolar.
Birdən düyün düşər fikrin əvvəli.
Doqqazlar başında bizim qocalar
Düşüncə heykəli, fikir heykəli!

Əvvəllər deyərdim, onlar bu qədər
Bekarca oturub darıxmır məgər?
Kitab oxuyardım darıxmamqçün
Onların yerinə olsaydım əgər.

Bir qalın kitabmış hər ömür, demə,
Oxumaq istəsən, yum gözlərini.

Bukar deyilmişlər...
Ürəklərində
Onlar oxuyurmuş öz-özlərini.

*Yanvar, 1976, Ağdaş*

## TƏSKİNLİK

İlləri dən kimi zaman üyütdü,
Ocaq heydən düşüb, köz qaralıbdır.
Ömrün yayı keçdi, baharı ötdü,
Ömrün iztirablı qışı qalıbdır.
Onu da bilmirəm, qalıb, qalmayıb?
Bəlkə köçəcəyəm qışa çatmamış.
Amma həyat eşqi heç azalmayıb,
Köçmək istəmirəm qışı dadmamış...

Fəsillər gözəli – bahardı, yaydı.
Qış – əzab fəslidir...
Barı – şaxta, qar.
Ömrün dadı-duzu arxada qaldı,
Öndə əzabım var, iztirabım var.

Vaxt boyu kiçiltdi, yaşı böyütdü,
Zaman verdiyini birbəbir alar.
Başımın üstündən ötdü, nə ötdü
İllərin köç edən səfi – durnalar.

Gözümə tor gəlir... Belədi gərdiş.
Başıma gələnlər qədərdən gəlib.
Demirəm, gözlərim toran gətirmiş,
Deyirəm, havaya duman, çən gəlib.

Ağlımla hər şeyi görürəm, nə qəm,
Baxmadan seçirəm qaradan ağı.
Baxıram, yaxını görə bilmirəm,
Uzağı görürəm, ancaq uzağı.

Dəmdən düşdüyümü bildirməsəm də,
Zaman öz işində, öz işindədir.
"Hiss edə bilmirəm yaşı" – desəm də,
Bilirəm yaş nədir, ömür, gün nədir?..

Mənim öz məclisim, mənim öz yerim,
Çılğın duyğulardan yaşım çəkindi.
Gözəl qız görəndə yanan gözlərim
Oğluma gözaltı axtarır indi.
Bəs bu nə sövdadır, bəs bu nə həvəs?
Ölümü özümdən gen sayıram mən.
Cavanlar yanında bu nədəndi bəs
Yaşımı deməyə utanıram mən?

Ürək bu dünyadan küsdü, incidi,
Yaşımı birisi salırkən yada.
Dünya uşaq idi, dünya gənc idi,
Mənimlə bərabər qocalır o da.

Ayları, illəri çəkdim tarıma,
Yoxsa bezdirmişəm qoca dünyanı?
Yaşımı artırıb həmyaşlarıma
Uşaq tək baxdığım günlərim hanı?

Özümdən irəli baxırdım onda,
İndi arxadadır qəsdim, gümanım.
Dumanlı xatirə yağışlarında
İslanır ürəyim, islanır canım.

Kədərli anlarda anıram hərdən
Kimlər gəlib keçdi, dünyadan kimlər?
Bu, niyə belədir?
                    Yaşlaşdıqca mən
Oyanır ruhumda çox-çox qədimlər...

Atam, babam girir yuxuma tez-tez,
Andıqca rəngbərəng əməllərimi.
Yuxumda atamla atam kimi yox,
İndi danışıram həmyaşım kimi...

Nədir bu təlaşlar, heç sorma, könlüm,
Üzməsin bu yolda kədər, qəm səni.
İtən gəncliyini axtarma, könlüm,
Axtarsan, qorxuram itirəm səni.

Təzə pöhrələrə o məğrur günəş
Verib istisini qüruba endi.
Mənim itirdiyim o od, o atəş
Oğlumun gözündə alışır indi.
Dünya təzələnsin! Görüşüb qışla,
Bu haqqı həm bilən, həm danan mənəm.
Köhnə dünyamıza təzə baxışla
Övladlar gözündən boylanan mənəm.

*İyul, 1978*

## TAPMAQ – İTİRMƏK

Bir eniş var
            sonunda
Hər dikin,
Hər yoxuşun.
Yerə bir enmək də var
Uçuşunda hər quşun...
Bu yollar dolay-dolay,
Fikirlər qoşun-qoşun.

Dolaşırıq dünyanı
Əldə dəmir bir əsa,
Ayaqda dəmir çarıq.
Biz tapdıqca itirir,
İtirdikcə tapırıq.

Həvəsimiz, meylimiz
Gah suyadır, gah oda.
Tapdığımız qədər də
İtiririk dünyada.

Sonda sevincə dönür
Çəkdiyimiz əzablar.
Uduzduğum – ömürdür,
Qazandığım – kitablar.

Nehrəni çalxamadan
Süd də dönüb yağ olmur.
Nəyisə itirmədən
Nəyisə tapmaq olmur.
Hər gəliri-çıxarı
Çəkir mizan –tərəzi.
Hər əyləncə, hər səfa
Bir cəfanın əvəzi!
Qazancın iki ucu:
Həm xeyri, həm bəlası –
Yollardakı qəzalar
Sürətin öz bahası...
Nağıl döndü gerçəyə:
Bu məqamda biz artıq
Sürəti yox,
əyləci
Tapana minnətdarıq.

Hara gedir bu sürət –
Hara gedir bu gərdiş?
Bizim yaratdığımız
Bizə qənim kəsilmiş.

İztirabsız bir fərəh,
Əziyyətsiz bəhər yox.
Həyatın qiymətini
Ölümlərə borcluyuq.

Könül duymaz sevinci
Ona zülüm olmasa.
Həyat bizi bezdirər
Əgər ölüm olmasa.

Həvəsimiz, meylimiz
Gah suyadır, gah oda.
Tapdığımız qədər də
İtiririk dünyada.

*İyul, 1980*

## CAVAB

*İranda Azərbaycan xalqının milli varlığını danan, xalqımızı farslardan dönmə hesab edən "alimlər" peyda olmuşlar. Bunlardan biri də milliyyətcə azərbaycanlı olan Yəhya Zəkadır.*

Özgə qapısına daş atan – azğın,
Sən özgə daşını özünə atdın.
Özgəyə qənimi çox eşitmişik,
Özünə qənimi sənmi yaratdın?

Nədir bu böhtanlar, bu uydurmalar?
Fitnə kökündədir çaldığın bu saz.
Siyasət fitinə könülsüz, naçar
Zaman oynasa da, tarix oynamaz.

Zamanın süzgəci narından narın,
Keçirir hər sözü neçə ələkdən.
Özünə qalacaq uydurmaların,
Gördünmü zir-zibil keçə ələkdən?

Mən yaxşı bilirəm məqsədin nədir,
Uydurma tarixin məramı nəymiş.
Nəsimi, Füzuli, Xətai, Sabir
Səncə, Firdovsinin yetimləriymiş.

Sənin şanın hanı, şərəfin hanı?
Əyilmə özgəyə öz mənzilində.
Nənən bayatını, anan laylanı
Niyə çağırmadı bəs fars dilində?

Altay dağlarını baban aşanda,
Ağan bu cürəti heç danmamışdı.
Qorqud öz dilində nəğmə qoşanda
Sədinin qəzəli yaranmamışdı.
Tarixlər yaradıb tarixdən qədim
Bu xalqın qılıncı,
Bu xalqın sözü.
Bəs necə oldu ki, ey dönük alim,
Biz olduq özgənin tör-töküntüsü?

Cırtdan nağılını danışdı nənən,
Bu nağıl qanana ibrətdir bu gün.
Divə əyilmədi Cırtdan...
Amma sən
Qarğa qabağında sərçəyə döndün.

Ey sözündən əmin, özündən razı,
Yalanı söylədin kimin adından?
Ananın laylası, atanın sazı,
Babanın ocağı çıxdı yadından?

Anan duasında dedi: "Ya Allah,
Balamın həmişə üzü ağ olsun.
Elə yaşasın ki, el ona pənah,
O da el-obaya bir dayaq olsun".

Dayaq olmalıykən öz elinə sən,
Elin kürəyində bir bıçaq oldun.
Sən igid olmalı, ər olmalıykən,
Özgənin əlində oyuncaq oldun.

Bu halda sən kimsən, nəçisən, düşün,
Xalqının başında özgə yumruğu!
Ömrünü-gününü qoltuqda sürdün,
Səni isitdimi özgə qoltuğu?
Su tököb özgənin dəyirmanına,
Özün inandınmı öz yalanına?

Çəkdiyin boyalar pozuldu yenə,
Yağanda zamanın gur yağışları.
Tarix sillə kimi çəkdi üzünə
Özgədən aldığın o alqışları.

Özgənin şoruna sən qaymaq deyib,
Demə öz südünə bulama, Yəhya,
Sən bu gün tüpürüb öz boşqabına,
Özgə boşqabını yalama, Yəhya!

De, hardan öyrəndin sən bu oyunu?
Qamış tapılmadı ölçəm boyunu.
Sən öz bostanının kəsib suyunu,
Özgə bostanını sulama, Yəhya.

Onsuz da özgəyə sən yadsan, oyan,
Canını versən də boyatsan, oyan.
Sən onun əlində alətsən, oyan,
Özünü özgəyə calama, Yəhya!

Ağan hökm elədi... haqq bildin onu,
Yerinə yetirdin hər buyruğunu.
Söyüb öz dədəni, sən quyruğunu
Özgənin önündə bulama, Yəhya!

Sən ki, inanansan Allaha, dinə,
Bəs bu nə lotuluq, bəs bu nə fitnə?
Sən öz çirkabına,üfunətinə
Gəl, bu boyda xalqı bulama, Yəhya!
Qatma yad mayası sən öz nehrənə,
Söymə təndirinə, söymə təhnənə.
Özgə məhləsindən sən öz məhlənə
Belə cani-dildən ulama, Yəhya!

*1984*

## LƏZZƏTİ – AĞRISI

Gülün ləçəyində od varaq-varaq,
Bilmirik hardandır bu rəng, bu ətir.
Gül də iztirabdan doğulur, ancaq
Rəngi də, ətri də yanmaqdan gəlir.

Yanır önümüzdə ocaq gürhagur,
Biz də qızınırıq alışan oda.
Bilmirik, ağacın can ağrısıdır
Alışan kösöyün alovları da.

Oturub evində yalnız həzz üçün
Şerimi oxuyan oxucum,
                                        Düşün!
Sənin ürəyinə istilik verən
Bu duyğu, bu alov hardandır, görən?
Düşün, sən düşün!
Ətrimi iylədin, rəngimi gördün.
“Gözəldir” – dedin!
Ancaq bilmədin,
O rəng, o ətir
Böyük bir yanğıdan bircə qətrədir.
Oxu dərin dərin, duy dərin-dərin,
Ey mənim könlümü təftiş edənim.
Duysan, bilərsən ki, bu şeirlərin
Ləzzəti sənindir, ağrısı mənim.

*İyul, 1982*

## OXUCU MƏKTUBU

Məktublar alıram oxuculardan,
Məktublar nur dolu, təşəkkür dolu.
Bir bələdçi olub mənə çox zaman,
Göstərir haqq yolu, doğru-düz yolu.
Oxucu məktubu! Şirindən şirin

Könlümə dayaqdır onun hər biri.
Dedi bu məktublar
                    Tənqidçilərin
Deyə bilmədiyi çox mətləbləri.

Oxucu məktubu! Möhtacam mən də
Sənin könül açan sözünə hər gün.
Bəzən öz-özümdən şübhələnəndə,
İnamsız qəlbimdə inama döndün.

Oxucu məktubu!
                    Düşünənlərin
Könül hıçqırığı, ürək nidası!
Yazdığım nəğmənin, yazdığım şeirin
Bir müddət sonrakı əks-sədası!
Səndən ey oxucum, çox bilmirəm mən,
Məqsədim deyildir dərs vermək sənə.
Məqsədim – qəlbimdə alışan oddan
Atəş çiləməkdir sənin qəlbinə.

Həqiqət naminə yaşayanların
Qəlbində alışar, döyünər bu od.
Yoxu var,
          əyrini düz sayanların
Könlündə köz tutmaz, tez sönər bu od.
Bu od əmanətdir Nəsimilərdən,
Şairlər qoruyub yaşatmış onu.
Bu odun nuruyla hər xalq, hər vətən
Açmış həqiqətin, haqqın yolunu.
Bu odun istisi yaşatmış bizi,
Zülmətdən keçirmiş mənliyimizi.

Günəş alışmasa, gün doğmaz yəqin.
Həqiqət görünməz!
                         həqiqət budur!
Bir xalqın sağlığı – şairlərinin
Alışıb yandığı oda borcludur.

Şair – od qaynağı, şeir – güllədir.
Barıtsız şeirə şeir deyilməz.
Şairi olmayan bir xalq kütlədir,
Amalsız bir kütlə xalq ola bilməz.

Oxucu məktubu! Düşünənlərin
Könül hıçqırığı, ürək nidası.
Yazdığım nəğmənin, qoşduğum şeirin,
Bir müddət sonrakı əks-sədası!

Mən tək, siz çoxsunuz...
hər birinizə
Cavab yazammıram...
Ancaq mən sizə
Borclu da qalmıram,
Ürək sözlərim
Kağızlar üstündə şırım-şırımdır.
Ünvanı siz olan mənim hər şeirim
Sizə göndərdiyim məktublarımdır.

*İyul, 1981*

## VAXT

Uşaqlığım,
Gəncliyim,
ahıllığım – eynimi?!
Yox, hər biri başqadır, bir-birinə yad kimi
Gələn qovur gedəni.
İnkar edir mən, məni...
Ömrün hər pilləsində başqalaşır təbimiz,
Dünyada məqsədimiz, dünyadan tələbimiz.
Vaxt məni pərvanətək başına dolandırır,
Dünən qanmadığımı bu gün mənə qandırır.

Kim döşünə döyər ki,
Mən vahidəm, mən birəm!
Bircə bunu bilirəm: mən güclüyəm, qadirəm.

Mən gücsüzəm, acizəm təkcə vaxtın əlində.
Ömrün o sahilinə əlim yetə bilməyir
Ömrün bu sahilində.

Hanı gözümün nuru,
Hanı qəlbimin qoru?
Kimdir udan, uduzan zaman ilə arzunun
əbədi yarışında?!
Saçımın ağlığında, alnımın qırışında
Zaman necə at çapır, yüyəni öz əlində.
Oğulsansa, tap görək, kimdir atın belində!
Mən öz azadlığıma tanrı dedim, haqq dedim
Bir hökmə, bir fərmana mən başımı
əymədim.
Amma vaxtın dalınca
Ömrüm boyu qul kimi necə sürünmüşəm mən,
Qolumdakı saatın quluna dönmüşəm mən.

*1985*

## LAYİQƏMMİ MƏN?

Atalar sözləri öyüddür bizə
Yüz illər, min illər deyiləcəkdir.
"Elə yaxşılığı, sən at dənizə,
Balıq bilməsə də, xalq biləcəkdir".

Mən xaliq demədim,
Xalq dedim...
Nədən?
Xalqımdır, elimdir xaliqim mənim.
Onun dostlarına dost demişəm mən,
Onun düşmənidir, mənim düşmənim.

İşıqsız, qapalı bir göz, de, gözmü?
Yaşamaz sünbüldən düşən dən, ayrı...

Xalqın zərrəsiyəm...
                                        heç gördünüzmü
Bir zərrə yaşasın kütlədən ayrı?

Sənsən qüvvət verən sətirlərimə,
Sənsiz özüm də heç, sözüm də hədər.
Damla zəhmətimə, zərrə şeirimə,
Sənsən qiymət verən dəryalar qədər.

Baxdın şairinə bir örnək kimi,
Dikdin üzümüzə baxışlarını.
Biz hara getdiksə,
                                Gül-çiçək kimi,
Səpdin başımıza alqışlarını.

Sevgin gözlərində bizi böyütdü,
Öyündün bizimlə, ey xalq, ey Vətən!
Həmişə qəlbimdən bir sual ötdü:
Sənin hörmətinə layiqəmmi mən?
Onu bilirəm ki, sən elə sənsən,
Gücüm də səndədir, səadətim də.
Yaxşını yamandan yaxşı seçənsən,
Sənə bənzəyəydim dəyanətimdə.

Onu bilirəm ki, öz tanrım kimi
Həmişə fikrimdə, ürəyimdəsən.
Onu bilirəm ki, şeirlərimi
Yazan mən oldumsa, yazdıran sənsən.

Xalqa arxalanan xalqsevərlərin
Özü də xalq üçün arxaya döndü.
Xalqa arxasını çevirənlərin
Arxası həmişə yerdə süründü.

Tanıtdın adınla övladlarını,
Uçdular qırılmaz qanadlarınla.
Xalqlar cərgəsində dönüb özün də
Tanındın namuslu övladlarınla...

Hər bir övladının qələbəsindən
Boy alıb ömrünə gün qazanmısan.
Ürəyi ürəklə qarşıladın sən,
Sənə qul olanı allah sanmısan.

Sevgin gözlərində bizi böyütdü,
Öyündün bizimlə, ey xalq, ey Vətən!
Həmişə qəlbimdən bir sual ötdü:
Sənin hörmətinə layiqəmmi mən?

*1974*

## XATALI YUXU

Adların üstünə adlar calandı,
Bu nədir?!
Gözlərim alacalandı.
Şöhrət cədvəlində ad böyüdükcə
İstedad büküldü, balacalandı.

Xatalı yuxudur şöhrət yuxusu,
Canıma od saldı onun qorxusu.
Bu yuxuya uyan yatar, oyanmaz.
Dəbdəbə axtarar, təmtəraq gəzər,
Sürət qatarına necə də bənzər,
Kiçik obalardan ötər, dayanmaz.
Ancaq qulaqlarda qalar fit səsi.
Amandır, qorxuram, şöhrət zirvəsi
Razılıq təxtinə qaldıra məni.
Zirvə saymamışam, mən bir zirvəni.

Hara tələsirsən, dayan, ey qatar,
Ayağım altından torpaq qaçmasın.
Böyüklü, kiçikli ellər, obalar
Olarmı şairə könül açmasın!

Ağrıdan, acıdan yaranır əsər,
Ölər yaşanmamış söz bələyində.
Bitməmiş,
            bitəmməz böyük bir əsər
Özündən razılıq kölgəliyində.

Şöhrətin yükünü düşündünmü bəs?!
Min şöhrət bir borcu ödəyə bilməz.
Qorxum ondandır ki,
                        ömrün qışında
Bahar çiçəkləri üzə gülməsin.
Sənətlə şöhrətin bu yarışında
Şerim şöhrətimə çata bilməsin.
Min şöhrət yaradır bəzən bir şeir,
Min şöhrət bir şeiri yarada bilmir.
Sənəti şöhrətə yedək olanlar
Sonsuz olduğunu gorunda anlar.

Rahatlıq gəldimi,
                Könül dincələr,
Xəzanı gəlməmiş susar söz bağım.
Bütün bu fikirlər, bu düşüncələr –
Özümün özümə xəbərdarlığım!

*1984*

## XEYİR – ŞƏR

Təbiət insana iki əl verib,
Kiminsə əlindən tutub qaldıraq.
Bizə əməl üçün bir ağıl verib,
Çayların üstündən körpülər quraq.
Anamız, atamız bizə dil verib,
Darda çırpınanın halını soraq.

Dillər yaranıb ki, mahnı deyək biz,
Dillər yaranmayıb yalan deməkçün.
Mahnıda birləşir hisslərimiz,
Yalanda ayrılır yollar büsbütün.

O əli, o dili, o ağlı bəzən
Xeyirli işlərə işlətmirik biz.
Bu günə dəm tutan əməlimizdən
Suala çevrilir gələcəyimiz.

Hər duyan ürəkdən bir cahan keçir,
Əlvan boyalıdır dünyanın donu.
Kimi xalq yolunda canından keçir,
Kimi vəzifəyə satır xalqını.

Xalq var, özü odsuz, ocaqsız qalır,
Odundan qonşuya pay verir özü.
Xalq da var, o odu əvəzsiz alır,
Qonşu torpağına dikilir gözü.

Vicdanın güvəsi – tamah dağını,
Aşa bilənlərə insan dedik biz.
Yalandan, riyadan qazandığını
Vicdansız gerçəkdən qazana bilməz.
Min bir rəng yetirir bir rəngdə torpaq,
Həm şəfa, həm ölüm yatır zəhərdə.
Kol-kos da bitirir, çiçək də torpaq,
Ağlın meyvəsidir xeyir də, şər də.

Yaxşı da, yaman da bizdədir deyin,
Nə onun, nə bunun öz odu yoxmuş.
Xeyir-şər qol-qola! Nə yüksəkliyin,
Nə də alçaqlığın hüdudu yoxmuş.

Böyük bir millətin taleyi bəzən
Tum kimi çırtdanıb tüpürülürkən,
Məəttəl qalırsan şərin hökmünə.
Baxırsan arxaya, baxırsan önə
Nələr törəyərmiş qərəzdən, kindən.
Deyirsən, insanın hafizəsindən
Həqiqət silinib unudularmış.
Xeyir də bu qədər məhkum olarmış?

Qoy nağıl oxusun siyasətçilər,
Onların qəlbinə nağıl nur çilər.
Nağıl dinləyənin fikri ucalır,
Xəyaldan yol açır o, həqiqətə.
Həmişə nağılda qələbə çalır,
Həqiqət yalana, işıq zülmətə.

*Mart-avqust, 1986*

## TAMAH – LƏYAQƏT

### 1

Nəfsinə qul olsan... Nə deyim sənə?
Ağlına güvənmə, güvən mədənə.
Adın insan olar, özün böcəksən,
Boyundan yüz dəfə kiçiləcəksən.
Dünyanı udsan da, doymaz gözlərin
Dibi görünməyən quyudur tamah.
Adəmdən Hatəmə dəyirman təkin
Nə töksən,
      əridir,
            üyüdür tamah.
Özünü yüz dəfə kiçildib, amma
Mədəni yüz misli böyüdür tamah.

İnsan dərk edirsə bu gerçəkləri,
Onun zatındakı tamah bəs nədir?
Cənnəti almaya satandan bəri
Tamah, ləyaqətlə bəhsəbəhsdədir.

Nəfsinə uyanın
            dövri – qədimdən
Həmişə silahı xəyanət oldu.
Bu da qəribədir,
            Bəs, neçin, görən,

Tamahın qurbanı ləyaqət oldu?
Ağlı mədəsindən xırda gədələr
Dünyanı yedirdi öz niyyətinə.
Kəsib tamahından ulu dədələr
Caladı həmişə ləyaqətinə.

Alçalda-alçalda şəxsiyyətini
heç olur
      Şərdən də xeyir güdənlər.
Ac qalar, alçaltmaz,
            ləyaqətini
tamah qılıncına qalxan edənlər.

Acgöz "qazancında" yenə uduzdu
Çünki o pozdu –
Tamahla ləyaqət arasındakı
Nazik xətləri.
O, görə bilmədi adi bir korun
Yaxşıca gördüyü həqiqətləri...
Sərvətə qul olan bir rüşvətxorun
Xəlvət qazandığı var-dövlət oldu,
Aşkar itirdiyi ləyaqət oldu.

**2**

Meymun – ləyaqətin insan övladı.
Ləyaqət – insanın ikinci adı.
Ləyaqət – insana ən doğru ünvan.
İnsan bu ad ilə dördayaqlıdan
İki ayaqlıya bir tarix keçdi.
İnsan qətrə – qətrə insanilәşdi
Yalnız öz insanlıq ləyaqətilə...
Qazandıq bu adı biz gilə-gilə.
İndi ləyaqətlə qazandığımız
İnsanlıq adını itirəkmi biz?

*Oktyabr, 1985*

## AXI, DÜNYA FIRLANIR...

Vaxtın dəyirmanında daş əridi, qum oldu,
Tarixə atdığımız qayıtdı, lüzum oldu.
Dünənin həqiqəti bu gün tərs yozum oldu,
Niyə də yozulmasın, axı, dünya fırlanır.

Çox ovlaqlar içində çox ovları ovladım,
Aşıb – daşan arzumu mən artıq cilovladım.
Mən atamı ötmüşəm, məni ötür övladım,
Bu, belə də olmalı, axı, dünya fırlanır.

Dünən düz sandığımı bu gün əyri sanıram,
Bəzən olur, özümdən özüm oğurlanıram.
Hər il başqa arzunun başına fırlanıram,
Niyə də fırlanmayım, axı, dünya fırlanır...

Çox əyilən görmüşəm, əyilməyən başları,
Sular duruldu, gördük dibindəki daşları.
Ünvanını dəyişdi dünənin alqışları
Niyə də dəyişməsin, axı, dünya fırlanır.

Necə dönür bu dövran, necə dönür bu gərdiş,
Tazıların üstünə dovşanlar da gülərmiş.
Dünya bina olandan hər şey dəyişilərmiş,
Dəyişməsin neyləsin, axı, dünya fırlanır.

Əbədini dünyada mən əbədi sanmadım,
Bir atəşə tutuşdum, min atəşə yanmadım.
Bütlər gəldi və getdi, birinə inanmadım,
Niyə inanmalıyam, axı, dünya fırlanır.

Fırlandıqca bu dünya, yox da dönüb var olur,
Quruyan çeşmələrdən sular yenə car olur.
Bu dünyanın xeyri də, şəri də təkrar olur,
Niyə təkrar olmasın? Axı, dünya fırlanır.

Min-min illər bu dünya beləcə fırlansa da,
Bir yuvanın bülbülü min budağa qonsa da,
Aylar, illər, fəsillər bir-birini dansa da,
Dəyişməzdir əqidəm, çox da dünya fırlanır.

Nə qədər istəyirsə, min o qədər fırlana,
Qarşıma gah şər çıxa, gah xeyir dığırlana,
Çərxi fələk istəyir, lap dolana tərsinə,
Əqidəmi heç nəyə dəyişmərəm mən yenə.

*Oktyabr, 1985*

## İKİ MÜHACİR

*Öz Vətəninə mənsub olmayan şəxs insanlığa da mənsub deyildir.*
***V.Q.Belinski***

Dərd var ki, bənzəmir heç hansı dərdə
Gəzdiyim, gördüyüm yad ölkələrdə
Vətənçin burnunun ucu göynəyən
Adamlar görmüşəm nə qədər desən.
Bu vətən nisgilli mühacirlərin
Acı taleyinə acımışam mən,
Bəzən aşkar-aşkar, bəzən gizlicə...
Vətənə uçurlar onlar hər gecə
Min rəngli qanadlı yuxularında.
Qəriblik – Elə bir dərd ki, çəkilməz.
Balıq balıqdır ki, yad sularında
Yaşaya bilsə də, böyüyə bilməz.

Ulu keçmişimiz... həm qılınc, həm qın
Bizim həm xeyrimiz, həm şərimizdir.
Türbə qəbirləri əcdadımızın –
Torpağa işləyən köklərimizdir.
Bu kökün üstündə dayanmayan kəs
Yaşayar,
    bir boy da ucala bilməz.
İmkan dənizində üzə bilsə də,
Fərəhdən bir çimdik pay ala bilməz.
Bir doğma anaya min ögey ana
Tay ola bilərmi?
Ögey – göz dağı!
Kim deyir eynidir, eyni insana

Vətən torpağıyla qürbət torpağı?
Min dəfə güclüdür öz imkanından
Vətən torpağının üstündə insan!
Bir Vətən həsrəti – bir ulu nisgil!
Vətənsiz yaşamaq – yaşamaq deyil.
Vətəndən kənarda yaşayanlara
Mühacir demişik... lap doğru, lap düz!
Vətənin içində yaşayıb, ancaq
Özünü Vətənə yad sayanlara,
Özgə məbədinə baş qoyanlara
Nə ad verək biz?

Adam tanıyıram, yuxularında
Üzər balıq kimi yad sularında.
Uçar Nyu-Yorka, uçar Londona,
Mənəvi mühacir deyərdim ona!

O, elin içində elinə özgə,
Tarixinə özgə, dilinə özgə,
Havasına özgə, suyuna özgə,
Əcdaddan baş olan soyuna özgə,
Doğma ocağına, közünə özgə,
Özü də bilmədən özünə özgə,
özgəyə doğma,
Vətəndən savayı hər şeyə doğma.

Qürbət çörəyini yeyər mühacir
Vətən havasıyla yaşayar ancaq.
Ölürkən... Dizinə döyər mühacir,
İstəyi – Vətəndən bir ovuc torpaq.
Mənəvi mühacir Vətənə deyil,
Güvənər həmişə ancaq özünə.
Vətən çörəyini təpər gözünə
Özgə havasıyla yaşayar müdam.
O da bir adamdır, bu da bir adam.
O da mühacirdir, bu da mühacir.
Biri torpaq istər, biri cəvahir,
Biri insan isə... o biri tacir!

*1986*

## QANMAQ – QANMAMAQ

Bütün ömrüm boyu arılar kimi
Qəzetdən, kitabdan mən şirə çəkdim.
Bilməyə çalışdım bilmədiyimi,
Bunu bilmədim ki, mən bilməsəydim,
Nəyi uduzacaq, itirəcəydim?
Qazancım nə oldu,
İtirdiyim nə?
Qazancım dəyərmi itirdiyimə?

Qanmazın qandığı bir şey var ancaq:
Özünü hər yerdə düz, doğru saymaq!
O, elə bilir ki, səhv edə bilməz,
Bir müşkül önündə ağlı yenilməz.
Onun əməlində olmaz bir "xəta",
Ondan ağıllısı yox bu dünyada.

Qandınsa... şübhələr və tərəddüdlər
Ömrünün peykinə dönəcək sənin.
Qandınsa... qəlbində dil açan kədər
Əzmini, eşqini yenəcək sənin.
Qananlar uduzur batıb dərində,
Qananlar uduzur şübhələrində –
Bağrına çəkilən qanma dağından.
Qanmazlar qazanır qanmadığından.
Qandıqca... özümlə durdum üz-üzə
O da mən,
Bu da mən.
Kimə haqq verim?
Möcüzə içində başqa möcüzə.
Nə hakim bəllidir, nə də müttəhim.
Kaş, qanmayaydım
Özümlə üz-üzə dayanmayaydım.

*Fevral, 1985*

## SEVİNCİN ZİRVƏSİ, DƏRDİN ZİRVƏSİ

*Köhnə dostum M.Sadıq müəllimə*

Qarışıb dünyanın yaxşı-yamanı,
Əzabı, ləzzəti, sevinci, qəmi.
Göründüyü kimi gördüm dünyanı,
Çox vaxt görəmmədim olduğu kimi.

Gəldim dünya ilə çox vaxt döş-döşə,
Bəzən ala bildim öz istəyimi.
Həyat qurtarardı,
əgər həmişə
Dünya görünsəydi olduğu kimi.

Dünya çalın-çarpaz dağlayan kəsi
Özgəsinə sevinc paylayan gördüm.
Ən böyük sevincdə ağlayan kəsi
Dərddə qol götürüb oynayan gördüm.

Arzu tənliyində, hiss tənliyində,
Tutur ağ qaranı,
Bəm səs zil səsi.
Birləşir duyğunun dərinliyində
Sevincin zirvəsi, dərdin zirvəsi.
Ey könül, dünyadan nə küs, nə inci,
Sevincdə qəmi gör, qəmdə sevinci.

*Mart, 1986.*

## UNUTQANLIQ

*"Yadımıza belə gətirməzdik ki, ermənilər çox-çox əvvəl… hazırladıqları hədsiz-hesabsız bombaların hamısını bizim başımızda partladacaqmış…*
*Bu sadədilliyimiz səbəbilə cümləmiz qonşu ermənilərlə yenə qədim sayaq üzrə sülhanə rəftar edib*

*rahat və arxayın olmağı vəz və bəyan edirdik və bu surətlə millətimizin gözünü bağlayıb…uçuruma sarı hazırlayırdıq. İndi lazımdır ki, bunlardan ibrət alıb gələcəkdə aldanmamağa çalışaq".*

***Ömər Faiq Nemanzadə***
*1906-cı il*

Ömər bəy, hər sözün haydı, haraydı,
Deyilib elə bil, bu çağımızda.
Sənin bu fəryadın sırğa olaydı,
Daim səslənəydi qulağımızda.

Əsrin əvvəlini unutmuşuq biz,
Saldın yadımıza dünənimizi.
Sadəqəlbliyimiz, təmizliyimiz
Tarixdə nə qədər aldatmış bizi.

…Erməni zülmündən yüz ildən bəri
Daşdan-daşa dəydi bu xalqın başı.
Unutdu çəkdiyi müsibətləri,
Niyə oğurlandı onun yaddaşı!

Biz başdan-ayağa rəhmik, şəfqətik,
O, kin dağarcığı, o, goreşəndir.
Biz əvvəl insanıq, sonra millətik,
O, insan olmadan millətləşəndir.

Bilirik, tutulub o, yaman dərdə,
Qəlbində həmişə kin əzizləyir.
Elə unuduruq, dar döngələrdə,
O, bizi vurmağa məqam gözləyir.

Bilmədik, içini gəmirir bu kin,
Sözü keçməyəndə üzdən həlimdir.
Unutduq, nifrətlə mayalanmışın
Fikri – intiqamdır, qəsdi – zülmdür.

Mən öz qonşuma da gerçək olanı,
Çatdıra bilmirəm, haqqım kəsilmiş.
Osa yalanıyla bütün dünyanı
Bizim üstümüzə qaldıra bilmiş.

Biz boğub vicdanı, qəhr edib arı,
Şərə yoldaş olub haqqı danmarıq.
Heç vaxt unutmarıq yaxşılıqları,
Amma pislikləri unudanlarıq.

Sulanıb həmişə qonşunun bağı
Bizim arxımızdan, şəfqətimizdən.
Əfsus! Bacarmışıq bağışlamağı,
Aman diləyəndə düşmən də bizdən.

Quyruğu əzilir, yumşalırıq biz,
Deyirik, bir daha o, çalan deyil.
Amma unuduruq, unuduruq biz.
Küdurət xəstəsi sağalan deyil.

Utanmaz, usanmır bəd əməlindən,
Bələddir unutqan xislətimizə.
Bilir, dədəmizin onun əlindən
Çəkdiyi zillətlər dərs olmur bizə.

Bu yaman xisləti, gəlin, tərk edək,
Tarixi dərsləri daha dərk edək.
Tərk edək, unudaq soyuqqanlığı,
Unudaq keçmişə unutqanlığı.

Daim gözümüzün önündə dursun
Keçilən yollarda xeyir-şərimiz.
Bu günü unutsaq, sabah, biri gün
Bizi bağışlamaz nəvələrimiz.

Dedim, silinməsin bu qan, bu qada,
Bir də, güllə izi dağ-daşımızdan.
Yalnız bu günə yox, biz sabaha da
Güzgü tutmalıyıq yaddaşımızdan.

*İyul, 1991*

## QÜRUB DÜŞÜNCƏLƏRİ

*Bir zamanlar "Mənimçün vaxt çatışmır" 1958-ci ildə yazdığım "Vaxt çatışmır" şeirim nəzərdə tutulur.*

**B.Vahabzadə**

Vaxtı vaxtın özündən borc almaq istəyərdim.
İstəyərdim, bir anda bir saatlıq iş görüm.
İndi isə bilmirəm vaxtı necə öldürüm?
İndi başdan ayağa şikayətəm, gileyəm.
Vaxtımın qatiliyəm.
Vaxtı kəsib doğrayan o qayçı əqrəblərin
Ağzı yaman küt olmuş.
Çağlayan çeşmələrin qaynaqları tutulmuş.
Məni sıxır,
elə bil, bir qəlibdir bu dünya.
Mənim üçün necə də boşalıbdır bu dünya.
Hər şey məni tez yorur.
Öz dünyamı dolduran boşluğun ağırlığı
Ürəyimi doldurur.
Yaman ağırlaşmışam
Peyvənddim, cırlaşmışam.
Öz bədənim, öz canım dönüb mənə yük olmuş
Tükənməyən həvəsim,
Yaratmaq ehtirasım arzuma dönük olmuş,
Söz dolaşır dilimdə,
Qələm əsir əlimdə
Xəttim tanınmaz olmuş.
Vaxtın axarındakı köhnə nizam pozulmuş.
Heç özüm də bilmirəm
Bu dünyadan nə aldım, bu dünyaya nə verdim,
Cürətimi itirdim,
Tək ehtiyat qazandım,
Ümid sütunlarında qatbaqat çat qazandım.
Haray, qaraya dönmüş bəmbəyaz ağım, haray!
Haray, əlimdən çıxan halal torpağım, haray!
Üzümə qırış qatı, gözümə tor çəkilir

Arxada yetmiş ilim, öndəsə, Allah bilir…
Gecələrim uzanır, vaxtın ömrü gödəlir
Yuxum gəlmir ki, gəlmir, səhər gəlmir ki, gəlmir.
Necə gəlsin?
        Ömrümün axşam çağındayam mən.
Bir az durulmaq üçün
Yolda çuxur axtaran bir bulanıq suyam mən.
Dostumdan, tanışımdan bir təbəssüm dilənən
Bir qərib yolçuyam mən.
Yaşadığım illəri ələklədim bir də mən
Asandır bəyənməmək dərələri zirvədən
Ömrümün zirvəsində ötənləri daşladım.
Mən artıq yoxluğumu yaşamağa başladım.
Bu günümə baxıram, dünənimi anıram
Tez-tez haçalanıram.
Fikrimə düyün düşüb
Bu günümə qar, yağış, dünənimə gün düşüb.
Bu halıma nə deyim?
Qocalığın önündə hesab verir gəncliyim.
Bəlkə budur qocalıq?
Qəlbin yuxalanması,
        sonun ilki anması?
Qocalığın önündə gəncliyin utanması,
Meşədə ağacların tək-tək yarpaq tökməsi,
Yetkin ağlın önündə ürəyin diz çökməsi?

*Yanvar, 1995*

## VAXT ALDANMADI

Qızıla mis qatdılar,
                bala – şəkər,
                        südə – su.
Dəyərsizi, ucuzu bahaya satmaq üçün.
Baqqal çəki daşının içini oydu, oydu
Alıcını çəkidə müdam aldatmaq üçün.

Özgəsinin yerinə imzalar da atdılar.
Torpağa gil qatdılar.
Sementə kül qatdılar.
Cığaradan, kağızdan
Saxta gül yaratdılar,
Saxta pul yaratdılar.
Hər yerdə ölçüləri qısaldıb uzatdılar.
Bir sözlə, saxtalıqlar üstdə bərqərar olan
Bir dünya yaratdılar.
Bu yalan bazarında aldadan da özünü
Haqlı bilir, haqq sanır
Aldadan anlamır ki, aldadanda aldanır.
Bu dünyanın ələyi xəlbirinə qarışdı.
Yamanlıqla yaxşılıq bir-birinə qarışdı.
Həqiqəti rəngləyib, ağartdılar bozları.
Dünyanın ən hiyləgər, mahir kələkbazları
Saat ilə təqvimə əl qata bilmədilər,
Yalnız vaxtı, zamanı aldada bilmədilər.

*Sentyabr, 1997*

## ÇOX İMİŞ

***Xudunun** əziz xatirəsinə*

Usanıb şəhərin küy-kələyindən
Gəldim ziyarətə dost məzarını.
Gördüm, sıralanmış qəbirlərdə mən
Ölümün möhtəşəm addımlarını.

Gəzdim qəbristanı, gəzdim səbirlə
Rastlaşdım nə qədər tanış qəbirlə.
İnana bilmədim gördüklərimə
Şəhərə dönməkmiş, şəhərdən qaçış!
Burda yatanların çoxu, heç demə
Mənim öz dostlarım, tanışlarımmış.

Orda dən, burda un, arada daş var
Zamandır hərlədən bu dəyirmanı.
Bir-bir üyüdülür dostlar, tanışlar
Birdən ayılırıq: filankəs hanı?

Bəzən üzü durur üzsüz astarın
Neçə pilləsi var tək bircə ömrün.
Mən hardan biləydim, ölü dostlarım
Diri dostlarımdan çox imiş bu gün.

Usanıb şəhərin hay-həşirindən
Gəldim ziyarətə dost məzarını.
Gördüm, sıralanmış qəbirlərdə mən
Ölümün möhtəşəm addımlarını.

*May, 1998*

## VİCDAN XƏSTƏSİYİK

*A vicdan əzabım, üsyan*
*əzabım, öldürmə məni.*
***Musa Yaqub***

Musa, vicdanından əlhəzardasan.
Bu ovqat necə də mənə tanışdır.
Bizim qəlbimizi ağrıdan vicdan
Umulan kəsləri ağrıtmamışdır.

Dünya – bir bilməcə, dünya – bir təzad,
Arifin dərdi çox, bir qəmxarı yox.
İxtiyar sahibi – vicdandan azad,
Vicdan sahibinin ixtiyarı yox.

Qənimi olsa da əyri, düzlərin
Doğruluq dərsini keçmə oğruya.
Xalqı çalıb-çapan qeyrətsizlərin
Vicdanı varmı ki, bir an ağrıya?

Millət öz dərdinə əsir oldusa,
Bizim qismətimiz iztirab, ələm.
Mən də sənin kimi, əzizim Musa,
Vicdan əzabından xəstə düşmüşəm.

Vətən qarşısında bilək bir kərə
Hamının danılmaz haqqı, borcu var.
Millətin düşdüyü bu zillətlərə
Mən də günahkaram, sən də günahkar.

Gah olur gördüyüm bu zillətləri,
Şahidi olduğum müsibətləri
Görmək istəməyib gözümü yumdum,
Onun əlacını özgədən umdum.
Mümkünmü?..
                    Deyincə, qaraldı qanım,
Məni ilan kimi sancdı vicdanım.
Vicdanın səsindən dəng oluram mən,
Ağrılar içində qovruluram mən.
"Əlimdən nə gələr?", deyincə,
                                            ağrı
Azalır, ağlım da haqq verir mənə.
Gözümü yumduğum haqsızlıqları
Vicdansa, birəbir göstərir mənə.

Vicdan saldı məni, bax, belə dərdə
Mən ondan qaçanda qaçdım özümdən.
İçimdə başlanan çəkişmələrdə
Gizlənpaç oynadım vicdanımla mən.

Vicdan yaxşı seçir əyridən düzü
Yaxşıdan yamanı, dostdan düşməni.

O qovdu, mən qaçdım, itidir gözü
Harda gizləndimsə, o tapdı məni.
Vicdanım zamana uymur ki, uymur,
Məni yaşamağa qoymur ki, qoymur.

Bizim içimizi belə göynədən,
Bizi əldən salıb, bizi qəhr edən,
Haqqın öz səsidir, haqqın öz səsi
Vicdan xəstəsiyik, vicdan xəstəsi.

Gözümüz önündə haqq çiliklənir
Haqqın qəbri üstə nahaq diklənir.
Bağırdıq: – Dayanın, haqq divanı var
Gördük, eşitmədi kimsə bu səsi.
Hələ üstümüzə çirkab atdılar
Olduq bu millətin "xain bəndəsi".

İllər gəlib keçdi, ömür gödəldi,
Baharı gözlədik, təqvimlə gəldi.
Təqvim baharını neyləyirik biz?
Könül bağçamızı basdı ot, alaq.
Ömrümüz boyunca gözlədiyimiz
Səadət gülləri açmadı ancaq.

Zülmün məhvərinə dolanır zaman
Göydəki buludlar insan ahıdır.
Göydə aramasın Allahı insan,
Hər kəsin vicdanı öz Allahıdır.

Ay Musa, özünü yorma boş yerə,
İş ki, belə gedir, nə gerçək, nə haqq?
Allahı qəlbində görməyənlərə
Vicdan kəlməsini necə anladaq?

*İyul, 1999.*

# Sandıqdan səslər

## MÜƏLLİFDƏN

Sovetlər İttifaqı dağılandan sonra arxivimi araşdırdım, gənclik illərindən yazmağa başladığım gündəliklərimi, çap olunmamış şeirlərimi varaqladım, keçdiyim yolları dəftər səhifələrində yenidən keçib həm fərəhləndim, həm də təəssüfləndim. Ona görə fərəhləndim ki, gənclik illərimdə də həqiqəti görmüş, ağı qaradan seçə bilmiş, duyğularımı, fikirlərimi qəlbimdə gizlətməmiş, müəyyən qədər yazıya köçürə bilmişəm. Ona görə təəssüfləndim ki, ömür yollarında büdrəmələrim də olmuş, duyğu və fikirlərimi açıq-aşkar və tam dəqiqliyi ilə yaza bilməmiş, zamanın tufanlarından ehtiyat etdiyim hallar da olmuşdur.

O dəhşətli illərdə çapa verə bilmədiyim, yalnız yazmaqla təsəlli tapdığım bu şeirlər qəlbimin fəryadı – yəni, o zamanın ağrı, acılarıdır. 1950-ci illərdən Sovetlər İttifaqı dağılana qədər yazılmış və arxivimdə gizlədilmiş bu şeirlərin bir qismi ilk dəfə "Nağıl-həyat" (1991), "Ümidə heykəl qoyun" (1993), "Körpü çaydan uzaq düşüb" (1996) kitablarımda, tam halda isə 7 cildlik "Əsərləri"min 6-cı cildində (2003 "Sandıqdan səslər" başlığı altında çap olunmuşdur. Burada verilən şeirlər onların yalnız cüzi bir qismidir.

## NAĞIL – HƏYAT

Anam olsan belə, ay anam, xeyli,
Səndən gileyliyəm, səndən gileyli…
Sən duymaq düşünmək öyrətdin mənə,
Duyub-düşünməkdən azad olaydım.
Danışmaq öyrətdin sən öz körpənə
Nola, mən anadan lal doğulaydım.

Dilini bir ilə öyrəndim… nahaq!..
Öz dilim özümə kəsilib yağı.
Bütün ömrüm boyu çalışdım, ancaq
Öyrənə bilmədim danışmamağı…
Başıma bəladır mənim öz dilim,
Dənizəm üzümə durub sahilim.

Yerimək öyrətdin tutub əlimdən,
Dolaşdım aranı, dolaşdım dağı.
Balana yerimək öyrədincə sən,
Gərək öyrədəydin yıxılmamağı…

Fikirlər yığılır beynimdə qat-qat,
Cavablar-qorxulu, suallar-yasaq.
Həyatı qanana ögeydir həyat,
Onu qanmayana doğmadır ancaq.

Məni incidirlər bəzən qəsd ilə,
Ertəsi hər şeyi unuduram mən.
Girəvə düşəndə zalimə belə
Zülm edib, kam almaq gəlmir əlimdən.

Ana, quduzlaşır həyat, ilbəil,
Dalayır puç olan ümidlərimi.
Niyə isti deyil, mehriban deyil
Bu amansız həyat qucağın kimi?..
Hardasan, ay ana, bir gəl, mən yenə

Bəlalı başımı qoyum dizinə.
Mənə nağıl danış, dayansın anlar,
Görüm, nağıldakı o qəhrəmanlar
Cütbaşlı divləri nə təhər yıxır,
Nə təhər gizlənib, tilsimdən çıxır.

Bir danış, hardadır, görüm, səadət?
Bizim yurdumuza o niyə gəlməz?
Danış, danış görüm, Məlik Məhəmməd
Zülmətdən işığa necə çıxdı bəs?

Danışma ay anam, danışma, kiri,
Beynimə batmayır bu əfsanələr.
Divlər görmüşəm ki, nağıl divləri,
Onların yanında toyuğa bənzər.

Nadanlar görmüşəm, öz yolundakı
Dikə eniş deyir, düzə dik deyir.
Tülkülər görmüşəm, öz qolundakı
Dəmir zəncirlərə bilərzik deyir.

Atasını söyən, yada baş əyən
Rəhbərlər görmüşəm, qəddar, amansız.
Tikana gül deyən, gülə kol deyən
Qarılar görmüşəm dinsiz, imansız.

Quldurlar görmüşəm, özgə yer deyil,
Yurdunu talayıb asudə yatmış.
Tacirlər görmüşəm, simuzər deyil
"Malades" sözünə Vətəni satmış.
Dünyanı biləndən, duyandan bəri
Mənim gözlərimdən düşüb həyat da.
Nağılda gördüyüm qorxunc şeyləri,
Həyatda görmüşəm, anam, həyatda.

*Yanvar, 1964 – may, 1965*

# HÖRÜMÇƏK TOR BAĞLADI

Tariximiz danıldı,
Uydurma tarix ilə kimliyimiz anıldı –
Öz kökünü bilməyən gözü küllü bu millət
Zamanın yollarında hər addımda yanıldı.
Uydurma tarix bizi anamızdan ayırıb
Yad anadan alınmış bələkdə qundaqladı,
Təməlimiz laxladı.
Bu xalqın tarixini düz bildirən, düz yazan
Tarix kitablarında hörümçək tor bağladı.

Kimə deyək dərdini bu dövranın, bu günün?
Vəzifəyə sümsünən
                    Vəzifə kürsüsünün
Birinci pilləsində mərkəzdən noxtalandı.
Kişiliyi vardısa, bu anda axtalandı…
Ürəkdəki cəsarət,
        mərdanəlik,
                dəyanət
talandı,
tapdalandı.
Məğrur keçmişimizdən üzüldü əllərimiz
Şərəf bildik özgəyə qul olmağı, yoxsa, biz?
Hər cürə zülmü udduq.
Köləliyi qazanıb, ağalığı unutduq.
Vicdan, düzlük, həqiqət sürgün oldu bu yerdən.
Yaltaqlıq və xəyanət silahını yağladı.
Cəsarət qılıncının ağzı düşdü kəsərdən,
Qəbzəsində, qınında hörümçək tor bağladı.

Dilimiz yasaq oldu.
Ruhumuz qəlbimizdə əbədi dustaq oldu.
Ruhsuz yaşadıqca biz
Vicdanımız, eşqimiz
                Üzümüzə ağ oldu.

Biz beləcə yaşadıq, yaşamadıq, süründük,
Əməlimizdə deyil, sözümüzdə göründük.
Ruhumuz qan ağladı,
Məscid qapılarında hörümçək tor bağladı.

Həqiqət dilə gəldi.
Dildə ilişdi, qaldı.
Həqiqətin üstünə yalanlar kölgə saldı.
Vuruşmadıq, barışdıq
Biz "azadlıq" adlanan bir uydurma nağılla.
Ölən düşüncələrə qəlbimiz yas saxladı.
Həqiqəti deməkdən elə qorxduq…
Ağılla
Həqiqət arasında hörümçək tor bağladı.

*Oktyabr, 1968*

## QORXU

Mən qorxuram, sən qorxursan,
O da qorxur, bu da qorxur,
Biz qorxuruq.
Təzə fikir beynimizə gələn kimi
tez qorxuruq.
Başqasından qorxduğumuz bəs deyilmiş
Özümüzdən biz qorxuruq!
Qorxu, qorxu!
Bir qurd olub yeyir bizi içimizdən,
Nə gözləyir Vətən bizdən?
İradə yox,
kişilik yox.
Biz qorxuruq,
biz susuruq.
Fikir ölür,
can sustalır,
ürək donub,

ruh boğulur.
Qorxu bizim dilimizdə kilid olur,
Beynimizdə qıfıl olur.
Dərd budur ki, bu dərdi də,
Biz qanırıq, biz bilirik.
Qorxa-qorxa
Özümüz də özümüzçün
Biz qorxuya çevrilirik.

*İyul, 1972*

## BELƏ QALMAZ

Sabir demiş, "Biz ərlərik",
İş yerinə
    "Özgəsinin sözlərini
                əzbərlərik".
Toz-torpağı yel sovurar,
Dənəsi də yelə qalmaz…
Vallah, billah, belə qalmaz,
                belə qalmaz!
Bu inamla yaşamışam,
Bizim kimi zəvzəklərin
İgidliyi dözüm olsun,
"Heyvərəlik, boşboğazlıq"
                bizim olsun.
Gələcəyin övladları iş görəcək.
Hamı dua əvəzinə "lənət" deyib,
Qəbrimizə tüpürəcək.
Deyəcəklər, ey babalar,
Yaş yetirib kal oldunuz,
Görə-görə kor oldunuz,
Dinə-dinə lal oldunuz.
Səbrinizə heyrətdəyik,
Siz dözümdə fil oldunuz.
Ey nəvələr, nəticələr,

Biz heç nəyik, biz heç nəyik…
Gecə-gündüz babamızın
əməlinə heyrətdəyik.
Heyrət edin sizsə bizim
səbrimizə…
“Lənət” deyib, siz tüpürün qəbrimizə…

Haqqımızı biz qanmadıq.
Biz bu günü yola verib
Gələcəyə inanmadıq!
Keçirdik öz əlimizlə
Boynumuzu biz xaltaya,
Sap olmadıq bir baltaya.
Ac olsaq da, “toxuq” – dedik.
Biz ucadan “bəli” deyə çox bağırdıq,
Qəlbimizdə “yox-yox!” – dedik.

Toz-torpağı yel sovurar,
Dənəsi də yelə qalmaz.
Vallah, billah, belə qalmaz,
Belə qalmaz!

*1974*

## DİZ ÜSTƏ

O, çox əzəmətli, çox qüvvətlidir
Böyükdür,
Nəhəngdir və qüdrətlidir.
Bunu çox eşitdik, çox dedik düzü.
Çox deyib, alçaltdıq öz-özümüzü.
Onun böyüklüyü aydındır bizə.

Bir baxaq,
Bir görək,
bilək, biz nəyik?
O, böyük görünür gözlərimizə
Nədən ki, özümüz diz üstündəyik.

Kiçildik, biz ona böyük dedikcə
Yetər bu səcdələr, bu diz çökmələr.
Biz onun önündə iməklədikcə
Əzdi başımızı nallı çəkmələr.

Duraq ayaq üstə!
                    Axı, ərik biz.
Qalxsaq, o kiçilər, böyüyərik biz.

*Avqust, 1976, Şəki*

## MÜSAVAT

Zülmətlə savaşlarda zəfər çaldığı gündən,
Qəlblərdə azadlıq odu yandırdı Müsavat.
Ulduz və hilal eylə ki, üç rəngə qovuşdu,
Boz qurdu könüllərdə oyandırdı Müsavat.

Meydan oxudu qan çiləyən dövrana qarşı,
Hər zalimə, hər nadana, hər hədyana qarşı,
Tüğyan elədi eyləki zülm insana qarşı,
Öz həddini zalimlərə qandırdı Müsavat.

İlhamını almış o, Vətən adlı gözəldən,
İman suyunu, çünki, o içmişdi düz əldən.
Xalq naminə haqq adlı vuruşlarda əzəldən
Ön cərgədə hər tilsimi sındırdı Müsavat.

Öndər dedi: – İstiqbal üçün dağ aşalım biz,
İstiqlala, istiqbala daim qoşalım biz,
Bir türk kimi islamlaşa, çağdaşlaşalım biz
Amalına bir xalqı inandırdı Müsavat.

Amalı təmiz, məqsədi aydın, üzü ağdır,
Ən ali məramında qərəzlərdən uzaqdır.
Tarix şüuru – xalqımı millət yapacaqdır
Haqdan dönəni haqqa tapındırdı Müsavat.

Düzlük şuarı daima çarpışdı yalanla,
Torpaqdan alıb qüdrəti, kökləndi zamanla.
Cənnət edəcək amala dönmüş bir imanla
Ünvanı Azərbaycan olan yurdu Müsavat.

*Fevral, 1977*

## SƏBR ELƏDİK

Açan gündən gözümüzü
Ümidlərin laylasında
Xumar gördük özümüzü.
Arzumuzu vermədilər,
Bizə ancaq döz, dedilər.
Elə bildik, düz dedilər.
Hər gecənin gündüzü var,
Gələcək gündüz, dedilər.
Biz gözlədik.
Qəlbimizdə baş qaldıran
ümidləri əzizlədik.
Hey izlədik,
Uca-uca kürsülərdən
Vəz olunan nitqləri.
Həyatda yox,
qəzetlərdə göstərdilər
bizə yalnız xeyri-şəri.
Şirin-şəkər yalanları yeyə-yeyə
Biz inandıq gələcəyə.
O gəlmədi,
Düz əyildi,
Əyriliklər düzəlmədi.
Arzumuzun əvəzinə
Bizə yenə söz verdilər.
Həqiqəti görməməkçün
Dəyişdirib gözümüzü
Bizə başqa göz verdilər.
Baxıb saxta gözümüzlə
Hamar gördük çuxuru biz.

Saray bildik axuru biz.
Görəmmədik qat bağlayan paxırı biz.
Bu paxırı görənləri,
Xalq yolunda candan keçən ərənləri
“Xalq düşməni” damğasıyla
Ləkələyib məhv etdilər.
Haqq adına haqqı yıxıb sürütdülər.
Bozu ağdan seçənləri
zindanlarda çürütdülər.
Susub dözdük, döz, dedilər.
Sözdən boluq
Söz içində üz, dedilər.
Söz içində üzə-üzə
Səbrimizdən bəzək vurduq ömrümüzə.
Hər cəfaya dözə-dözə
Biz alçaldıq addımbaşı.
Qul etdilər vətənində vətəndaşı,
Ayaq altda palaz oldu ləyaqəti.
Biz ucalıq zənn elədik rəzaləti.
Səbr elədik.
Qara günü ağ söz ilə pərdələdik.
Zənn etməyin,
bədbəxtliyi özümüzə dərd elədik.
“Biz xoşbəxtik, bəxtəvərik” – sözlərini
Şüar kimi dilimizdə vird elədik.
Qırıb qalın meşələri
Pambıq əkdik.
Qanımızdan gülab çəkdik.
Yüz hektarın məhsulunu on hektara,
On nəfərin məhsulunu bir nəfərə
yaza-yaza,
Həm insanı, həm torpağı
Necə verdik biz güdaza.
Meydan verdik ağ yalana,
Həqiqət də tapdalana-tapdalana
Çəkildi dağlar dalına,
Bəlkə… orda daldalana.
Səbr elədik,

Özümüzə cəbr elədik.
Orden, medal yarışında
Dumanladıb beyinləri
DDT-ylə zəhərlədik
Yüz-yüzləri, min-minləri.
Bircə çəngə ağ pambığa
Qurban verdik gənc qızları, gəlinləri.
Bu dünyaya göz açmamış körpələri
Bətndəcə zəhərlədik.
Yaşamadıq, baş girlədik
Yalan-yalan vədləri yeyə-yeyə,
Ümid ilə qarnımızı doyuzdurub,
Biz inamla yenə baxdıq gələcəyə.
Gələcəklər gəlib keçdi,
Ümidimiz doğrulmadı.
Şirin-şəkər yuxular da çin olmadı.
Amma yenə səbr elədik.
Qəlbimizi arzulara qəbr elədik.
Susmağı da qeyrət sandı qeyrətimiz.
Səbrimizin laylasında
xumarlandı qeyrətimiz.
Bu dözümə,
Bu zülümə
Heyrətdədir heyrətimiz!

*Sentyabr, 1979*

## LAL – KAR

*Dil açmada lallıq da gedər, karlığımız da.*
*Çün lallığımız doğmuş idi karlığımızdan.*
***Şəhriyar***

Həm lal olduq, həm də kar
Lallıq karlıqdan doğar.
Niyə lal olduq, görən?
Bunu bilirsənmi sən?
Bunu bilək biz əvvəl,
Ötənlərə baş vuraq
Bunun üçün indi gəl.

Zaman-zaman əzildik
Məhkum olduğumuzu
Nə anladıq, nə bildik.
Bununçün da soydular
Dərimizi qatbaqat.
Haqqımızı kimsədən istəmədik, ey ustad.
Çünki onu qanmadıq.
Bu miskin halımızdan
Qızarıb utanmadıq.
Bütün dünya oyandı,
Biz hələ oyanmadıq.
Susduq, hər şeyə dözdük.
İçimizdən oyulduq.
Karlıqdan lal olmadıq,
Susduq-deyə lal olduq.
Sabirimiz demişkən:
"Bir əcayib şeyik biz".
Tərs gəlib hər işimiz.
Bizim çaqqalımız da
Gəlir öz dağımızdan.
Bizim karlığımız da,
Bizim lallığımız da
Doğub susmağımızdan.

*İyul, 1979, Şəki*

## BAŞQASININ YASINDA

Dərindir, qorxuludur sakit axan lal sular.
Bir kəlmənin içində bəzən neçə söz yatır.
Adi gözlə görünməz orda yatan duyğular,
Çözələsən, görərsən kül altında köz yatır.

İçimi göstərmədim cahil tutan güzgüyə,
Üzdə gülüb, içimdə müşkülümə ağladım.
Millətimin dərdini ünvanlayıb özgəyə,
Başqasının yasında öz ölümə ağladım.

*Dekabr, 1981*

## GƏLİR

Tarıma çəkilmiş simə bənzə sən!
Titrə bir yarpağın titrəməsindən.
Bil, dənizdə coşan suyun səsindən
Xəzri gəlir, yoxsa, gilavar gəlir.

Bir az sıxlaşanda göydə buludlar,
Yavaşca titrəşir yerdə göy otlar.
Onlar da bilir ki, havada çən var,
Sabah yağış gəlir, sabah qar gəlir.

Müyəssər deyildir hər kəsə ancaq
Ürəkdən keçəni gözdən oxumaq.
Qaranquşdan qabaq, torpaqdan qabaq
Gərək biləsən ki, ilk bahar gəlir.

Qəlbim götürməyir bəri-bəzəyi
Çətindir yamamaq sınmış ürəyi.
Özün dərk edəsən gərək hər şeyi
Səni başa salmaq mənə ar gəlir.

Baxışdan söz götür, söz anla sözdən,
Həssas ol, sevgilim, ömrün boyu sən.
Əgər sevirsənsə, ayaq səsimdən
Gərək biləsən ki, Bəxtiyar gəlir.

*1950*

## QISQANIRAM MƏN

O çalır, nəğmənin hər xalında sən,
Qəlbini, ruhunu tapmısan deyən.
Unudub zamanı, vaxtı, məkanı
Xəyal dünyasında məclis qurmusan.
Səslərin oduna əridib canı,
Özünü nəğməyə qarışdırmısan.
Nəğmə aldı səni mənim əlimdən,
Səni, nəğməyə də qısqanıram mən.

Dayanıb güzgünün qabağında sən,
Pərişan saçına daraq çəkirsən.
Arzular, diləklər təmənnasıdır
Bu qoca dünyada hər kəsin, gülüm.
“Pərişanlıq zülfün öz qaydasıdır”,
Halı pərişanlar neyləsin, gülüm?
Güzgü də zövq alır gözəlliyindən,
Səni güzgüyə də qısqanıram mən.

Ömrün yollarını inamla keçdim,
Axırda odlandı bağrımın başı.
Eşqin çeşməsindən bir damcı içdim,
Axdı sellər qədər gözümün yaşı.
Bu dərdə tablamaq müşkül olsa da,
Eşqsiz ürəyi daş sanıram mən.
Düşməsin araya gülüm, qan-qada,
Səni, özünə də qısqanıram mən,
Daim öz-özünün yanındasan sən,
Neyləsin həftədə bir yol görüşən?

*Dekabr 1961*

## GÖZÜN DİLİ

Qara gözlər,
Ala gözlər,
Qonur gözlər...
Nə qədər sözlər
Deyilmiş mədhinə gözəl gözlərin,
Şairlər, indi də mənə söz verin.
Qorxuram gözlərin mən gözəlindən
Aman göz əlindən, dad göz əlindən!

Gözdən hansı qəlbə dağlar çəkilməz?
Gözün dediyini dil deyə bilməz.
Həm incə, həm dərin dili var gözün.
Sözünü ürəklər anlayar gözün.

Mələr, çıxmasa da ürəyin səsi,
Elə ki, havada gözlər öpüşür.
Eşqin də ilk odu, ilk şərarəsi
Əvvəlcə ürəyə gözlərdən düşür.

Gözləri mədh edən şeir də gerçək,
Gözün öz dilində yazılsın gərək,
Bu dil müəmmadır, bu dil çətindir,
Bu dillə dinəni bu dillə dindir.

*1961*

## YOX DÜŞMÜRƏM, QALXIRAM

Ən uca mərtəbədə yaşayırsan...
Çox gözəl.
Məni bu pillələrlə
İmtahana çəkmə, gəl!
Yox, yox!

Mənə demə ki,
Muğayat ol özündən,
Çıxma bu pillələri
Xəstə ürəyinlə sən!
Yox!
Onlar yormur məni!
Bir addıma qalxıram
Qalxanda beş pilləni.
Düşəndə bir pilləni
Beş addıma düşürəm.
Düşürəm... Yox düşmürəm,
Sanki yoxuş qalxıram.
Məni yola salırsan:
Gah özümə,
gah da sənə baxıram.
Düşürəm...
Düşə bilmirəm
Köynəyim tondan ağır,
Sıxır məni əynimdə.
Düşürəm...
Düşə bilmirəm
Sənin baxışlarının
Ağırlığı çiynimdə.
Yox!
Mən pillə düşmürəm,
Ruhum düşür göylərin
Min-min mərtəbəsindən.
Hara gedim, bilmirəm
Ayağıma dolaşan
Ürəyimlə indi mən?...

Düşürəm, xəyal kimi...
Aparıram beynimi,
Ürəyim sizdə qalır.
Kədərim yanımdadır,
Fərəhim sizdə qalır...
Mənim bu tərs taleyim

Gör necə də zalımdır,
Enişim – hicranımsa,
Yoxuşum – vüsalımdır.

Sənin pillələrini
Qalxmaq necə asandır
Düşmək, enmək çox çətin!
Bu da mənasız deyil,
Hər işi tərsinədir
Əzəldən məhəbbətin!..

*Oktyabr 1963*

## BİR SALAMA DƏYMƏDİ

Bu gün mən səni gördüm,
Salam vermək istədim,
Üzünü yana tutdun.
Söylə, illərdən bəri
Qəlbimizin bir duyub
bir vurduğu illəri,
Axı, nə tez unutdun?
Beş ildə gözümüzdən axan o qanlı sellər,
Bir salama dəymədi?
Həyəcanla, fərəhlə, qəmlə dolu o illər
Bir salama dəymədi?
Heç üzümə baxmadan yanımdan necə keçdin?
Sən eşqin salamını qorxuyamı dəyişdin?
Yoxsa sən öz əhdinə, ilqarına ağ oldun?
O qədər yaxın ikən, bu qədər uzaq oldun.
Şirin gülüşlərimiz, acı fəğanlarımız
Bir salama dəymədi?
Qayğılı anlarımız, qayğısız anlarımız
Bir salama dəymədi?
Sən neylədin, bir düşün!
Yalnız indi anladım: ah, sən daha mənimçün
Əlçatmaz bir çiçəksən,
Yaşanmış günlərim tək geri dönməyəcəksən!...

Qop, ey tufan, əs, ey yel! Xəzəl olum, tökülüm
Düz beş il ürəyimdə
Bəslədiyim məhəbbət, bir salama dəymədi.
Bir günlük həsrətimə dözə bilməyən, gülüm,
Bəs nə oldu? Bu həsrət bir salama dəymədi?

Getdin, dalınca baxdım, can ayrıldı canımdan,
Sən necə etinasız ötə bildin yanımdan,
Ah çəkdim, başım üstə yarpaqlar əsdi, gülüm,
Sənin qəlbin əsmədi.
Arxana da baxmadın!
Niyə sənin yolunu məhəbbətin kəsmədi?...
Qazancımız de, bumu?
Deyilməmiş o salam əlvidamız oldumu?
Sən mənə zülm eylədin, mənə zülm yaraşır.
Bir salama dəyməyən eşqə ölüm yaraşır.

*Sentyabr 1961*

## HƏSRƏT

Yoxsan...
Qəribə işdir
Danışıram yenə mən
Əlim qələm də tutur,
Durub şeir yazıram
Səhər-səhər sənə mən.

Sən həm mənim kədərim,
Sən həm də şadlığımsan.
Sən mənim əsarətim,
Həm də azadlığımsan...
Yoxsan...
Qəribə işdir
Qəlbim,
hissim,
düşüncəm,
Axı, oyaqdır mənim

Necə nəfəs alıram –
Havam ki, yoxdur mənim?
Yoxsan...
Sən mənim üçün
Xoş arzularsan, demək,
Baharda qarsan, demək,
Qışda baharsan, demək.
Yoxsan...
sən mənim üçün
Daha çox varsan, demək.

Sevilənlər, sevənlər
Ayrılığın, həsrətin
Əlindən dad çəkdi, dad.
Eşq – həsrətin anası,
Həsrət – aşiqə ustad.

Ömrün boyu qaçmısan
Arxanca yüyürmüşəm.
Səndə imkansızlığı,
Uzaqlığı görmüşəm.

Həsrət öyrətdi mənə
Hardayam...
indi hardan
Hara gedəcəyəm mən.
Nəydim,
indi nəyəm mən?

Həsrət öyrətdi, həsrət
Vaxtın hardan başlayıb,
Haraya vardığını.
Həsrət öyrətdi
mənlə
Başlayan bir həyatın
Səndə qurtardığını.

Həsrətinin gözüylə
Mən dünyaya baxanda,
Gecələr gündüz olur.

Həsrətinin zülməti
Gözlərimə nur verir,
İdrakıma göz olur.
Həsrətim başlananda
Başlanır bu cahana
Sonsuz heyrətim mənim.
İdrakımla yaşıddır
Eşqim, həsrətim mənim...

Böyük bir şair dünən
Vaxtın qısalığından
Dad çəkib “uzan!” – dedi,
Anın qısa ömrünü
O, uzatmaq istədi.

“Ey an, sən uzan” deyib
Vaxta böhtan yazdı o.
Əgər həsrət çəksəydi
Ana yalvarmazdı o.

Onda o bilərdi ki,
Həsrətin bircə anı
Bərabərdir illərə.
Bircə günlük ayrılıq
Neçə illik vüsaldan
Uzun olur yüz kərə.
Bircə günlük ayrılıq
Bir ömürlə tən olur;
Həsrət vaxtı uzadan,
Səbri gödəldən olur.
Həsrətin – məhək daşım,
Həsrətin – yol yoldaşım.
Yanır başım üstündə
O, ulduz tək, o, gün tək.
Mərdanədir, böyükdür
Həsrətin də özün tək...

*İyul 1964, Kislovodsk*

## SEVƏ BİLƏRİMSƏ...

Ancaq məhəbbətçün yaranmışam mən,
Alammaz əlimdən bu haqqı kimsə.
Xoşbəxtəm,
küsmərəm öz taleyimdən,
Əgər sevirəmsə...
sevilirəmsə...

Məhəbbət – amalım, arzularımdır,
Ona kainatım, cahanım deyim.
Mənim dövlətimdir, mənim varımdır
Bütün varlığımla sevə bilməyim.
Sevə bilirəmsə, əgər ürəkdən
Dünyanın ən gözəl adamıyam mən.

Səni sevirəmsə, sevirəm demək
Həyatı,
dünyanı,
yoxdur düşmənim...
Əgər sevirəmsə – qəlbim aynatək
Şəffafdır,
həssasdır,
kövrəkdir mənim...
Bu könül aynama gülümsəyərək,
Göylər də,
yerlər də
əks olur həmən.
Sevirəm,
sevirəm,
sevirəm,
demək,
Bütöv bir aləməm, kainatam mən.

Mən ki, kainatam, aləməm, nə qəm,
Ayım da,
Günüm də,
Ulduzum da var.
Həm zülmət,

həm də ki,
aydınlıq gecəm,
Həm açıq,
həm tutqun
gündüzüm də var.
De məndən varlısı dünyada varmı?
Sevən də özünü yoxsul sanarmı?

Mənim öz eşqimin öz ulduzları
Dağıdır, könlümə nur, qucaq-qucaq...
Axı, bu sərvəti, dövləti, varı
Məhəbbət bəxş edir insana ancaq.
Bəli, ilk insanla həmyaşam artıq,
Bilmirəm aydayam, ya gündəyəm mən.
Zamandan, məkandan çıxmışam artıq,
Dünyəvi aləmin fövqündəyəm mən.

Öz böyük eşqimlə fəzadayam mən.
Məni endirməyin yerə, amandır.
Dünya çox kiçikdir məhəbbətimdən,
Hər arzum bir cahan, bir asimandır.
Verir arzularım göydə səs-səsə,
Deməyin yerdə uç, yer bəs deyilmi?
Yanan bir ürəyə, sevən bir kəsə
Asiman özü də qəfəs deyilmi?

Sevə bilirəmsə, əgər ürəkdən
Dünyanın ən yaxşı adamıyam mən!

*Dekabr 1964*

## TƏZƏDƏN

Bu şirin sevdaya düşəndən bəri
Neçə yol ayrıldıq bir-birimizdən.
Ayrılıq günləri, hicran günləri
Uzandı...
Ömrünə ömr aldı bizdən.
Biz ki, öyrənmişik hicrana artıq.

Cövrü yadda qalır, qəm unudulur.
Sevən könüllərçün, gülüm, uzaqlıq
Ən böyük, ən gözəl yaxınlıq olur.

Yağış dayandımı?
Qalın buluddan
Sıyrılıb yenidən təzə gün doğur.
Hər uzun ayrılıq, hər qısa hicran
Səni mənim üçün təzədən doğur.
Ayrılıq dəmləri düşürkən yada
Təzədən sevirəm, təzədən səni.
Elə bilirəm ki, bu gen dünyada
İlk dəfə görürəm, gülüm, mən səni.

Ayrılıq günləri düzülür səfə,
Hər gün gözləyirik, hər gün bir günü,
Ayrı bir adamsan, gülüm, hər dəfə
Vüsalın əvvəli, hicranın sonu.
Teleqraf kağızı... kiçik bir varaq.
Alışan könlümə su səpir yenə
Səndən ayrıldığım on gündür, ancaq
Milyon illərdir ki, həsrətəm sənə.

On gündə əzabla neçə-neçə min,
Dəqiqə, saniyə yola saldıq biz.
Bu uzun anların, dəqiqələrin
Hansını yaşadıq bir-birimizsiz?
Sənin də yerinə danışıram mən,
Qoy olsun, qəlbimiz ayrı deyildir!
Biz iki olsaq da vüsal günləri,
Ayrılıq günləri bir oluruq, bir!

Həsrət, ürəyimdə qaladan möhkəm,
Hicran çöplərindən bir yuva qurmuş.
Sənin yanında da sənə həsrətəm,
Həsrət ayrılıqdan uzun olurmuş...
Görüş qışdan sonra gələn bahardır,
Ayrılıq, görüşlə bitir... tez olur.
Eh! Ona nə var ki, müddəti vardır,
Həsrətsə ölçüsüz, müddətsiz olur.

Bil, yaman gündə də, yaxşı gündə də,
İstərəm qovuşam, mən yetəm sənə.
Gözüm gözlərinə dikiləndə də
Həsrətəm, həsrətəm, həsrətəm sənə!

*İyul 1965, Qusar*

## ÖZÜNDƏN AYRILA BİLMƏYƏCƏKSƏN

Deyirsən, dərd oldu bizə eşqimiz,
Sarsıntı, üzüntü yetməzmi artıq?
Ürəkcə nə qədər bir olsaq da biz
Həyat yollarında ayrılmalıyıq.

Ayrılmaq! Söz asan, əməl çətindir,
Sevmək! Bu ki, sənin öz fitrətindir.
Necə ayırasan odu ürəkdən,
İstini atəşdən, ətri çiçəkdən?..

Mənim öz istəyim, mənim öz kamım –
Sənin öz istəyin, sənin öz kamın.
Sənin ad günündür mənim bayramım,
Mənim ad günümdür sənin bayramın.
Biri-birimizçün doğulmuşuq biz.
Birdir hər eşqimiz, hər istəyimiz.

Hərdənbir darıxıb gəzməyə çıxsan,
Ayağını öpən göy otlar mənəm.
Başını qaldırıb göylərə baxsan,
Kövrəlib qaralan buludlar mənəm.
Demə ki, yanımca nə hərlənirsən?..
Mehvərin başına gərək hərlənəm.
Bəzən səbəbsiz də kədərlənirsən,
Səbəbi axtarma,
o səbəb mənəm!
Qəlbin çox ucalır, çox qanadlanır,

Ona zirvə mənəm,
Ona son mənəm.
Yata da bilmirsən uzun gecələr,
Gözlərindən qaçan o yuxun mənəm...
Hər kəsə tutmadın, axı, tən məni.
Sən də bu dünyada mənimçün təksən.
Sən qova bilərsən evindən məni,
Qəlbindən ki, qova bilməyəcəksən.
Sənin hər dəqiqən, hər anın mənəm,
Axı, adın mənəm, ünvanın mənəm.

Qapını üzümə bağlasan da sən,
Özündən ayrıla bilməyəcəksən...
Sən ki, sən deyilsən,
Sən də bil, mənəm.
Yaşını çoxaldan, səni ucaldan,
Gün mənəm,
Ay mənəm,
Gülüm, il mənəm!..

*1965*

## UNUTDURDUN SƏN MƏNƏ

Xəyalınla, fikrinlə
Həmişə sərxoşam mən.
Unutmuşam özümü,
Dönüb sən olmuşam mən.
Öz könlümün səsindən,
Öz könlümə ün düşüb
Dağlar başı qaralıb
Dərələrə gün düşüb,
Niyə belədir, gülüm,
Sən özün bilməlisən,
Fikrimə düyün düşüb!

Həqiqət, – güman olub
Xəyalım – duman olub
Gah düzəndə sürünür

Gah təpədə görünür.
İlişir kolluqlara
Fikirlər – qırıq-qırıq,
Arzular – para-para,
Ümidlər pərən-pərən,
Qəsəmlər – yalan olub
An var dönüb il olub,
İl var dönüb an olub.
Həsrətim, bu anları,
günləri,
danır mənim.
Saatımın əqrəbi
Yalnız sənin başına
Dönüb dolanır mənim.
Sənə könül verəli,
Mənim üçün bu köhnə
vaxt ölçüsü pozuldu,
Sənin məhəbbətinin
Dərəcəsi, ölçüsü
Mənim vaxt ölçüm oldu.
Bir şaxtalı qışdayam,
Mənə əlvan baharı
Unutduran sən oldun.
Ancaq hər gün baharı
Məndən soran sən oldun!
Ümmanam,
sahilimi
Unutdurdun sən mənə.
Qarlı dağam,
selimi
Unutdurdun sən mənə.

Gecəyəm,
gündüzümü
Unutdurdun sən mənə
İnsanam, öz-özümü
Unutdurdun sən mənə
Bu dünyada hər şeyi
Unutdurub sən mənə

Çəkdirmisən göz dağı,
Əvəzində öyrətdin
Səni unutmamağı!..

*1965*

## NÖQTƏYƏ DÖNDƏRƏRDİM

Mən burdayam, sən orda...
Yenə hicran, yenə qəm...
Yerdəyəmmi? – bilmirəm,
Göydəyəmmi? – bilmirəm...
Aramızda sədd kimi,
uçrum kimi dayanan
Bu uzun yollar deyil,
Gülüm, zamandır, zaman!..

Məhəbbətimiz qədər
Əzabımız var bizim.
Aramızda dayanmır
Bu uzun yollar bizim!..
Aramızda dayanır
Neçə-neçə il, gülüm,
Neçə-neçə ay, gülüm!
Bu ayları, illəri
Fikrimin sürətilə
Necə udum, ay gülüm!
Bizim istəyimizlə
Qara dönüb ağ olmur!
Yolu qısaltmaq olur,
Vaxtı qısaltmaq olmur.

Uzun yollar, dolaylar
Əgər olsaydı dərdim,
Mən onları kəmərtək
Belimə dolandırıb
Nöqtəyə döndərərdim!

*Avqust, 1965*

## AZADLIQ

Azadlıq istəyirdin...
İndi məndən uzaqda
Azadsan, cismən azad.
İndi buyur, sevgilim,
Mən dustağam, sən azad!..
Beləmi?
İnanmıram.
Biz bir şəhərdə ikən,
Dəqiqəni, anını,
Sapa düzüb incitək,
İzləyirdim səni mən.

İndi məndən uzaqda
İzləmir heç kəs səni.
Ancaq, azad deyilsən,
İzləyir, öz köksündə
Aldığın nəfəs səni.
Orda pərəstişkarın
Bir deyil, min-min olsun.
Qorxmuram, yox, qorxmuram,
Mən yox, sənin öz hissin,
Sənin gözətçin olsun!

Sən sevən bir ürəyin
Özü boyda dağısan!
Mənim dustağım deyil,
Hissinin dustağısan,
Qəlbinin dustağısan.

*İyul 1966, Şəki*

* * *

Nəğmə olub gecələr
Sənə layla çalaydım,
Dönüb yuxun olaydım.
Ayaqların altına

Sərəydim gül-çiçəkli
Çölü mən, çəməni mən.
Nağıllar dünyasına
Aparaydım səni mən.

Çıxıb çərçivələrdən
Göylərə baş vuraydıq.
Vaxtı da donduraydıq.
Qanunlara od vurub
Sərhədləri qıraydıq.
Eşqimizin oduna
Dünyanı yandıraydıq.
Biz məhəbbət ünvanlı
Təzə dünya quraydıq.

Səni hər an, hər saat
Görmək üçün, sevgilim,
Gecələr ay olaydım,
Gündüzlər gün olaydım.
Sənin gözəlliyindən
Səhər-axşam həzz alan
Dilsiz güzgün olaydım.

Güzgün olsaydım əgər,
Qəm yeməzdim yenə mən;
Səni, öz diləyimcə
Göstərərdim sənə mən.

*Sentyabr 1966*

## KÜÇƏDƏ İTİRDİM...

"Yaşaya bilmirəm bu sayaq daha,
Bəsdir,
Yorulmuşam,
Qurtaraq daha!"
Deyə avtobusa mindin...
Dayandım,
Vaxt da mənim kimi dayandı, sandım.
Yox! O dayanmadı, işlədi yenə.

Minib avtobusa səninlə birgə
Bir göz qırpımında zaman da getdi,
İxtiyar da getdi, güman da getdi...

Bu nədir?
ayağım üzüldü yerdən.
Hər şey öz yerini dəyişdi birdən,
Dayandım...
Arxamca yollar süründü,
Saat da tərsinə dolandı, döndü.
Səndən ayrılmadım,
Səndən mən, gülüm,
Özümdən ayrıldım,
Özümdən, gülüm!
Bilmədim nə idim,
indi nəyəm mən?
Küçələr uçruma döndü gözümdə.
Səni itirdiyim bu anda bilsən,
Yolların üstündə itdim özüm də.
Dolaşdı kainat,
Qarışdı aləm,
Kimdir qulağımda belə hönkürən?
Küçədə itirdim səni, dözmürəm;
Həyatda itirsəm neylərəm görən?

*İyun, 1967*

## UNUDAM GƏRƏK

Ayrıldıq... güc gəldi bizə hücumlar,
Ayrıldıq, usanıb tənədən, sözdən;
Bizdən razı qaldı yadlar, qohumlar,
Biz razı qalmadıq öz-özümüzdən.

Ayrıldıq... nəğməmiz qaldı yarımçıq,
Fikirlər pərişan, könüllər qırıq.
Ayrıldıq... de harda ləngidi zaman?
İndi nə sən sənsən, nə də mən mənəm.
Başımda tufanlar hayqırdığından,
Meyvəsi dəyməmiş tökülən mənəm.

Dağlara dırmanıb ardımca qoşdun,
Özgə buludlara qarışan mənəm.
Taleyin hökmüylə sən çox vuruşdun,
Bu ağır hökm ilə barışan mənəm.
Yandıran da mənəm, yaxılan da mən.
Döyən də,
Vuran da, yıxılan da mən!
Ayrıldıq...
bilmədik,
neçin,
nədən biz?
Ayrıldıq...
Ayrılmaq istəmədən biz.
Yoxdur ürəyimdə sənə qəzəb, kin,
Yadıma düşməyir bəd əməllərin.
Nifrətsiz ayrılıq ayrılıq deyil,
Nifrətsiz ayrılıq vüsaldan şirin...

Gülüm, sevə-sevə ayrılırıq biz.
Ürək kökdən düşən tək simə bənzər,
Bizim gözü yaşlı, bədbəxt eşqimiz
Atalı-analı yetimə bənzər.

Deyirəm unudam səni mən gərək.
Mümkünmü?
Arzuya əməl tən gərək!
Unuda bilməkçün səni, sevgilim,
Təzədən doğulam, təzədən gərək!

*Avqust, 1967, Nalçik*

## GÖR NECƏ GÜCLÜSƏN

### I

Yatmaq istəyirəm...
sənsizliyimi
Yuxu dənizində batırım deyə.
Yuxumsa kölgəni öz kölgəm kimi

İzləyir, qısqanıb səni hər şeyə.
Yuxum qaçaq düşüb məndən yan gəzir,
Yuxum küçələrdə sərgərdan gəzir.
Həsrətin asılıb kirpiklərimdən,
Yuxum da gəlmir ki, heç olmasa mən,
İtirim, batırım səni yuxumda.
Məndən vəfalıymış sənə yuxum da,
Yuxum qaçaq düşüb yatammıram mən,
Yuxum qorxub qaçıb fikirlərimdən...

**II**

Gəzmək istəyirəm...
sənsizliyimi
Yollarda itirim, unudum tamam.
Hara gedirəmsə, xatirən kimi
Ağır bir yük ilə qarşılaşıram.
Səni itirmişəm,
neyləyim ancaq
Hər zaman, hər yerdə
görünür yerin.
Yox, dözə bilmirəm, dərd ondadır ki,
Özündən ağırdır xatirələrin.
Şirin xatirələr bir tikan təki
Yollara səpilib dəstəbədəstə.
Xatirən tikandır cızır qəlbimi,
Yoxluğun duz səpir yaramın üstə.
Yaddaşım elə bir günəş ki, gün ki,
Dünəni nur kimi görürəm aydın.
Deyirəm, yaddaşım elə ölsün ki,
Mənə dünənimi xatırlatmasın!

**III**

Gülmək istəyirəm... ürəyimdəki
Hönkürtü səsini batırmaq üçün.
Bilmirdim,
Məhəbbət bir cəllad təki
Mənim gülüşümü öldürmüş bütün.
Yandırdı könlümü bu soyuqluğun,

Var ikən, sağ ikən yox olmuşam mən.
Gör necə güclüsən, sənin yoxluğun,
Mənim varlığımı aldı əlimdən...
Başımda tufan var, könlümdə çovğun,
Arzu da, fikir də qaldı yarıda.
Gör necə güclüsən, sənin yoxluğun
Mənə ögey etdi doğmaları da.

Fərəhim, sevincim dünəndə qaldı,
Dərdimdə, qəmimdə yaşarsan mənim.
Yoxluğun gör necə qələbə çaldı,
Bu günüm ölüdür, yaşar dünənim!
Çaldım öz könlümü ayrı simdə mən;
İlişib qalmışam dünənimdə mən.

*Sentyabr 1967*

## KƏPƏNƏK
***Xatirələr***

*Emin Sabitoğlu bəstələmişdir*

Kəpənəklər uçub gedər,
Əlimizdə
İşıldayan toza bənzər xatirələr.
Payız gələr...
Yollar üstə səpələnən xəzəllərdən
Gah itən, gah üzə çıxan
İzə bənzər xatirələr...

Fikrimizin aynasında
Gah alçalır,
Gah yüksəlir xatirələr...
Gah olur ki, acılıqdan
ürək dəlir xatirələr...
Gah həyatın özündən də
əziz gəlir xatirələr...

Dağ başından gün əyilər.
Bir müddətsə istiliyi
daş-divarda qalar ancaq.
Gənclik gedər,
xatiratı könlümüzü alar ancaq...

Unudulmuş bir kədərli nəğmədəki
Qırıq-qırıq sözə bənzər xatirələr.
Hərdən yanıb,
Hərdən sönən
közə bənzər xatirələr.
Cığırları dağa çatan
Düzə bənzər xatirələr.
Bir işıqsız gözə bənzər
xatirələr...

*Noyabr 1967*

## ÖZÜM-ÖZÜMÜ DANDIM...

O gün... o müdhiş gün...
sevərək səni,
Üstünə təhqirdən od ələdim mən.
Sənin on beş illik ümidlərini
Arzunu, hissini güllələdim mən.
İndi mən özümü dandım büsbütün,
Başqa cür baxıram indi aləmə.
Mənim söhbətimin, mənim sözümün
Dadı da, duzu da sənsənmiş, demə...

Söndü sinəmdəki o od, o ocaq,
Boş bir qovuq kimi havadayam mən.
İnsan nəfəsindən uzaq, çox uzaq,
Vulkanı soyuyan bir adayam mən.

Ağlım ürəyimə necə qıyıbdır,
Mən özüm-özümə bir yük olmuşam.
Sinəmdə ürəyim buz bağlayıbdır,
Budağı budanmış kötük olmuşam.

Nə çiçək oxşayır, nə ulduz məni
Fikirlər dağılmış, xəyallar enmiş.
Yerin də, göyün də gözəlliyini,
Sənin gözlərinlə mən görürəmmiş.

Gecələr düzülür sapa fikirlər,
Yorğanım daş olur, döşəyim tikan.
Səhərlər gözümü açıb dünyaya
Qalxmaq istəmirəm heç yatağımdan.

Yatmaq istəyirəm, yatmaq, bax elə
Gözümü zilləyib tavana baxım.
Mən hansı arzunun təlatümüylə
Əynimi geyinib qapıdan çıxım?

Qaçıram, qaçıram, səhərlər mənə
Bir deyən olmasın – "Sabahın xeyir".
Axı, sabahını itirən yazıq,
Sabahdan şər umur, xeyir istəmir.

Elə bil dayandı yolu ömrümün.
Buna can atırdım... bəs arzu nəydi?..
Həsrətlə, vüsalla dolu ömrümün,
Mənası itincə, özü itəydi...

İndi yolum düzdür... nə dağ, nə dərə...
Bu başdan baxanda, o baş görünür.
Kaş qismət olaydı istəyənlərə
Enişsiz, yoxuşsuz, dalğasız ömür...

Həyat çırpıntıymış... onun hər günü,
İllərin yükünü çəksə, nə dərdim...
Mən Qorqud olsaydım, sevgi sözünü
Yaşamaq sözünə cinas edərdim.

*Sentyabr 1968*

## MƏN URƏK OĞRUSU

Alıb keçmişini,
əvəzində mən
Əzablar bəxş etdim gələcəyinə.
Hissim xəcil qalıb öz əməlimdən
Sözüm də qurtarıb... Nə deyim sənə?

Küləklər oynaşır ürəkdə, canda,
Özümə düşməndir öz canım mənim.
Gözlərim ağlamır mən ağlayanda
Vicdanım ağlayır, vicdanım mənim.
Saz tutub içimdə qəm şikəstəsi,
Kədər bəstəsiyəm, vicdan xəstəsi.

Əllərim yapışıb öz ətəyimdən.
Mən heç nə ummuram gələcəyimdən.
Dağı da dağlayır dağın öz dağı
Üzümə durubdur öz dərdim-sərim.
Bu günüm sabaha danlaq, göz dağı,
Sabahım–dünənə təəssüflərim.
Yüz-yüz peşmançılıq çəkəmməz, dayan,
Bir zərər daşını, zərər yükünü.
Qaytara bilməmiş geri, heç zaman
Axı, min təəssüf, bir ötən günü.

Sözüm – bu günümün çığıran səsi,
Kədər bimarıyam, vicdan xəstəsi.
Alıb ürəyini,
əvəzində mən
Sənə əzab verdim ürək dolusu.
Mən kiməm? Utanır dilim sözümdən.
Mən – ürək oğrusu, ömür oğrusu!

Etiraf asandır! Mən hansı haqla
Qovmaq istəyirəm könlümdən səni?
Özüm öz eşqimi tapdalamaqla
Əlindən almışam gələcəyini...

Sənin sabahını kölgələndirən
Məğrur keçmişinin ləkəsiyəm mən...
Ney tutub içimdə qəm şikəstəsi,
Vicdan xəstəsiyəm, vicdan xəstəsi.

*Avqust, 1970*

## NAĞIL GECƏM

Ulduzların diliylə
Nəsə danışır gecə.
Min dəfə seyr etdiyim,
Adi, sadə bir gecə...
Birdən...
            qəlbim titrədi
Üşüdüm,
            köks ötürdüm.
Ürəyimdə bir səni,
Bir də...
          illər dalından
Nağıl gecəmi gördüm.
O gecə...
            gözlərimdə
Mürgüləyir həmişə
Ən şirin uyğum kimi.
O gecə...
              ürəyimin
Yatır dərinliyində
Altıncı duyğum kimi...
Gecə...
            bir sən,
                        bir də mən.
O gecə baş qaldırdı
Bu gecənin içindən...
Şirin duyğularımla,
Həsrət arzularımla
Bir anda doldu gecəm.

Uzaq bir xatirənin
Həzin zümzüməsindən
Nəğmələşdi bu gecəm.
O gecə çoxdan keçib,
Geri dönməz o, bir də.
Bir gecənin həzzini
Geri qaytara bilməz
Min belə gecələr də...
Bir gecədə, bir anda
Şirin bir xatirəylə
Acı gerçək görüşdü.
O gecənin gözündən
Bu gecənin bağrına
İsti bir damcı düşdü.
Dedim, dağıl a dünya,
Dağıl, tez dağıl, gecəm.
Sən dünyadan köçmüsən
Qəlbimə, nağıl gecəm.
Sən indi bu günümlə
Gedə bilməzsən yola;
Ürəyimdə yaşarsan
Təəssüflə qol-qola.
Dövran dönür, vaxt keçir
Səhərə də az qalır.
İndi gecələrim də
Mənimlə yalqız qalır.
Sən yoxsan... Bu günümə
Rişxənd edir dünənim.
Min bir gecə gəlsə də,
Nağılım gəlmir mənim.
Bu gecənin içində
Nağılsızam indi mən.
Gecənin əllərində
Sarı bir yarpaq durur
Xatirə dəftərimdən.

*Fevral, 1973*

## DARIXMA HA...

Məktubunu oxuyuram...
Dönə-dönə,
Qayıdıram hər cümlənə, hər sözünə.
Oxuyuram,
Düşünürəm.
Düşünəndə gözlərimi yumuram ki,
Səni görəm.
Oxuyuram, düşünürəm.
Fikrim ötən günlərimi
varaqlayır,
Oxuyanda gülümsəyən sətirlərin,
Düşünəndə qan ağlayır.
Bir məktubda nə deməkdir
Bu ağ, qara?
Rənglərə bax,
Hardan-hara?
Kim deyir ki,
Hər kəlmənin
Bir mənası bir yükü var?
Yox! Ürəkdə dilə gələn yaşıl sözlər,
Budaqlardır,
Yüz budağın bir kökü var.
Kök ürəkdir.
Yarpaqlarda rəngi yaşıl,
Səsi, sözü pıçıltılar.
Pıçıltının səsi birsə,
Min mətləbi, min sözü var.
Mən sözün öz mənasını istəmirəm.
Bir məzmuna o, qul olur,
O, duyğudan məhrum olur,
Yoxsul olur.
Mən vurğunam hər kəlmənin
Çalarına.
Nida kimi dik dayanıb
Hökm verən halına yox,

Sual kimi boyun büküb
Düşüncəyə dalarına.
Düşüncənin min rəngi var.
Göydəki ay, yalnız aydır,
Suya düşsə,
Qırçınlanan dalğalarda
Neçə rəngdən çələngi var.
Sənin əlvan duyğuların
Sözün məna sərhədindən
O taydadır.
Sözlər yatır quzu kimi,
Çalarları haraydadır.
Çalarların alovuna alışıram.
Günlər keçir...
Səsləndikcə qulağımda cümlələrin,
Ətrafıma lal kəsilib
Mən səninlə danışıram:
Yazırsan ki: – Darıxma, ha...
Burda sözün qəsdi geniş,
Yuvası dar.
Burda sözün cövhərindən
Neçə-neçə söz sıçrayar.
Sözdən fikir.
Fikirdən də
Neçə-neçə mətləb çıxır.
"Darıxma"nın o tayında
Söz darıxır,
Söz karıxır.
Sən "yox"dakı o "var"a bax.
Sözün əksi-çalara bax.
Sən "darıxma" deyən zaman,
İstəyirsən ömrüm boyu
Mən darıxım sənin üçün.
Rənginə bax, qəlibindən çıxan sözün!
Darıxıram, aya, günə sığışmıram.
Darıxıram,
Dünyamızın
Qaydasına ölçüsünə

Sığışmıram.
Darıxıram,
İstəyimə çatmaq üçün.
İstəyimiz fövqündədir sözümüzün.
Darıxıram,
Doğmalarım sağ-solumda.
Darıxıram,
Baxışların
Yanıb sönür xəyalımda.
Gözlərimin önündəki baxışlara
Yad olmuşam.
Xəyaldakı baxışların işığında
Udulmuşam.
Təqvimdəki varaqların
Bir ayını birdən cırın!
Yayı ötüm,
Göz yaşı tək kirpiyimdən,
Qopub düşüm payıza mən.

*İyul, 1975, Şəki*

## KİLİD

-Sən məni hamıya qısqandın, yetər.
Nədir bu şübhələr, bu üzüntülər?
Bir belə qısqanclıq nəyə gərəkdir?
Səni də, məni də məhv edəcəkdir.
Mən ki səninkiyəm
get,
Arxayın get.
Nə özünü incit,
Nə məni incit!
-Sevirəm,
Nə lüzüm sözə, öyüdə?
Mənim qısqanclığım sevgimin özü!
Vurulan kilidin böyüklüyü də –
Qorunan sərvətin dəyər ölçüsü!

*Dekabr, 1973*

## YAMAN DARIXMIŞAM

Yaman darıxmışam səninçin, yaman!
Mən əsir düşmüşəm öz istəyimə.
Nifrəti gizlətmək asandan asan,
Sevgini gizlətmək mahalmış, demə!

Haraylar yüksəlir könüldən yenə,
Bu necə haraydı, bu necə haydı?
Öhdəmdən gələrdim... Gözüm üzünə,
Qulağım səsinə darıxmasaydı...

Elə bil hər yerdən üzülüb əlim...
Mən azıb qalmışam qəm dərəsində.
Dirilib yaşanır sənli günlərim
Sənsiz günlərimin xatirəsində.

Yaman darıxmışam... Bu nədir yenə
Ağlım sağa baxır, ürəyim sola.
Ürəyim dönübdür göy göyərçinə
Qonub sən gedəli sən gələn yola.

Yaman darıxmışam... Hər axşamçağı
Arzumu günəşin telinə sardım.
Mənimlə olsaydı, mən darıxmağı
Zamana ən uzun ölçü sanardım.

Yuxuma gəlmişdin...
                    Qısıldıq küncə.
Danışdıq...
                    Yel əsdi...
                    Dağıldı dərd-qəm.
Kölgəyə dönmüşdüm,
                        Səni görüncə
Sənin işığında yox oldu kölgəm.

*1974*

## SƏN OLURAM MƏN

Yaxşı ki, ayrıyıq,
                    Yaxşı ki, bizdən
Çırpıntı, sarsıntı əl üzmür yenə.
Həyatı öyrəndik həsrətimizdən,
Odur ki, həmişə möhtacam sənə.

Rəngi bir,
            dadı bir
                    toyun, büsatın
Həsrət min rəng çəkir gözlərimizə.
Yaxşı ki, ayrıyıq,
                    bu dərd həyatın
Dərin qatlarını göstərir bizə.

Yanımda olanda uzaqdasan sən
Mən səni görmürəm olduğun kimi.
Səndən ayrıldımmı,
                    hər yerdə sənsən
Mən görə bilmirəm, vallah, heç kimi!

Yanında bir quru cismәm özüm də,
Ayrıldım,
            ruh olub əriyirəm mən.
Eşitmir qulağım,
Görmür gözüm də.
Arzudur eşidən, həsrətdir görən.
Adi bir insanam,
                    Sənin yanında
Başqa qayğılarla yaşayıram mən.
Elə ki, ayrıldım,
                    qəm dumanında
Fikrimin ilki də,
Sonu da sənsən!
Yanında rahatam, sakitəm tamam,
Ayrıldım, od tutub alışır ürək.

Rahatlıq – ölümdür,
Hələ mən sağam.
Mənə tufan gərək,
həyəcan gərək!

Vüsal dəmlərində sən nur, mən çıraq,
Görürəm, mən mənəm, sən də sənmisən?
Ayrılıq dəmləri sən, sənsən, ancaq
Bilmirəm, bəs niyə mən olmuram mən?

Səndən ayrılanda vahidəm, birəm,
Həm də bir hədəfə vuruluram mən.
Yanında, həmişə ikiləşirəm,
Ayrıldım, çevrilib sən oluram mən.

*Avqust, 1980*

## DƏRİNSƏN, ZİRVƏSƏN

Hikmət kitabıdır sənin surətin.
Onu sona qədər oxumaq çətin!
Sən uzun illərin dolaylarında
Mənimçün heç zaman adiləşmədin.
Sən "gəlmə" deyirsən, əgər "gəl" – desən,
Yüz giley gizlənir bir gileyində.
Həmişə, hər yerdə qeyri-adisən
Qəribə görünən adiliyində.

Baş vurdum könlünün dərinliyinə,
Qalxdım zirvəsinə sənin arzunun.
Əlimi, qolumu bağladın yenə.
Nə orda son gördüm,
Nə də burda son.

Ürəkdə nə qədər inci gizlənər
Onlar bir-birindən baha, dəyərli.
Sonuncu görüşdə tapdığım gövhər

Əvvəlki gövhərdən daha dəyərli.
Sənin ürəyində yatan incilər,
Mənim ürəyimə ulduzlar çilər.

Qəlbini taybatay açmamısan sən,
Qorxmusan, gözünə çox işıq düşə.
Gözlərim qamaşa...
            Hər görüşündən
Bir sirr saxlamısan gələn görüşə.

Aya çatmamışdan o gözəlliyə
Yetişmək eşqilə yandıq, düşündük.
Min il bu həsrətlə tor atdıq göyə,
Çatdıq,
ovcumuzda qum geri döndük.

Ayın əfsanəsi bitdi o gündən,
Dönüb ovcumuzda toz-torpaq oldu.
Sirrini insana bildirdiyindən
Ayın gözəlliyi itdi, yox oldu.

Sən mənim ovcuma qum tökməməkçün
Həmişə gizlətdin nəyisə məndən.
Ucaldın günbəgün,
Qalxdın günbəgün.
Daha gözəl oldun bu gün, dünəndən.

Hikmət kitabıdır sənin surətin.
Onu sona qədər oxumaq çətin!
Bu uzun illərin dolaylarında
Mənimçün bir dəfə adiləşmədin.

Dərinsən,
            zirvəsən mənim gözümdə,
Belə tanımışam səni mən, gülüm.
Qeyri-adiliyin boy alır, həm də
Mənim həsrətimdən, eşqimdən, gülüm.

*Avqust, 1980*

## İŞIQ SÜRƏTİ

Xəyalım yenə də öz səfərində,
Onun söykək yeri dərdim, məlalım.
Anın yüzdə biri, mində birində
Ərzin o başına uçur xəyalım.

Məsafə yox olur göz qırpımında,
Uçan xəyalımın kəramətindən…
Bir də baxıram ki, Onun yanında
Diz-dizə, üz-üzə oturmuşam mən.

Xəyal məsafəni yox edib keçir,
Bəs Ona hardandır işıq sürəti?
Bir anın içində əridib keçir
O, həm məsafəni, həm də həsrəti…

İşıqla doludur sevən könüllər,
Tutuşar, alışar o, axşam-səhər.
Sevgiyə mərhaba, sevgiyə alqış!
Çıraq da nurunu gur seldən alır.
Xəyal bu sürəti sevib alışmış
İşıqla süslənmiş könüldən alır.

*İyul, 1997*

Qəzəl, qoşma, gərayli

# QƏZƏL, QOŞMA, GƏRAYLI

* * *

Yenə bağlar o bağlardır, fəqət bağda gülüm yoxdur,
Gülüm yoxdur, bu dünyada ayım yoxdur, ilim yoxdur.

Zaman dönməz öz hökmündən... Biz ayrıldıq, tez ayrıldıq,
Dilim bar verməz, ay dostlar, deyəm ki, sevgilim yoxdur.

Çiçəklərdən, küləklərdən mən allam ətrini yarın,
Dilək ölməz, ürək ölməz, sevənlərcin ölüm yoxdur.

Gülüm əğyar qılıncıyla sevərkən ayrı düşdük biz,
Bu həsrətdən, bu möhnətdən daha müdhiş zülüm yoxdur.

Sevib yandım, külək qalxdı, külüm sovruldu əflakə,
Məni gərmə bu dünyada odum söndü, külüm yoxdur.

Ağac yansa, fəğan eylər, deyər öz dərdini aşkar,
Deməkçün dərdimi yarə, bəmim varsa, zilim yoxdur.

Səninlə Bəxtiyaram mən, ayım sənsən ilim sənsən,
Bu dünyada mənim sənsiz ayım yoxdur, ilim yoxdur.

*Oktyabr, 1961*

* * *

Bu qədər saldı məni həsrət, amandan-amana
Könlüm axırda mənim düşdü gümandan-gümana.

Neçə alim yazıb öz dərdini izhar elədi,
Aşiqin dərdi fəqət keçdi zamandan-zamana

Dərdü-qəmdən usanıb düşdü könül hicr oduna,
Eləyək indi şikayətmi yamandan-yamana?!

Səni gördükdə mən ancaq belə dil-dil ötürəm,
Boşalır göydə buludlar da dolandan-dolana...

Deməram görməmişəm mən səni çoxdandı, gülüm,
Görürəm surətini yalqız olandan-olana...

Könlümün üstə düşən kölgələr ələn silinir,
Başımın üstünə sən kölgə salandan-salana.

Neçə yol vədə verib əhdə vəfa qılmadı yar,
Bəxtiyar! Qəlbin axır düşdü talandan-talana.

*Sentyabr, 1963*

* * *

Ağlar ürəyim, səs gələr, ah-azar görünməz.
Gözdən yaş axar, qaynağı zinhar, görünməz.

Ruzgar yenə tüğyan eləyir dalda, budaqda
Toz-torpağı gördük, niyə ruzgar görünməz?

Tonqal yanır, atəş görünür, atəşi yaxmış,
Əl gizli səbəb, gizli səbəbkar görünməz.

İllər üzərindən yön alıb yol gedirik biz
İllər görünür, bəs niyə yollar görünməz.

Qəmdən şad olursansa, könül mülkünə sən bax,
Güllər açılıb, amma o gülzar görünməz.

Bəxtin mənə yar olduğunu çoxları söylər,
Bəxtim görünür, bəs niyə dildar görünməz?

*Avqust, 1970*

* * *

Daş ürəklərdə yanıb daşları sındırdı muğam.
Haqqa düşmən olanı haqqa tapındırdı muğam.

Nə güman eyləmisən ondakı tilsimləri sən,
"Kürü ahıyla qurutdu", "salı yandırdı" muğam.
Onun hər guşəsi bir xatirə, bir canlı kitab,
Keçilən yolları hərdən bizə andırdı muğam.

Su çilər kinli ürəklərdə qəzəb tonqalına,
Neçə qəsdin önünü kəsdi, dayandırdı muğam.

O – ürək yanğısı, göz yaşları, bir çəngə bulud,
Oyadıb yaddaşı, vicdanı utandırdı muğam.

Dəfn edin siz məni Zabul segahın mayəsinə,
Deyirəm, bəlkə, məni bir gün oyandırdı muğam.

Çox kitablar oxudum, zənn elədim bəxtiyaram,
Mənə çox mətləbi ahəstəcə qandırdı muğam.

*1974*

## BƏXTİYARAM MƏN
***Səninlə***

Ömrün payızında sevdim, sevildim,
Elə bilirəm ki, ilk baharam mən.
Arxanca sürünən kölgənəm sənin,
Harda qərar tutsan, orda varam mən.
Mey olsan, yanında bir qədəh ollam,
Gül olsan, çətrini öpən meh ollam.
Ot olsan, bir anda dönüb şeh ollam.
Dağ olsan, zirvənə yağan qaram mən.

Başımı qoyaram gündə yüz kərə
Bir yol ayağını basdığın yerə.
Eşqindir ucaldan məni göylərə,
Bu eşqin gücünə minnətdaram mən.

Sevgiyə hədd qoymaq, düzü günahdır,
Cahilin hər işi, sözü günahdır.
Eşqi günah saymaq özü günahdır,
Kim deyir, eşqimdə günahkaram mən?

Özün bir aləmsən, eşqin bir aləm,
Sən olan könüldə nə kədər, nə qəm!
Sənsiz bu dünyanın ən bədbəxtiyəm,
Səninlə dünyada bəxtiyaram mən.

*Dekabr, 1962*

## SƏN GETDİN

Sən getdin, elə bil dünya boşaldı
Yaz da köçüb getdi, yeri boş qaldı,
Bahar ürəyimi sənsiz qış aldı,
Mən yaza vurğunam, qışı neylərəm?

Eşqimi aparıb sən getdin demək,
Eşqsiz bir könül nəyimə gərək?
Soyuq daşa döndü o gündən ürək
Sinəmdən asılan daşı neylərəm?

Həmişə ayrıyıq, gecə-gündüzük,
Birimiz təpəyik, birimiz düzük.
Üstünün qaşıyla tanınar üzük,
Əgər üzük yoxsa, qaşı neylərəm?
Niyə yaşayıram, mən niyə sənsiz?
Nə yerə baxmaram, nə göyə sənsiz.
Mən ki, kor olmuşam hər şeyə sənsiz,
Kor gözün üstündə qaşı neylərəm?

*Mart 1967*

## SƏNİN DİLİNDƏN

İllərlə bir eşqin cövrünü çəkdik –
Ayrılsaq, gün sönər, il qınar bizi.
Eniş-yoxuşunu bir ötdüyümüz
Yollara nə deyək, yol qınar bizi.

Sən dedin, başlanan qurtarsın gərək!
Mən dedim, doymayır arzudan ürək!
Birgə əkdiyimiz gülü dərməsək
Tikanlar əl çalar, gül qınar bizi.

Bəs deyil bu ələm, bu kədər mənə.
Elədin dünyanı sən hədər mənə.
Gözəl sözlər dedin nə qədər mənə,
Gəl indi danlama, dil qınar bizi.

Çox çəkə bilmədik nazını eşqin,
Qış gəlib, yaşadıq yazını eşqin.
Yamanca sındırdıq sazını eşqin,
Bilmədik, axırda tel qınar bizi.

Dedin ki, eşqimlə bəxtiyaram mən.
Dedin ki, dönmərəm qəlbin səsindən.
İndiysə çəkinib el tənəsindən
Deyirsən, ayıbdır, el qınar bizi.

*İyul 1967*

## BAKIYLA TƏBRİZİN ARASINDAYAM

Mənim qismətimdir alatoranlıq
Gecəylə gündüzün arasındayam,
Qurulur içimdə mizan-tərəzi,
O gözlə, bu gözün arasındayam.

Yollar ayrıcında çox talanmışam,
Fikirlər əlində haçalanmışam.
Təpədən qorxmuşam, düzü danmışam,
İndi dağla düzün arasındayam.

İlişib qalmışam qəm çalasında,
Bir gözəl tilsimin daş qalasında,
Həmişə qapılar astanasında
Bayırla dəhlizin arasındayam.

Bəxtiyar, sinəndən neçə “mən” keçir
Biri dərdli keçir, biri şən keçir,
Məftilli çəpərlər sinəmdən keçir.
Bakıyla Təbrizin arasındayam.

*May 1969*

## QOCALMIR

Qocaldır insanı, qocaldır zaman;
Ürəyin atəşi, közü qocalmır.
Dağları, daşları qocaldan zaman,
Bilmirəm, bəs niyə özü qocalmır?

Getdi baharımız, yer qışa qaldı.
Düzlər qara qaldı, yağışa qaldı.
Bizimki bir quru baxışa qaldı,
Neyləyək arzunun gözü qocalmır.

Bəxtiyar, düşünək biz dərin-dərin.
Xəyallar möhtəşəm, arzular şirin.
Əsl sənətkarın, əsl şairin
Özü qocalsa da, sözü qocalmır.

*1965*

## DÜNYANIN

Baş çıxarmaq həm çətindir, həm asan
İblisindən, mələyindən dünyanın.
Adəm satdı bir buğdaya cənnəti,
Tora düşdü kələyindən dünyanın.

Nə gözəldir, ürək geniş, söz açıq,
Yaşamadım bir sevdamı yarımçıq.
Əzab adlı dəyirmandan narın çıx,
Keçəcəksən ələyindən dünyanın.

Arzum üçün bir mələyən cüyürdüm,
O təpədən bu təpəyə yüyürdüm.
Niyə qorxum kəfənindən?
Nə gördüm
Beşiyindən, bələyindən dünyanın?

Biz özümüz özümüzdən öc aldıq
Keçən günə gələn günü bac aldıq
Ömrümüzün yarısında qocaldıq
Şilləsindən, kötəyindən dünyanın.

Könül üzgün, xəyal küskün, dərbədər
Özün söylə zülm olarmı bu qədər?
Arxasınca palaz kimi sürüdər
Bərk yapışsam ətəyindən dünyanın.

Könül düşdü min arzumun izinə
Biləmmədik əyrisi nə, düzü nə?
İndi kəfən toxuyuruq özünə
Öz gülündən, çiçəyindən dünyanın.

*1977*

## VAY HALINA

Doğulduğun, böyüdüyün Vətənində
Haqq tapdanıb, şər udulsa, vay halına!
Səxavətin unudulsa, qəm eləmə,
Ləyaqətin unudulsa, vay halına!

İmzası var yasda toyun, toyda yasın,
Bu qütblər bir-birindən ayrılmasın.
Sənə şorun bahalığı dərd olmasın,
Yağın şorla bir tutulsa, vay halına!

Hər söhbətin hər məclisdə yeri deyil,
Unutma ki, qocalırsan sən ilbəil.
Yaşıdların sənə gülsə, zarafat bil,
Balan yaşlı cavan gülsə, vay halına!

Həyatından gileylənib çox ağlama,
Ötənləri yana-yana varaqlama.
Arzuların ölməsinə yas saxlama,
İnam ölsə, iman ölsə, vay halına!

Nöqsanını üzə deyən namərd deyil,
Kirayədə yaşadığın ev, yurd deyil.
Anan sənə ögey olsa, bir dərd deyil,
Zaman sənə ögey olsa, vay halına!

*Yanvar, 1989*

## YALAN HAKİM OLUB

Qorxu kölgəsinə sığınmış bu gün
Sədaqət, dəyanət, məhəbbət, allah.
Yalan hakim olub, böhtan gözətçi,
Çürüyür zindanda həqiqət, allah.
Əyri əyriliyi yeridir daşa,
Keçib əyriliklə hamıdan başa.
Doğru həsrət qalıb isti bir aşa.
Görən hara gedir bu millət, Allah.

Həftələr dəyişdi, günlər dəyişdi,
Tərəflər dəyişdi, yönlər dəyişdi.
Qiblələr dəyişdi, dinlər dəyişdi,
İtə ot verilir, ata ət, Allah.

Ünvanı dəyişib rəzalətin də,
Qaymaq da satılır şor qiymətində.
İndi sədaqətin səltənətində,
Əyləşib hökm edir xəyanət, Allah.

Ha çığır, ha bağır, yatan ayılmaz,
Yaxşını yamandan ayıran olmaz.
Satsan, üzünə də baxan tapılmaz,
Necə ucuzlaşıb ləyaqət, Allah.

Yalanlar həqiqət qiyafəsində,
Yeklər cövlan edir şeş xanəsində.
Oğrular, əyrilər zəmanəsində
Əyrilik sayılır fərasət, Allah.

*İyul, 1989.*

# HAQQI YOX

*Cavanşir Quliyev bəstələmişdir*

Yad əlində tapdanırkən şərəf, şan,
Türkün türklə ədavətə haqqı yox.
Hər işimiz başlanırkən sıfırdan
Türkün türklə ədavətə haqqı yox.

Dayaq olsun bu gün gərək sol sağa,
Bu vəhdətdən yurdumuza gün doğa.
Bütün millət dönməliykən yumruğa
Türkün türklə ədavətə haqqı yox.

Tarix bizi imtahana çəkirkən
İmdad umur hamımızdan bu Vətən.
Dünya da haqq səsimizə kar ikən
Türkün türklə ədavətə haqqı yox.

Sındırıldı dəyirmanda pərimiz,
Əsir oldu divə bizim Pərimiz.
Dağılırkən ocağımız, pirimiz
Türkün türklə ədavətə haqqı yox.

Nə çox imiş bu torpağa göz dikən,
Baxa-baxa gözümüzə mil çəkən.
Düşmənimiz dostumuzdan çox ikən
Türkün türklə ədavətə haqqı yox.

Sinəsini yarmalıyıq zülmətin,
Bu məqsədə getdiyimiz yol çətin.
Hər gün neçə şəhid verən millətin
Bir-birilə ədavətə haqqı yox.

*İyun, 1992, Şəki.*

## SÖZ OLUB

***"Düşdüyümüz oyuna bax"***

Kürsü qalır, oturanlar dəyişir,
Gələn deyir, gəlişimlə yaz olub.
Bircə ili başa vurub qışqırır:
"Dəyişdirdim, əyri dönüb düz olub".

Sən yalanın boyuna bax, ay Allah,
Divanına, toyuna bax, ay Allah.
Düşdüyümüz oyuna bax, ay Allah,
Otuz ilin fahişəsi qız olub.

İpək imiş açılmamış barama?
Hər çiçəkdən məlhəm olmaz yarama.
Hər dənizdən sən mirvari arama,
Yaxşı pisdən, qızıl misdən az olub.
Alqışlara, təriflərə uyma çox,
Nüfuzunu dağ başına qoyma çox,
"Mən, mən" deyə öz döşünə döymə çox
Hansı sərçə ləpirindən iz olub?

Gördüm vaxtın fitnəsini, felini,
Ey Bəxtiyar, saxla görək dilini.
Sındırıblar həqiqətin belini,
İndi dönüb ağızlarda söz olub.

*1988–1995*

## DİDƏRGİN

Başına haranın külünü töksün
Sinəsi əzabdan dağ-dağ didərgin.
Təzə Vətənində qərib, çəkingən
Köhnə Vətənindən qaçaq didərgin.

Başının üstündə öz tavanı yox,
Yavanlıq bir yana, heç yavanı yox.
Bu günə, sabaha bir gümanı yox,
Ay özü özündən uzaq didərgin.

Əsdi, hardan əsdi bu səmum yeli?
Əl başı kəsmədi, kəsdi baş əli.
İsti yuvasından perik düşəli
Gah orda, gah burda qonaq didərgin.

Hamının arzusu onunla birkən
Xeyirə dolanmır yenə bu örkən.
Özü bu dünyadan haqq istəyirkən
Adını qoydular nahaq didərgin.

Könlündə köz tutub Vətən həsrəti
Qurtarıb gileyi, sözü-söhbəti.
Öz acı taleyi, öz müsibəti
Özünün başına qınaq didərgin.

Soyuq baxışlardan xoş xəbər umar
Ağlamaz, göz yaşı ahından damar.
Ümidsiz sabaha o, ümid yamar
Ümidi ömrünə yamaq didərgin.

*İyul, 1993, Şəki*

## QORXURAM

İki yolun ayrıcında dayanıb,
Gah o yandan, gah bu yandan qorxuram.
Divdən deyil, milçək qədər gücüylə
Mən özünü div sayandan qorxuram.

Haqq evində haqq divanı qurulmuş,
Hər qazancın öz bahası sorulmuş.
Təmənnasız boynumuza yük olmuş
Bağışlanan şərəf-şandan qorxuram.

Bu dünyadan umacağım mizandır,
Qorxduğum kəs bu mizanı pozandır.
Tox gədanın qudurması yamandır
Acandan yox, mən doyandan qorxuram.

Uyuruqsa nəfs adlanan elçiyə,
Tüpürürük vicdan kəsən ölçüyə.
Odur verən düz qiyməti hər şeyə
Vicdanından qorxmayandan qorxuram.

*Dekabr, 1998*

## KÖRPÜ ÇAYDAN UZAQ DÜŞÜB

*Dostum H.Şirməmmədə*

Hələ toxum cücərməmiş,
Tarlamıza alaq düşüb.
Başımız da daz olalı,
Əlimizə daraq düşüb.

Xəyallarım – qanad-qanad,
Ətəyimdən dartdı həyat.
Dünənimə Dürat, Qırat,
Bu günümə ulaq düşüb.

Əlim üzüldü diləkdən,
Dilim yandı "gəl" deməkdən.
Öz haqqını gözləməkdən
Haqqın gözünə ağ düşüb.

Bu tayda sən, o tayda mən,
Üzəmmədim bu çayda mən.
Ömr əritdim harayda mən,
Körpü çaydan uzaq düşüb.

*Dekabr, 1992*

## İNSAN KİMİ SAXLA MƏNİ

Ulu tanrı, köməyim ol,
Arzuma adaxla məni.
Məni insan yaratmısan,
İnsan kimi saxla məni.

Göl olmuşam dama-dama,
Məlhəm qoyma sən yarama.
Bu sevdaya bu mərama
Daha betər bağla məni.

Fikirlərim qatar-qatar,
Biri atar, biri tutar.
Yaxınlara əlim çatar,
Qovuşdur uzaqla məni.

Dünənimi dana-dana
Göz dikirəm gündoğana.
Əgər gündə bir zindana
Çəkic vursam, ağla məni.

Ey ümidim, ey gümanım,
Sözüm haqsa, necə danım?
Qurban olsun haqqa canım,
Nahaq işdən saxla məni.

Soruşdular: Kimdir mənim
Yaxşıma da pis deyənim?
Həm dostum, həm də düşmənim
Göstərdi barmaqla məni.

*İyul, 1991, Şəki*

## BİLƏ BİLDİYİN QƏDƏR

*Əzizim Nurəddin üçün*

Çal dünyadan xoş günü
Çala bildiyin qədər.
Verəcəksən, unutma
Ala bildiyin qədər.

Quzu kimi mələrsən,
Min-min arzu dilərsən.
Sən boşala bilərsən
Dola bildiyin qədər.

İdrak yolu qorxulu
Gülündən çoxdur kolu.
Gedəcəksən bu yolu
Gələ bildiyin qədər.

Nəyə gərək gileylər
Bu çabalar, bu səylər
Bildiklərin bəs eylər
Elə bildiyin qədər.

Bu dünyanın min donu
Min rəngi, min oyunu.
Dərk edərsən sən onu
Bilə bildiyin qədər.

Sevinc dağına çıxsan
Sanma dərddən uzaqsan.
Bir gün ağlayacaqsan
Gülə bildiyin qədər.

*İyul, 1992.*

## AĞILA SƏRHƏD

*Ağıl həddindən artıq inkişaf*
*edərsə, xarakteri pozar*
***Ribot***

Dəyişmirsən fikrini
Lap bu dünya dağıla.
Öz hikkəndə qalmısan
Sən boğula-boğula.

Tərgit bu fironluğu,
Minlik bilmə onluğu.
Aldanmısan sonluğu
Toyla bitən nağıla.

Əhsən dedim, min əhsən
Ayrılmayıb kökündən,
Gələcəyi bu gündən
Görə bilən oğula.
Ömür hədər, gün hədər,
Kim özünə qəsd edər?
Əsl ağıl bir qədər
Sərhəd qoyar ağıla.

*Noyabr, 1998*

## AĞIL BAŞQA, ÜRƏK BAŞQA

Bir-birinə bənzəsə də,
Yel başqadır, külək başqa.
Ətri də xoş, rəngi də xoş
Gül başqadır, çiçək başqa.

Hər diki yoxuş bilmə, gəl,
Hər meyi meyxoş bilmə, gəl.
Hər uçanı quş bilmə, gəl
Quş başqadır, böcək başqa.

Hər dərdinə ortaq mənəm,
Hər ağrını tən bölənəm,
Sən çəkənsən, mən gələnəm
Gəmi başqa, yedək başqa.

Haqqın yolu-öz yolumdur,
Əyilməyən düz yolumdur,
Xeyirlə şər sağ – solumdur
Şeytan başqa, mələk başqa.

Bir diləyə mən calandım,
Gah qazandım, gah talandım.
Ömrüm boyu haçalandım
Ağıl başqa, ürək başqa.

Dilək oldu mənim adım,
Pərvazlandı qol-qanadım.
Çatmadı səbrim, inadım
Əməl başqa, dilək başqa.

*Noyabr, 1998*

## AĞLAYAN PƏRİ

Gözəl bir qız heykəli,
Çənəsində sağ əli,
Düşünür incə-incə;
Daş üstündə düşüncə?!
Onun sol yanağında
Göz yaşı giləlenmiş.
Elə bil şeh çilənmiş
Üstünü ağ çiçəyin.
Bu günahsız mələyin
Kədərini, qəmini,
Öz gizli aləmini
Soyuq daşa həkk edən
Sənətə heyranam mən.
Mərmər ağdır, qəm qara,
Ağ rəng hara, qəm hara?
Çöküb bir axşam kimi
Dalğın baxışlara qəm,
Ağ daşın sinəsindən
Baş qaldırıb qara qəm.
Daş üstündə duyğu, can?!
İnsan duyğularından
Gör bir nələr yaranmış,
Möcüzələr yaranmış!
Can vermiş insan əli
Xarabazar dünyanın
Torpağına, daşına;
Bu heykəldə qəlb odu
Soyuq daşı çevirmiş
İsticə göz yaşına.

Daşda ürək döyünür,
Baxıram dönə-dönə,
Barmağımı qoyuram
Göz yaşının üstünə.
Əlim yanır elə bil.
Yox, yox, bu heykəl deyil,
Ağlayan bir pəridir,
Qulağımda səslənən
Onun nalələridir.
Əyri-əyri o baxır
Usandığı cahana...
Sənət verən bir cana
Ölüm yoxdur, o sağdır!
Nə qədər ki, insanın
Arzuları gülməmiş
O qız ağlayacaqdır!..

*Fevral, 1961, Roma*

## MİKELANCELONUN "KƏDƏR"İ ÖNÜNDƏ

İsanın cəsədi uzanıb lal, kar,
Dizləri üstündə ana Məryəmin.
Saçır atəşini solğun baxışlar
Ana qəlbindəki o sonsuz qəmin.

Baladır ananın imanı, dini,
Ucalır bu dinlə göylərə torpaq,
Məryəm ağı deyir... onun səsini
Hər kəs öz qəlbində eşidir ancaq.

Baxıram heykələ... mən heyrətdəyəm...
Necə yerindədir hər xətt, hər qırış!
Dizləri üstündə Məryəmin bu dəm
Elə bil doğrudan ölü uzanmış.

Heykələ baxıram, fikri dumanlı,
Ömür vəfasızdır, əcəl amansız.
Məryəmə baxıram, kədəri canlı;
İsaya baxıram, cəsədi cansız.

Məryəm heykəldə də canlıdır, əlbət,
Axır damarından elə bil qan da.
Özgə bir can verib İsaya sənət
Ölü cəsədinin cansızlığında.

*Fevral, 1961, Roma*

## İSTANBUL

Bosfor körfəzi...
İki qitə
Söykənmiş bir-birinə
Ortasında bu yolun.
Bir tərəfi Avropadır,
Bir tərəfi Asiya
İstanbulun...
Türk oğlu durub ortada
Seyr edir
Sağını,
Solunu.
Bir şəhərdə birləşir
İki qitə.
Birinin başlanğıcıdır,
Birinin sonu...
...
Sol tərəfində
Dəbdəbəli keçmişindən yadigar qalan,-
Başı göylərə ucalan
Cameləri, bürcləri, qələləri;
Durur min ildən bəri.
Sağ tərəfində
Modern evlər, banklar, otellər...

Türk oğlu
Gözlərindən suallar yağa-yağa,
Gah sola baxır, gah sağa.
İstanbulun keçmişi vüqarlı, şanlı,
Bu günü özünə yad.
Gələcəyi dumanlı...

Bu gün
Bir ayağı Avropadadır.
Bir ayağı Asiyada
Türkün.
Qulaqlarında motor səsi,
Dilində quran surəsi
Türkün.
Zaman onu dilləndirir,
Əsrin ahənginə səs verir
Düşünüb dərindən;
Ancaq babası çəkir ətəklərindən.
Çırpınır şəhər
İkilik içində.
Düyüm-düyüm olmuş fikirlər
Əsrin keşməkeşində...

Bir şəhərdə görüşür
İki dünya, iki aləm.
Tapacaqdır, əminəm,
Türk oğlu haqq yolunu.
O, hələlik seyr edir
Sağını,
Solunu...
Ürəyi Şərq ürəyi,
Ağlı Qərb ağlıdır
Türkün.
Bu təzaddan
Sinəsi dağlıdır
Türkün
Durub hiss ilə ağıl arasında.
Həqiqətlə nağıl arasında.

İrəlimi getsin,
Geriyəmi dönsün?!
Keçmişindən qopa bilmir,
Bu gününü
Tapa bilmir.
Axtarır,
Axtarır,
Axtarır.
Qarşıda işıq var,
Axtaran tapar!...

*Fevral 1961, İstanbul*

## ATILMAYAN TOPLAR

Daş barılar, qalalar,
      Bürclər durur yan-yana.
Onlar keşik çəkirlər
      Sultanın sarayına.
Toplar da tuşlanıbdır
      Daş barıdan şəhərə.
Toplar bura gələli
      Atılıbmı bir kərə?

Yox! Niyə də atılsın?
      Sultanın bu dünyada
Nə dərdi, nə qəmi var.
Axı, niyə atılsın
      Axı, niyə, bu toplar?

Gəlmələr yerliləri
      Çapır da, talayır da...
Sultan hasar içində,
      Millət isə bayırda...
Toplar da mürgüləyir,
Elə bil yasa batmış,

Təkərləri əyilmiş,
Lülələri pas atmış...
Yadlar hücum çəkdilər,
Yadlar doldu şəhərə,
Paslı toplar dinmədi,
Atılmadı bir kərə.
Sultan öz aləmində,
Sultan öz kefindədir.
Axı, ona nə var ki,
Milləti nə gündədir.
Toplar atılmadı ki,
Sultan diksinə bilər
Güllələrin səsinə.
Niyə zəhər qatılsın
Kişinin nəşəsinə...
Yadların tapdağında
Vətən oldu tarımar.
Axı, niyə atılsın,
Axı, niyə, bu toplar?

Millət ölür acından
Lüt gəzir, üryan gəzir,
Əcnəbinin önündə
Sultan özü müntəzir...
Öz dilindən də gözəl
Bilir firəng dilini;
Axı, Parisdə alıb
Sultan öz təhsilini.
Arvadı firəng qızı,
Övladı da firəngdir,
Bilmir ərəb dilini,
Axı, niyə də bilsin,
Bu dil kimə gərəkdir?..
Sultanın firənglərə
Çox böyük hörməti var,
Axı, niyə atılsın,
Axı, niyə, bu toplar?..

* * *

Vətən əsir olubdur
      Gəlmələrin əlində...
      Ərəbin öz elində;
Məktəb firəng dilində,
      Qəzet firəng dilində.
Elmi-nücum yaradan
      Ərəb dili bəs hanı?
Qaldırın məzarından
Böyük Əbül Vəfanı.[1]
Qoyun o qoca loğman
      Tarixi varaqlasın.
Hanı Müərri şeiri?
      Bu günə qan ağlasın!
Sultan öz sarayında
      Qulaq asır nəğməyə,
Şərab içib məst olur
      "Dünya fanidir" – deyə
Onunçün bu dünyada
      Bir qadın, bir şərab var
Axı, niyə atılsın,
      Axı, niyə, bu toplar?

* * *

Topların üstündəki
      Nişana bax, nişana,
Əcnəbi özü satmış
      Bu topları Sultana.
Bu toplar məmləkəti
      Qorumaq üçün deyil,
      Yada satmaq üçünmüş.
Yurdu verib özgəyə
      Rahat yatmaq üçünmüş.
Bu toplar özgələrdən
      Qorumurmuş bu yeri.
Öz doğma millətindən

Qoruyur özgələri.
Sultan özü bəxtiyar,
Gözləri süzgün, xumar.
Axı, niyə atılsın
Axı, niyə, bu toplar?..

*Tetuan, fevral 1961*

## FƏRYAD

*İtaliyanın qədim Pompey şəhəri Vezuvi vulkanının püskürməsindən məhv olmuşdur.*

Vulkan püskürdü birdən,
Bircə anın içində
Əsər belə qalmadı
Min illik bir şəhərdən...
Şəhər göyə sovrulub
Yer ilə yeksan oldu,
Min ilin yaratdığı
Bir ana qurban oldu.
Deyirlər, göylər belə
Üzünə pərdə çəkmiş,
Görməməkçün bu halı.
Batdı insan arzusu,
Batdı insan xəyalı.
Bir şəhərin taleyi
Axdı bir ulduz kimi.
Yanaqlarda gülüşlər,
Dodaqlarda kəlmələr
Donub qaldı buz kimi.
Fəryad qopardı insan,
Lalələrin bağrına
Xal düşdü birdən-birə
Bu heybətli nidadan.
Diksindi göy də, yer də,
Təbiət yasa batdı.

Bu dəhqəiom bağırtı
Axşamçağı göylərin
Sinəsini qanatdı.
Keçdi illər, əsrlər
Hər şeyə qadir insan
Yer üzündə beləcə
Çıxdı min imtahandan.
Təbiətlə nə qədər
İnsan üz-üzə gəldi,
Döyüşdə gah əyildi,
Gah dikəlib düzəldi...
İnsan qələbə çaldı,
Min bir arzuya çatdı,
Təbiətin önündə
Qopardığı fəryadı
Daş üstündə yaratdı:
O, diz üstə yıxılmış
Kainatı çağırır
Fəryadıyla imdada,
Sol əli torpaq eşir,
Sağ əliysə havada...
Üzdəki dəhşətə bax,
Qorxuya, heybətə bax!
Dolandıqca bu nəhəng
Heykəlin dörd yanına,
Vahimədən adamın
Lərzə düşür canına...
Üzdəki dəhşətə bax!
Qorxuya, heybətə bax!
Daş üstündə yaranan
Bu insan fəryadına,
Baxdıqca nələr düşür
Hər baxanın yadına.
Təbiətdən güclüdür
İnsan əzəldən bəri,
Pompeyin birdən-birə
Batmasına baxma sən.
Təbiətin qəzəbi
Məhv etdi bir şəhəri,

Dünya dağıla bilər
İnsanın qəzəbindən.
İnsan öz qəzəbiylə
İnsanlığın kökünü
Kəsə bilər dünyadan,
Bir dəfə öz əlindən
Fəryad qoparar insan,
Yenə dodaqlarda söz
Üzlərdə gülüş donar,
Əməli öz başına
Cidar olan insana.
İnsanın sualı var:
Biz batan bir şəhərin
Acısını düşünüb,
Ah çəkirik bu gün də,
Əgər dünya batarsa,
Bu dərdə ah çəkməyə
Bir nəfər qalacaqmı
Dağılmış yer üzündə?..

*Fevral, 1961, Pompey xarabaları*

## LATIN DİLİ

Latın dili!
Hər sözündə dünya boyda yük daşıyır,
Latın dili! –
Millət ölüb, dil yaşayır.

“Ana” deyən, “torpaq” deyən, “Vətən” deyən
yox bu dildə.
Ancaq yenə yaşar bu dil.
Sabah bizim ərzimizin
Sərhəddindən o yana da
Qoşar bu dil.
Bəlkə... bütün ulduzları
Gəzər bu dil.
Döyüşlərdə zəfər çalıb

Ölən ərə bənzər bu dil.
Vətəni yox,
Milləti yox
Yaşar özü.
Elmlərin təməlidir
Əvvəl sözü, axır sözü.
Kim deyir ki, ölüdür bu?
Həkimlərin,
Alimlərin,
Loğmanların dilidir bu.
Bu dil ilə hesablanır ay da, il də.
Çiçəklərin,
Böcəklərin,
Küləklərin,
Fələklərin
Adlarını yazır alim
Ölü dildə.
Kim deyir ki, ölüdür bu?
Ölülərin dili deyil,
Dirilərin dilidir bu.
Atlantika sahilində
Coşa-coşa,
Daşa-daşa:
– Mən azadam, mən xoşbəxtəm, –
Deyir natiq yad dilində.

Söylə natiq,
İndi nəyə inanaq biz –
Qulağamı,
Ya gözəmi?
Əmələmi,
Ya sözəmi?
“Mən azadam, müstəqiləm” sözlərini
Öz dilində deməyə də
İxtiyarın yoxsa əgər,
De, kim sənə azad deyər?..
Söylə, necə azadsan ki,
Komalarda dustaq olub
ana dilin.

Böyük-böyük məclislərdən
İtirilib ilim-ilim?..
İclaslarda bir kəlməsi, sözü yoxdur.
Bəlkə... onun böyük, rəsmi məclislərə
Çıxmaq üçün üzü yoxdur?
Söylə, bəlkə – bic doğulub,
Atasından yox xəbəri?
Bəlkə bu dil çox kasıbdır,
Qucağına sığışmayır
Əsrin böyük fikirləri?..

Sən dərdə bax,
Vətən də var,
            Millət də var.
            Ancaq onun dili yoxdur.
Elə bil ki,
Güzgü kimi, hamar, şəffaf röyalın var,
            dili yoxdur...
İndi söylə,
Hansı dilə ölü deyək:
Vətən varkən,
Millət varkən,
Kiçik, yoxsul komalarda
            dustaq olan bir diləmi?
Yoxsa, uzun əsrlərdən
            keçib gələn,
Xalqı ölən,
Özü qalan bir diləmi?

*Aprel 1967, Kasablanka*

## HAYD PARK

*Londonda "Hayd park" deyilən bir bağda hər kəs istədiyini danışmaq, hətta hökuməti ittiham etmək hüququna malikdir.*

Hayd park!
Bu bağda azaddır insan.
Azaddır məramı, fikri hər kəsin.

Ey qəlbi yaralı, fikri pərişan,
Qəlbindən keçəni qorxma, de gəlsin.
Danış bildiyini...
                                        Qoruq-qadaq yox
Burda nə düz sözə, nə yalan sözə.
Burda fikir azad, burda söz açıq,
Yalan doğru kimi dürtülmür gözə.
Bu parkdan kənarda, bağdan uzaqda
Dolaşır ölkəni müdhiş yalanlar.
Ancaq həqiqəti yalnız bu bağda
Deməyə iznin var, ixtiyarın var.

Niyə həqiqətin qaradır üzü?
Ali məclislərdən niyə qovulmuş?
Sözdə hakimsə də
                                        həqiqət özü
Yalan qarşısında müttəhim olmuş.

Boğurlar, düşünüb anlayanları,
Xalq yenə əsrlik qeylü-qalında.
Gerçəyin yerinə ağ yalanları
Gördük həqiqətin pyedestalında.

"Azadlıq məndədir" – söyləyən ölkə,
Ölkələr dağıdıb qana batmısan.
İnsan hüququndan dərs deyən ölkə,
Haqqı bağ güncünə niyə atmısan?
İzdiham önündə danışır biri,
Həqiqət çağlayır məğrur səsində.
Vurur ürəyinin döyüntüləri
Onun hər sözündə, hər kəlməsində.

Qəlblərə nur kimi çilənir səsi,
Sözləri zülmətdə çıraq yandırır.
İnsan arzusunun dilə gəlməsi
Burda daşları da işıqlandırır.
Parkın hər tərəfi yamyaşıl çəmən,
Qışın oğlan çağı – burda ilk bahar.

Haqqın, həqiqətin gül nəfəsindən
Elə bil boy atır burda ağaclar.

Parkdan kənardasa əyri oldu düz,
Sözdən paltar biçdi yalan gerçəyə.
Gülləmi, bombamı, atəşmi haqq söz,
De, niyə qorxurlar düz sözdən, niyə?

Ədalət susanda, haqq boğulanda
Yalan zəfər çalır,
Gerçək mat qalır.
Qanun düşüncəyə qalıb olanda
Haqq söz barıt olur, qalıb yırtılır.

Qalıbı qoruyub saxlamaq üçün
Sözü "Hayd park"da dustaq etdilər.
Bu gün deyilsə də, sabah, başqa gün
Yalan həqiqətdən bir imdad dilər.

Parkın dövrəsində dəmir çəpər var,
Haqq sözün önünü kəsir hasarlar.
Kaş bu park böyüyə, hasar dağıla,
Dünya başdan-başa "Hayd park" ola!

*Oktyabr, 1978, London*

## KAMAN NALƏ ÇƏKİR...

Uzaq Britaniyada kaman nəğməsi...
Habil lal telləri dilə gətirmiş.
Bir xalqın köksündən gələn ah səsi,
Başqa bir xalqı da inildədirmiş.

Başqadır bu xalqın məsləki, dini,
Fəqət, bu nəğməyə başlar əyilmiş.
Soyuq qanunların daş sərhədini
Sənətdən savayı kim aşa bilmiş?

Kamanın səsində hıçqırıq, ələm,
Duyan ürəklərə od ələnibdir.
Xəzər ləpələri elə bil bu dəm
Temza sahilində ləpələnibdir.
Kaman nə danışır, kaman nə deyir,
Belə için-için neçin inləyir?
Hicran öz hökmünü verəndən bəri
Kaman nalə çəkir vüsal eşqinə.
Bölünən bir xadqın könül telləri
Kamanın bağrında ağlayır yenə.

Kaman susan kimi
                    Qalxıb salondan
Əlində gül-çiçək bir cavan oğlan
Atıldı səhnəyə...
                    O gülə-gülə
Çiçək topasını verdi Habilə.
Alqışlar altında endi səhnədən
Yenidən kamança dindi səhnədən.
Mer ziyafət verir şərəfimizə,
Bu gecə ayrıca hörmət var bizə.
Bir kağız çıxardı Habil cibindən:
-Mənə bağışlanan gülün içindən
Tapdım bu kağızı, görün, nə yazır.
Oxuduq... Sözlərdən od-alov yağır.
Oxuduq kağızı biz dönə-dönə.
Oxuduq bir xalqın faciəsini
Eşitdik, kamanın iniltisinə
Səs verən qardaşın fəryad səsini.
Mənim dilimdədi bu məktub...
-Necə?
-Mənim qardaşımmış o cavan oğlan.
Temza sahilinə təhsil dalınca
Gəlib xan Arazın sağ cinahından.

Bilmirəm nə deyim kor taleyə mən?
İkiyə bölündü bir ana torpaq.

Balaca bir çayı keçə bilməyən
Qardaşlar görüşür qürbətdə ancaq.
Dalıb qəlbimizin hönkürtüsünə
Oxuduq məktubu biz dönə-dönə:
        "Ulduzları saya-saya
        Ayaq basır insan aya.
        Mənim bu taydan o taya
        Əlim çatmır sənə, qardaş".

Dərddən şair olub o cavan oğlan,
Zamanın qəribə oyunu varmış.
Yerdə beş addımı keçməyən insan
Göydə lap aya da ayaq basarmış!

Ana təbiətin düzüb-qurduğu
Qaydanı, hüdudu dağıdar insan.
Ancaq aşa bilmir, keçə bilmir o,
Özü yaratdığı həddən, hüdüddan.

Hicran öz hökmünü verəndən bəri
Kaman nalə çəkir bir vüsal üçün.
Bölünən bir xalqın könül telləri
Kamanın səsində birləşir bu gün.

*Oktyabr, 1978, Qlazqo*

# Nəğmələr

## YAĞMA, YAĞIŞ

*Hacıbaba Həsənov bəstələmişdir*

Göylər çənə büründükcə
Ürəyimi bürüyür qəm.
Yağma, yağış, yağma, yağış,
Mən görüşə tələsirəm.

Mənim şirin sevincimə
Acı zəhər sən qatma gəl.
Göy çəməndə yol gözləyən
Sevgilimi islatma gəl.

Pəncərəmə hicran yazır
Damcıların naxış-naxış.
Mən görüşə tələsirəm
Yağma, yağış, yağma, yağış,

Ürəyini boşaltmasın
Bu gün göylər insan kimi,
Mən ki, açmaq istəyirəm
Sevgilimə ürəyimi.

Yağsan da mən gedəcəyəm.
Görüşəndə yağışda biz.
Üstümüzdə açılacaq
Çətir kimi öz eşqimiz.

*1953*

## BU GECƏ

***Romans***

Həsrət, hicran yolunu,
Gülüm, birlikdə keçdik.
Sona çatdı intizar,
Biz yenə də görüşdük.
Könlümüzün səsinə
Həmdəm olduq bu gecə.
Elə bil ki, təzədən
Biz doğulduq bu gecə.

Susdu çəmən, susdu çöl,
Başını əydi güllər;
Təbiət lal kəsilər
Danışanda könüllər.

Bülbül də nəğməsini
Sanki deyir bizimçün.
Güllər açar qışda da
Həsrətlər qovuşan gün.

Mənə elə gəlir ki,
Günəş də doğdu gecə.
Heç kəs yaşamır, gülüm,
Bizdən özgə bu gecə.

*Fevral, 1960*

## GECƏLƏR, AY GECƏLƏR

*Müsiqisi Şahid Əbdülkərimovundur*

Tellərini dolayır boynuma ay, gecələr,
Mənim sirdaşımsınız, gecələr, ay gecələr!
Ürəyimdə səhərin ulu həsrəti varmış...
İntizar arlarında gecə uzun olarmış...

Quştək uçur xəyalım hardan hara gecələr.
Mən həsəd aparıram yatanlara gecələr!
Baxıram pəncərədən boylanan ulduzlara
Dərdimin əllərilə yuxum çəkilir dara.

## BİRİ SƏNSƏN, BİRİ MƏN

*Əhsən Dadaşov bəstələmişdir*

Bir bulağın iki gözü, –
Biri sənsən, biri mən.
Bir almanın iki üzü, –
Biri sənsən, biri mən.

Qoşa simin titrəməsi, –
Biri sənsən, biri mən.
Bir pərdənin iki səsi, –
Biri sənsən, biri mən.

Açıq səma, göy qurşağı, –
Biri sənsən, biri mən.
Dan ulduzu, səhər çağı, –
Biri sənsən, biri mən.

Bu həyat da iki rəngdir, –
Bir sevinc, biri qəm.
Sevinc kimdir, kədər kimdir?
O həm sənsən, həm də mən.
Bu dünyaya biz gələli
Həm qəmik, həm də sevinc.
Sənməndəsən, mən səndəyəm,
Gözəldir qəmdə sevinc.

*İyul, 1962*

## DODAQDA GƏZ

Könül, dolan el-obanı,
O dağda gəz, bu dağda gəz.
Leylək olub yer eşincə,
Sən bülbül ol, budaqda gəz.

Hər atəşə, oda yanma,
Sözün haqsa, onu danma.
Manat olub xırdalanma,
Yaqut kimi barmaqda gəz.

Əskik olma xeyir-şərdə,
Gün tək görün sən hər yerdə,
Duyğu kimi ürəklərdə,
Nəğmə kimi dodaqda gəz.

*Sentyabr, 1963*

## KÖLGƏM QƏDƏR YAXINSAN...

*Niyaməddin Musayev bəstələmişdir*

Ayrılığın eylədi,
Könlümü dağ-dağ, gülüm.
Qış kimi düşüncəli,
Yaz kimi oynaq gülüm.

Kölgəm qədər yaxınsan,
Ancaq tuta bilmirəm.
"Unut" demək asandır,
Mən unuda bilmirəm.

Soyuqluğun könlümə
Saldı qara xal, gülüm,
Dəniz kimi dalğalı,
Heykəl kimi lal gülüm.
Bəs nəyədir gümanın,
Ay gümanlı gümansız?
Könül kimi vəfalı,
Ağıl kimi amansız.
Gecə kimi fikirli,
Gündüz kimi şən, gülüm
İki hissin əlində
Gəl, oynama sən, gülüm.

*Aprel, 1965*

## QƏLBİ DOLU GECƏLƏR

*Şəmsi Kərimov bəstələmişdir.*

Göydə yanır aypara
İşıq düşür yollara.
Bənzəyir nağıllara
Bizim ulu gecələr,
Qəlbi dolu gecələr.
Səsləyib haylar məni,
Ulduzlu göylər məni,
Yuxudan eylər məni
Bu yuxulu gecələr,
Gül qoxulu gecələr.

Gah sönür, gah alışır,
Öz rənginə qarışır,
Bizə nağıl danışır
Min duyğulu gecələr,
Qəlbi dolu gecələr.

Dan ulduzu – pəncərə,
İşıq saçır hər yerə.
Kəsə bilmir səhərə
Gedən yolu gecələr,
Əsrar dolu gecələr.

*1965*

## KƏPƏNƏK

*Emin Sabitoğlu bəstələmişdir*

Güllər üstə uçan, qaçan
Bir qayğısız kəpənəkdin,
Çiçəklərin ürəyində
Sən ən şirin bir diləkdin.
Sorağını gül-çiçəkdən
alınca mən, gördüm yoxsan,
Qaçdım sənin dalınca mən,

gördüm yoxsan.

Nəğmə deyir sənə güllər
Yel əsdikcə narın-narın.
Hər çiçəkdən bir rəng alır
Qızıl-qızıl qanadların.

Hansı gülü oxşadınsa,
Ləçəyində izin qaldı.
Səni tutdum, uçub getdin,
Əllərimdə tozun qaldı.

*1974*

## DURNA QATARI

*Emin Sabitoğlu bəstələmişdir*

Əsir payız küləyi,
Gecə uzun, gün gödək.
Ağacdan yarpaq düşür,
Bir ömrün gülləri tək.

Susur çaylar, çeşmələr,
Susur çəmən, dağ, dərə.
Köçür durna qatarı
Uzaq-uzaq ellərə.

Bizim çöllər ayrılır
Bu vəfasız gözəldən.
Qışda üşüməməkçin
Yer don geyir xəzəldən.

Köçür durna qatarı,
Ürəyimiz kövrəlir.
Külək əsir, dağlardan
Payızın ətri gəlir.
Yarpaqlara, otlara

Sarı-sarı zər düşür.
Yaşımıza yaş gəlir,
Ömürdən günlər düşür.
Köçür durna qatarı,
O, baharda dönəcək.
Ötən günlər dönəydi
Durna qatarları tək.

*1975*

## MƏN YANDIM, SƏN İSİNDİN

*Emin Sabitoğlu bəstələmişdir*

Ürəyimdən keçəndən
Düşmədinmi duyuq sən?
Səndən cavab gözlədim,
Nə “hə” dedin, nə “yox” sən.

Dedim: – Susma, danış, din,
Nə danışdın, nə dindin.
Məhəbbətin oduna
Mən yandım, sən isindin.

Dillənsənə, sevgilim,
Mən nə daşam, nə dəmir.
Min il də gözləyərdim,
Axı, ömür gözləmir.

Sükutunla durmusan
Ürəyimin qəsdinə.
Söylə, susan sevgilim,
Bu sükutun qəsdi nə?

*1977*

## QIZIM

*Şəfiqə Axundova bəstələmişdir*

Məhəbbətlə gülşən olub
Göy də, qızım, Yer də, qızım.
Sevir, sevir bir-birini
Güllər, çiçəklər də, qızım.
Bu dünyanı yaxşı tanı
Sevgisiz bir ürək hanı?
Sev torpağı, sev insanı
Yaşa ürəklərdə, qızım.
Gör Xəzərə Kür nə deyir.
Buludlara Yer nə deyir?
Nəğməsində gör nə deyir
Əsən küləklər də, qızım.

İllər yaşat bircə gündə,
Hər gecəndə, gündüzündə.
Başın olsun göy üzündə
Ayaqların yerdə, qızım.

*1973*

## ANA YURDUM

Anaların laylasından,
Babaların tarlasından,
El toyundan, el yasından
Səni içdim udum-udum,
Ana yurdum, ana yurdum.

Bağ gülündə, dağ qarında,
Sel-suların axarında,
Palıdların vüqarında
Səni gördüm, ana yurdum,

Ana yurdum, ana yurdum.
Yay mehində, yaz şehində,
Quşlarının cəhcəhində,
El qəmində, fərəhində
Səni duydum, ana yurdum,
Ana yurdum, ana yurdum.

Füzulinin "ah" səsində,
Üzeyirin nəğməsində,
Ələsgərin ləhcəsində
Səni andım, ana yurdum,
Mənim andım, ana yurdum.

*1992*

## QİSAS BÖYÜTSÜN SƏNİ

*Vasif Adıgözəlov bəstələmişdir*

Əsən çovğun bu gecə
Qar üstünə qar qalar.
Düzəngahda qurulmuş
Çadırımı yırğalar.
Görən, bizə nə deyir
Qarıldaşan qarğalar
Layla balam, a layla.

Qulağımız hamıdan
Bir xoş xəbər soraqlar.
Sızıldayan külək də
Dərdimizə qan ağlar
Layla balam, a layla.
Rəva bildi tanrımı
Bizə bu işgəncəni?
Mən böyüdə bilmədim,
Qisas böyütsün səni
Layla balam, a layla.

Göy bizə qənim olsun
Bu zülmü yerdə qoysaq.
Qoy bizə qənim olsun
Qaçdığımız o torpaq!
Layla balam, a layla.

*Yanvar, 1994*

## AZƏRBAYCAN – TÜRKİYƏ

*Cavanşir Quliyev bəstələmişdir*

Bir millətik, iki dövlət
Eyni arzu, eyni niyyət
Hər ikisi Cümhuriyyət
Azərbaycan–Türkiyə.

Bir ananın iki oğlu
Bir ağacın iki qolu
O da ulu, bu da ulu
Azərbaycan–Türkiyə.

Ana yurdda yuva qurdum
Ata yurda könül verdim
Ana yurdum, ata yurdum
Azərbaycan–Türkiyə.

Birdir bizim hər halımız
Diləyimiz, amalımız
Bayraqlarda hilalımız
Azərbaycan–Türkiyə.

Dinimiz bir, dilimiz bir
Ayımız bir, ilimiz bir
Eşqimiz bir, yolumuz bir
Azərbaycan–Türkiyə.

*1991*

## HARA GEDİR BU DÜNYA?

Başa keçdi gerçəyi
Əlimizdən çalanlar.
Bu dünyanın rəngini
Dəyişdirdi yalanlar
Hara gedir bu dünya?

Bu gözəl dünyamızdan
Gözəllik qovuldu, hey.
Könüllərin açarı –
Dillər qıfıl oldu, hey.
Hara gedir bu dünya?

Hər şey döndü tərsinə
Xeyir şərə qul oldu.
Haqqın çiyninə minmək
Yüksəlişə yol oldu
Hara gedir bu dünya?

Yalan evin içində
Gerçək qapı dalında.
Doğru çörəyə möhtac
Əyri cah-cəlalında
Hara gedir bu dünya?

Yolumuz duman olmuş,
Yaxşılar yaman olmuş.
Haqq bu gün öz haqqını
Haqsızdan uman olmuş
Hara gedir bu dünya?

*1996*

## ÖMÜR QATARI

### ***"Sonuncu döngə"***

*Eldar Mansurov bəstələmişdir*

Bu yollardan qatar ötdü,
Qulağımda səsi qaldı.
Tükənsə də canda taqət,
Yaşamaq həvəsi qaldı.

Dayazda gördüm dərini,
Xeyirdə gördüm şərini.
Ömrün yaxşı günlərini
Yola saldım, pisi qaldı.

Ömür ki, var bircə qarış,
İlki savaş sonu barış.
Qatar ötdü qırış-qırış
Üz-gözümdə hissi qaldı.

Unudulub çoxdan bəri,
Dünyanın toy-düyünləri.
Ötüb keçdi şən günləri,
Dərdi, qəm-qüssəsi qaldı.

Qatar gedir özbaşına,
Yetdim ixtiyar yaşına.
Çatıram mənzil başına,
Sonuncu döngəsi qaldı.

*İyun, 1996*

**MÜNDƏRİCAT**



## Əlvan çiçəklər

## İnsan və zaman

**Sandıqdan səslər**



**Həsrət nəğmələri**

## Qəzəl, qoşma, gəraylı

## Səyahət dəftərindən



## Nəğmələr

